imzalanmasında məqsəd əməkdaşlıq, qarşılıqlı fəaliyyət və birgə layihələr vasitəsilə probasiya nəzarətində olan şəxslərin sosial-psixoloji xidmət sahəsində dəstəklənməsi və reabilitasiyasının həyata keçirilməsidir" (Azərbaycan Respublikası Ədliyyə Nazirliyi, 2024). Göründüyü kimi artıq cəmiyyətin hər bir üzvünün insan ləyaqətinə yaraşan şəkildə yaşaması və onların törətdikləri cinayəti, doğru olmayan hərəkət və davranışlarının aradan qaldırılmasını və ya yanlışlıqlarının zərərsizləşdirilməsini təkcə cəza ilə deyil, müasir dövrün yeni yanaşmaları və metodların tətbiqi ilə həyata keçirilməsini nəzərdə tutur. Belə olduğu halda insan davranışının tibbi müalicəsində uzun illər tətbiq olunan Z. Freydin nəzəriyyəsindən fərqli yeni bir sosial yanaşmanı ortaya qoymaqla sosial iş və xidmətin inkişafının əhəmiyyətli dərəcədə zəruri olduğu ortaya çıxır. Əvvəllər sosial xidmət sahəsində problemlərin diaqnozu və müalicəsi ilə məşğul olan və psixoanalitik yanaşma adlandırılan bir tibbi model qəbul edilmişdir. "1917-ci ildə Meri Riçmondun nəşr olunan "Sosial Diaqnoz" adlı kitabı sosial işin ilk metod kitabı hesab olunur. Meri Riçmond (1861-1928) bu kitabında *yeni sosial diaqnoz* qoyluşunda "müraciətçinin vəziyyəti və şəxsiyyəti ilə bağlı ola bilən" ən dəqiq tərifi verməklə bu xidməti konseptuallaşdırdı. O, tibbi yanaşmadan fərqli olaraq insanların yaşadıqları şəraitə və mühitə uyğunlaşa bilməmələrinin səbəbini fərdi və daxili çatışmazlıqların olmasında görüb" (Zastrow, 2015). Bu isə müasir dövrdə çətin həyat tərzinə malik olan fərdlərin sosial problemlərinin həlli üçün yeni yanaşmanın ortaya qoyulması demək idi.

**Tədqiqat**

*İnsan həyatında fəzilətin rolu*. İnkişaf etmiş cəmiyyətlərdə 1960-cı illərdə, sosial işçilər tibbi yanaşmanın faydalılığını şübhə altına almağa başladılar və onlar bildirdilər ki, asosial davranışlı şəxslərin problemlərində ətraf mühit faktorları ən azı daxili amillər qədər təsirə malikdir. Bu paradiqma dəyişikliyindən sonra sosial işdə islahat yanaşması üstünlük təşkil etməklə gündəmə gətirildi və səlahiyyətləndirməyə başlanıldı. Sosial işin əsas məqsədlərindən bir də insanların davranışlarını sosial nəzəriyyələrdən və sosial sistemlərdən istifadə etməklə, onların öz mühiti ilə münasibətlərinə müdaxilə etməklə, müraciətçinin güclü xüsusiyyətlərini önə çəkib onların inkişaf etdirilməsinə səy göstərməkdir. Bu da zəif və köməyə ehtiyacı olan müraciətçidə mövcud olan potensialın gücləndirilməsi və inam hissini inkişaf etdirməyə yön verərək əsas məqsədi həyata keçirmək və müraciətçinin öz həyatına nəzarəti ələ almasını təmin etmək deməkdir. Hər bir cəmiyyətin milli-mənəvi dəyərlər sistemi vardır və bu sistemə daxil olan sosial dəyər və normalar insanların genetik daşıyıcılığını, fəzilətini və adət-ənənəsini özündə əks etdirir. Fəzilətlər (mənəvi-əxlaqi keyfiyyətlər) potensial olaraq insanlarda mövcuddur, lakin təlim və təcrübə vasitəsilə inkişaf etdirilməli olan bir xüsusiyyətdir ki, sosial işçilər müəyyən müraciətçi qrupları ilə xüsusilə probasiya xidmətindən istifadə edənlərlə işləyərkən bunu nəzərə almalıdırlar. Sosial mühitdən, insani və mənəviyyatdan qaynaqlanan səbəblərə görə uzun müddət risklərə məruz qalma, dəyərlərin aşınmasına səbəb olur bu da insan ləyaqətinə xələl gətirir. Risklərlə əhatə olunmuş həyat yaşamaq bir müddət sonra ümidsizliyə səbəb olur və aciz olma vəziyyətini ortaya qoyur. Xüsusilə, cinayətə cəlb olunan və ya sistemli şəkildə zorakılığa məruz qalan şəxslər həm özlərinə, həm də başqalarına inamını itirərək cəmiyyətdən uzaqlaşırlar. Probasiya xidməti sahəsində bu cür vəziyyətdə olan müraciətçilərin problemini aradan qaldırmaq və o insanları yenidən ailəyə və cəmiyyətə qaytarmaq üçün sosial işçilərin fərdlərlə planlı bir dəyişiklik prosesi başlamaqla mümkün ola bilər. Bu planlı dəyişiklik prosesinin *əsas süjet xətti isə fərdin insani fəzilətlərinin üzə çıxarılması və inkişaf etdirilməsi* məqsədləri ilə başlaya bilər.

İnsani fəzilətlərin sosial xidmətdə, xüsusilə probasiya xidməti sahəsində rolunun olduqca əhəmiyyətli olduğu və nəzərə alınması zəruri şərtdir. "Tarix boyu bir çox mütəfəkkirlər fəzilətin insanın fərdi və ictimai həyatı üçün dəyərini qeyd etmişlər. İnsanın mənəvi-əxlaqi bağlılıq üzərindən həyatı qurulduqda fərdin daxili rahatlığı və ictimai harmoniyasının artdığı vurğulanıb. Şərq dünyasında ilk dəfə fəzilətin sistemli şəkildə Konfutsi tərəfindən verildiyi deyilir. Qərb dünyasında fəzilətlər haqqında ilk bəhs edən isə Platonun olduğu (e.ə. 427-347) qəbul edilir. Platon "Dövlət" kitabında ideal şəhərin xüsusiyyətlərindən bəhs edir və bildirdi ki, cəsarət, mötədillik və ədalət inzibati sistemdə vacib olan əsas elementlərdir" (Ayten, 2014). Deməli, fəzilət insan üçün ən yaxşı olanların dərk edilməsidir.

İslam fəlsəfi tarixində Farabi, İbn Sina və İbn Miskəveyh kimi məşhur filosoflar, əl-İsfahani və Qəzali kimi sufi mütəfəkkirləri fəzilətli və fəzilətsiz mövzusunda çox sayda fikirlər söyləmişlər və fəzilətə çatma prosesi ilə maraqlanmışlar. Onlar fəzilətə çatmanı hikmət, iffət, cəsarət və ədalət kimi məziyyətlər ilə əlaqələndirmişlər. İslam mütəfəkkirləri vurğulayırdılar ki, insanda fəzilətlər təhsil və təcrübə ilə əldə edilir. "Qəzzali (1058-1111) fəziləti, nəfsinə hakim olmağın orta səviyyədə, balanslı şəkildə istifadə etmək bacarığı kimi görürdü. Qəzzaliyə görə, həddindən artıq qəzəb gücündən istifadə iddialılığa, çatışmazlıq qorxaqlığı, ağıllı istifadə isə cəsarəti ortaya qoyur" (Corbin, 2013). "Aristotel isə fəzilətləri iki əsas kateqoriyaya ayıraraq onu xarakter fəzilətləri və düşüncə fəzilətləri kimi qiymətləndirdi. Cəsarət, təvazökarlıq, alicənablıq, əmin-amanlıq, ədalət və doğruluğu xarakter xüsusiyyətləri kimi dəyərləndirirdi, düşüncə, müdriklik, ağıl, anlayış və düzgün qərarverməni səriştələrin ağılın, düşüncənin fəzilətləri kimi vurğulayırdı. Bu ideyalarla Aristotel özündən sonra gələn Şərq və Qərb mütəfəkkirlərinə təsir etmişdir" (Ayten, 2014).

Müasir dövrdə müsbət psixologiya məktəbinin nümayəndələri var ki, onlar fəzilətləri yenidən psixologiyanın predmetinə çevirmişlər. "Pozitiv psixologiyanın qabaqcılları hesab edilən Kristofer Peterson və Martin Seliqman görə psixoloqlar "həyatı yaşamağa dəyər verən şey"lə maraqlanmaq əvəzinə, insanlarda daha çox patoloji vəziyyətlər və çatışmazlıqlara diqqət yetirirlər. Seligmanın apardığı tədqiqata görə, mətbuatda kədər mövzusu ilə bağlı hər 100 məqaləyə, xoşbəxtlik haqqında cəmi 1 məqalə düşür. Xüsusilə, iki böyük dünya müharibələrindən sonra bəşəriyyətin mənfi cəhətləri, onun xəstəlikləri və həlli yollarına diqqət yetirən psixologiya daha çox ruhi xəstəliklərin müalicəsinə diqqət yetirmişdir. İnsanlarda yaxşı və hansı potensialların olmasını, onun tapılmasını, inkişaf etdirilməsini digər məqsədini nəzərdən qaçırmışdılar" (Aristotales, 2014). Demək, müasir dövrdə insanların cəmiyyətdə törədikləri cinayət və ya qeyri-əxlaqi davranışlarına görə aldıqları cəzanın yüngülləşdirilmiş forması olan probasiya xidmətin həyata keçirilməsi zamanı nəzərə alınan sosial xidmətlərdə yuxarıda qeyd olunan halların tətbiqi həmin şəxslərin həm təkrar cinayətdən uzaqlaşmasında, həm də cəmiyyətə sağlam qaytarılmasında xüsusi rolu ola bilər.

*Probasiya xidmətində fəzilətlərin təsiri və tətbiqinə dair bəzi mülahizələr.* Qanunvericiliyin humanistləşdirilməsi ilə əlaqədar Cinayət Məcəlləsinə edilən dəyişiliklərdən sonra məhkəmələr azadlıqdan məhrumetməyə alternativ olan, xüsusilə elektron nəzarət vasitəsinin tətbiqini nəzərdə tutan azadlığın məhdudlaşdırılması növündə cəzaların təyin edilməsinə üstünlük verib, nəticədə probasiya qurumlarının qeydiyyatında olan şəxslərin sayı ardıcıl surətdə artıb, 2018-ci illə müqayisədə 2020-ci ildə Xidmətin qeydiyyatında olan məhkumların sayı 25,9 faiz, 2021-ci ildə isə 17,6 faiz çox, 2024-ci ildə isə 26.3% olub (Azərbaycan Respublikası Ədliyyə Nazirliyi, Probasiya Xidməti, 2025).

2018-2025-ci illərdə 3519 şəxsə elektron nəzarət vasitələri tətbiq edilib. Onların mütləq əksəriyyəti azadlığın məhdudlaşdırılması cəzasına məhkum edilmiş şəxslər olub. Milli Məclisin 07.03.2025-ci il tarixli plenar iclasında parlamentin İnsan Hüquqları Komitəsinin sədri, deputat Zahid Oruc "İcra haqqında" qanununun layihəsi birinci oxunuş zamanı "Azadlıqdan məhrumetmə deyil, məhdudlaşdırma tədbirləri "cəza bilərziyi"nin tətbiqi mütərəqqi hadisədir. Probasiya Xidmətinin yaradılması təkcə büdcə vəsaitlərini qorumur, həm də şəxsin yaxınlarından və cəmiyyətdən təcridsiz islahına xidmət edir. Məlumat üçün deyək ki, hazırda şərti məhkuma elektron nəzarət vasitəsi tətbiq edilib və Xidmət fəaliyyət dairəsini, rəqəmsal monitorinqi, sosial adaptasiya və bərpa tədbirlərini gücləndirir. "Probasiya haqqında" yeni qanun qəbul edəriksə, cəza siyasətində alternativ qərarların dairəsi genişlənər" deyə bildirib. Xidmətin fəaliyyət dairəsində 3519 "cəza bilərziyi" gəzdirən şəxslərin sosial problemlərinin qiymətləndirilməsi, sosial adaptasiya və bərpa tədbirlərini gücləndirilməsi məqsədi ilə sosial işçilərdən ibarət ilkin pilot layihələrin keçirilməsi cəmiyyətin sosial problemlərinin həllinə və gələcək cinayət yükünün azalmasına xidmət etmiş olar. Bu cür layihələrin həya keçirilməsi fərdin sosial həyata uyğunlaşmasına kömək edən mənsubiyyət kimi bir çox psixo-sosial strukturları ehtiva edən və özünənəzarət hissini gücləndirmək və özünü idarə etməyə nail olmaqda mühüm rol oynaya bilər.

Fərdlər düşdükləri çarəsiz vəziyyətlərlə qarşılaşdıqları zaman problemin öhdəsindən gəlmək bacarıqlarında fəzilətlərin əhəmiyyətli dərəcədə yeri vardır. Bir çox psixoloqlar nikbinlik, ümid,

müdriklik, bağışlanma, minnətdarlıq, təvazökarlıq, köməklik və yumor kimi fəzilətlərin mübarizə prosesinə müsbət təsir etdiyini qeyd edirlər. Fəzilətdən uzaq insanı məziyyətlər isə var olan problemlərin dərinləşməsinə və cinayətə sürükləyən vəziyyətlərə səbəb ola bilir. "Qəzəb və gərginlik başda olmaqla bir çox emosiyalar ilk növbədə məyusluq, depressiya, çarəsizlik, inciklik, qorxu adətən münasibətlərin qarşılıqlı vəziyyətinə qarşı təzyiq yaradır. Bu xoşagəlməz hissi və ya stresli vəziyyəti düzəltmək üçün fərdin alternativ cavab vermək istəməsinə səbəb olur. Buna görə də bu mənfi emosiyalar stress və cinayət davranışı arasında vasitəçi rolu oynayır"(Agnew, 2001). "Adney gərginliklə cinayətin əlaqəsini dörd əsas xüsusiyyətlə müəyyən etmişdir. Onun fikrincə, cinayətə yol açan spesifik gərginliklər adətən daha cox gərgin vəziyyətin olması, dərk edilən ədalətsizlik,özünə nəzarətin aşağı olması, və şəxsə göstərilən təzyiq ilə əlaqələndirir və bu hallar insanı cinayət törətməyə təşviq edir" (Agnew, 2006). Bəllidir ki, azadlıqdan məhrumetmə ilə əlaqədar olmayan cəzalara məhkum edilmiş şəxslərin islah olunmasına dair qərarların icarsı ilə əlaqədar görülən işlərin sırasında həmin şəxslərə təkcə Probasiya xidmətində tətbiq olunmuş elektron - nəzarət və monitoriqin aparılmasiyla deyil, eyni zamanda göstərilmiş hümanist yanaşmanı cəmiyyət üçün daha faydalı edə biləcək digər sosial dəstək xidmətləri ilə davam etdirilməsinə ehtiyac vardır. Probasiya nəzarətində olan məhkumlar aydındır ki, işlədikləri cinayətə görə dövlətin hümanist qanunları ilə azadlıqda olduqlarına baxmayaraq özlərini tam azad və nəzarətdən kənarda olmadıqlarını bilirlər və bu bilgi onlarda müəyyən gərginlik hissini formalaşdırır. Gərginliyin öhdəsindən gəlmək üçün bir fərdin cinayətə əl atib-atmayacağına, buna qanuni ya qeyri-qanuni formada mübarizə etmə bacarığı, habelə cinayətin əvəzini necə çıxması haqqında düşüncələri, onun cinayətə meyillilik dərəcəsindən asılıdır. Belə halda fərdin yeni cinayət törədməsi ehtimalını aşkarlayıb qarşısının alınması üçün bu amillərin öhdəsindən gəlmək bacarıqları və resursları, ənənəvi sosial dəstək, sosial nəzarət, cinayətkarların həmyaşıdları ilə ünsiyyət və cinayətə səbəb olan vəziyyətlərə məruz qalma da daxil olmaqla bir sıra dəyişənlərdən asılıdır. Bu səbəbdən təqsirləndirilən şəxsin fərdi, yaş və cins xüsusiyyələrinə uyğun olaraq gərginlik və stresin öhdəsindən gəlməsi və problemləri həll etməsi üçün effektiv davranış nümunələri təqdim etməklə bacarıqları, idrakın yenidən qurulması, sosial bacarıqların öyrədilməsi və s. proqramların həyata keçirilməsi, fərdlərin sağlam və sosial cəhətdən uyğun həyat davamlılığına töhfə verə bilər.

Probasiya xidmətində azadlıqdan məhrumetmə ilə əlaqədar olmayan cəzalara məhkum edilmiş şəxslərin cəmiyyətə inteqrasiyasına yönəlmiş sosial tədbirlərin tətbiqində fərdin gücləndirilməsində fəzilətlərlə dəstəklənməsi hər bir müraciətçi üçün vacibdir və bu onların özlərinə xas olan rifahın inkişaf etdirilməsi baxımından olduqca vacibdir.Çünki insan mahiyyətcə yaxşı bir fəal varlıqdır və kifayət qədər dəstəklənirsə, o insani parametrlərinə qayıtmaq üçün səy göstərmək potensialına malikdir. Bu baxımdan sosial xidmət tətbiqlərində fəzilətlərdən istifadə etmək iki qayda üzərindən aparıla bilər. Birincisi, qoruyucu-profilaktik xidmətdir ki, burada fəzilətlər çərçivəsində fərdin şəxsiyyətinin möhkəmlənməsinin inkişaf etdirilməsi baxımından dəstəkləyici psixo-sosial amillər kimi istifadə edilə bilər. İkincisi, müdaxilə mərhələsində fərdin psixoloji sağlamlığını bərpa etmək və özü haqqında müsbət düşüncələr inkişaf etdirmək və onun müalicəvi təsirindən istifadə etmək olar.

## Nəticə

Probasiya xidmətinin nəzarətində olan təqsirləndirilən şəxsin davranışı, mənəvi-psixoloji keyfiyyəti, sosial durumu, sosial iş və xidmət təcrübələri çərçivəsində təhlil olunmalı, onlara *psixo-sosial təhsil modeli* kimi hansı insani fəzilətlərin tətbiqi nəzərə alınmalıdır. Bu tətbiq mərhələsində yaş və cins xüsusiyyətlərinə görə qruplaşdırılması təqsirləndirilən şəxslərin psixo-sosial təhsil modeli qrupların subyektiv rifahına kömək edəcəkdir. Xüsusilə yeniyetmə yaş həddində impulslarını idarə etməkdə çətinlik çəkən şəxslər asanlıqla cinayətə meyil edir, uyuşdurucu maddələrdən istifadə edir və ya cinayətin qurbanı olurlar. İnsanlara uşaqlıqdan təvazökarlıq və özünü idarəetmə fəziləti öyrədilməli, onlara öz qabiliyyətlərini real şəkildə dərk etmələri təmin edilməlidir.

İnsani fəzilətlər - müxtəlif gərginlik və stresslər nəticəsində yaşanan emosional reaksiyalara qarşı fərdlərin bu vəziyyətin öhdəsindən gəlmək bacarığı kimi istifadə edə biləcəkləri potensial mübarizə mexanizmlərindən biridir. Lakin Ümumi Gərginlik Nəzəriyyəsinə görə, cinayət hərəkətləri təkcə intellektual və davranış səviyyəsində deyil, eyni zamanda insanların həyatında ədalətin dərk edilməsi və qəzəbin yaratdığı gərginlik, emosional reaksiyalarla anlaşılır. Ona görə də cinayət törətmiş şəxslərlə profilaktik və reabilitasiya işlərin aparılması zamanı onların yaşadıqları mənfi hadisələrin emosional təsirlərinə diqqət yetirmək, problemlərın öhdəsindən gəlməyin daha effektiv yollarının işlənib hazırlanmasına dair sosial tədqiqatların daxil edilməsi vacibdir. Sosial xidmət sahəsində fəzilətlərin tətbiqində *psixo-sosial təhsil modelindən* istifadə etməklə şəxslərin introvert təqsiri və dəyərsizlik kimi neqativ hisslərdən qurtulmalarına nə dərəcədə töhfə verdiyi müəyyən edilməlidir. Eyni zamanda, risk qrupları arasında insani fəzilətlətin onların həyat keyfiyyətinə təsirinin necə olacağı kimi məsələlərin araşdırılması lazımdır.

Sosial işçilərin Probasiya xidməti sahəsində apardıqları müşahidələr və qiymətləndirmələr nəticəsində hazırladıqları hesabat və araşdırmalar təqsirləndirilən bir şəxsin məhkəmə sistemində nömrələnmiş faylından əlavə, yeni hekayəsi olan bir fərd kimi görünməsini təmin etməkdir. Fərdin cinayətə meyiletmə səbəbləri onların başa düşülməsini və təkrar cinayətin qarşısının alınmasını təmin etmək məqsədi ilə müvafiq, effektiv və tətbiq edilə bilən qoruyucu və dəstəkləyici sosial tədbirlər barədə tədqiqatların müəyyən edilməsi və həyata keçirilməsinin böyük əhəmiyyəti vardır. Cinayət davranışını yalnız fərdi xüsusiyyətlərdən qaynaqlanan bir problem olaraq görərək, cəzaya müraciət etmək cinayətin qarşısını almaq üçün həll yolu deyildir, insanı əhatə edən makro mühit, cinayətə şərait yaradan gərginlik və stress faktorları da nəzərə alınmalıdır. Bu baxımdan ədliyyə sistemində, cəzaçəkmə müəssisələrində, probasiya xidmətində və mediasiya xidmətində sosial işçilər tərəfindən aparılan işlərin əhəmiyyəti aydın görünməkdədir. Qurumların ehtiyacları ilə müqayisədə kadr məhdudluğu, iş yükünün isə yüksək olması bu sahədə sosial işçilərə ehtiyacın olduğunu bir daha aydın göstərir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Hüquqi Aktların Dövlət Reyestri. https://eqanun.az/framework/37471.
2. Azərbaycan Respublikası Ədliyyə Nazirliyi. Cəzaların icrasında və cəza siyasətinin humanistləşdirilməsində Probasiya Xidməti mühüm rol oynayır. https://justice.gov.az/news/3234.
3. Azərbaycan Respublikası Ədliyyə Nazirliyi. Ədliyyə Nazirliyinin Probasiya xidməti Bakı Dövlət Universiteti ilə əməkdaşlıq edəcək. https://justice.gov.az/news/3867.
4. Azərbaycan Respublikası Ədliyyə Nazirliyi. Probasiya Xidməti. https://justice.gov.az/news?category_id=38.
5. Ayten, A. (2014). *Erdeme dönüş: psikoloji ve mutluluk yolu*. İz Yayıncılık.
6. Aristotales. (2014). *Nikomakhos'a Etik*. Say Yayınları.
7. Agnew, R. (2001). Building on the foundation of general strain theory: Specifying the types of strain most likely to lead to crime and delinquency. *Journal of Research in Crime and Delinquency*, №38, pp.319-361.
8. Agnew, R. (2006). *Pressured into crime: An overview of general strain theory*.
9. Corbin, H. (2013). *İslam felsefesi tarihi*. İletişim Yayınları.
10. Seligman, M. E. (2007). Gerçek mutluluk: kalıcı doyum potansiyelinizi gerçekleştirmek için yeni olumlu psikolojinin kullanılması. HYB Yayıncılık.
11. Seligman, M.E., Rashid, T., Parks, A.C. (2006). Positive Psychotherapy. *American Psychologist*. pp.774-778.
12. Zastrow, C. (2015). Sosyal hizmete giriş. Nika Yayınevi.

Daxil oldu: 05.03.2025
Qəbul edildi: 12.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/21-25

**Cavadxan Qasımov**
Naxçıvan Dövlət Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-3826-033X
cavadxan.yusifoglu@ndu.edu.az
**Əşrəf Ələkbərov**
Naxçıvan Dövlət Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0006-8756-0685
a.ashraf@mail.ru

# Naxçıvan Muxtar Respublikasında azad iqtisadi zonalar: yeni iqtisadi sıçrayışın başlanğıcı

### Xülasə

Məqalədə Azərbaycan Respublikasının ayrılmaz tərkib hissəsi olan Naxçıvan Muxtar Respublikasının ölkənin yeni iqtisadi reallıqları müstəvisində formalaşdırmış olduğu potensialı və perspektivləri barəsində söz açılmışdır. Bu perspektivlər, xüsusilə, Azad İqtisadi Zonaların (AİZ) yaradılması və logistik mərkəzə çevrilməsi ilə müşayiət olunan proseslərlə tamamlanmış olur. Bu baxımdan da AİZ-lərin elmi və nəzəri əsasları verilmiş, onun muxtar respublika iqtisadiyyatı üçün səmərəlilik xüsusiyyətləri təqdim olunmuşdur. Eyni zamanda, muxtar respublikanın logistik mərkəz olaraq, iqtisadi əhəmiyyətinə toxunulmuşdur. Göstərilmişdir ki, istər AİZ-lər, istərsə də, logistik mərkəz muxtar respublika iqtisadiyyatının ölkənin milli iqtisadiyyatına tam və dolğun əsaslarla inteqrasiya olunmasına daha əlverişli zəmin yaratmaqdadır. Bütün bu proseslərin səmərəli təmin olunmasında muxtar respublika iqtisadiyyatının malik olduğu potensial göstərilmişdir.

Əsaslandırılmışdır ki, muxtar respublikada iqtisadiyyatın aparıcı sahələrinin, o cümlədən, kənd təsərrüfatı və sənayenin əlaqəli inkişafı, ərazinin tarixi İpək Yolunun üzərində yerləşməsi mühüm əhəmiyyətə malikdir. Həmçinin, beynəlxalq hava limanının fəaliyyət göstərməsi həm AİZ-lərin yaradılması və fəaliyyətinin tənzimlənməsində, həm də logistik mərkəz olaraq təşəkkülü məsələlərində olduqca mühüm tərəflərinə görə seçilməkdədir.

***Açar sözlər:*** *Azad İqtisadi Zonalar, logistik mərkəz, yeni iqtisadi reallıqlar, davamlı islahatlar, uzunmüddətli prioritetlər*

**Javadkhan Gasimov**
Nakhchivan State University
PhD in Economics
https://orcid.org/0000-0002-3826-033X
cavadxan.yusifoglu@ndu.edu.az
**Ashraf Alakbarov**
Nakhchivan State University
PhD in Economics
https://orcid.org/0009-0006-8756-0685
a.ashraf@ndu.edu.az

# Free Economic Zones in the Nakhchivan Autonomous Republic: the Beginning of a New Economic Leap

### Abstract

The article discusses the potential and prospects that the Nakhchivan Autonomous Republic, as an integral part of the Republic of Azerbaijan, has formed in the context of the country's new economic realities. These prospects are complemented, in particular, by the processes

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

accompanying the creation of Free Economic Zones (FEZ) and their transformation into a logistics center. In this regard, the scientific and theoretical foundations of FEZs are given, and their efficiency features for the economy of the autonomous republic are presented. At the same time, the economic importance of the autonomous republic as a logistics center is touched upon. It is shown that both the FEZs and the logistics center create a more favorable basis for the full and complete integration of the economy of the autonomous republic into the national economy of the country. The potential of the economy of the autonomous republic in the effective provision of all these processes is shown.

It is substantiated that the coordinated development of the leading sectors of the economy in the autonomous republic, including agriculture and industry, and the location of the territory on the historical Silk Road are of great importance. Also, the operation of the international airport is selected due to its very important aspects both in the regulation of the creation and operation of FEZs and in the issues of its formation as a logistics center.

***Keywords:*** *Free Economic Zones, logistics center, new economic realities, sustainable reforms, long-term priorities*

## Giriş

Naxçıvan Muxtar Respublikası Azərbaycan Respublikasının ayrılmaz tərkib hissəsi daha çox istər iqtisadi, istərsə də strateji əhəmiyyəti ilə fərqlənən bölgələrindən biri olaraq, son zamanlarda qətiyyətli inkişaf dinamikası əldə etmişdir. Belə bir dinamikanın olduqca mühüm mənbələrindən biri isə Azad İqtisadi Zonaların (AİZ) təşəkkülü və uzunmüddətli prioritetləri ilə əlaqəli olan tədbirlər olduqca zəruri mahiyyətə malik olmaqdadır. Dünya iqtisadi və istehsal münasibətlərinin çevik olaraq dəyişdiyi bir mərhələdə AİZ-lər muxtar respublikanın makroiqtisadi inkişafının dayanıqlı perspektivliliyini təkmilləşdirmək və xarici yatırımları cəlb olunması məqsədilə zəruri bir mexanizmə çevrilir.

Belə bir vəziyyətdə, Naxçıvan Muxtar Respublikası üçün AİZ-lərin qərarlaşmış olması, bütün tərəflərinə görə bölgənin iqtisadi resurslarından daha səmərəli yararlanmaq imkanlarının mümkün olmasına əlverişli zəmin açmış olacaq. Belə ki, baxdıqda bəlli olur ki, AİZ-lər strateji hüquqi mühitə sahib olan ərazilərdir ki, həmin ərazilərdə də sahibkarlıq təşəbbüsləri olduqca az vergi yükü, sadələşdirilmiş gömrük və inzibati prosedurlar hətta, olduqca fəal əmək bazarı vasitəsilə reallaşmış olur. Həmin qurumlar investisiya şəraitini əlverişli etmək, ixrac imkanlarını gücləndirmək və bölgənin sənaye və texnologiya potensialını möhkəmləndirmək hədəflərini özündə əks etdirir (Vəliyev, Qafarov, 2004; Yıldırım, Karaman, Taşdemir, 2009). Təbii olaraq, AİZ-lə araşdırma və elmi yanaşma müstəvisində dövlətin ərazisinin hansısa bir bölməsi olaraq xüsusiləşmiş əhəmiyyətə malik olur və müəyyən imtiyazlar nəzərdə tutulmaqla fəaliyyətinə zəmin açılmış olur.

**Tədqiqat**

Respublikada ərazi suverenliyinin təmin olunması, müstəqillliyimizin daha da möhkəmlənmiş olunması, bölgələrin uzunmüddətli perspektivlərinin ölkənin makroiqtisadi inkişafına olduqca dinamik meyarlarla inteqrasiya olunması hədəfləri və bu xüsusda da, muxtar respublika iqtisadiyyatında modern keyfiyyət poseslərinin start almış olması, burada, AİZ-lərin təşəkkülü və fəaliyyətinin tənzimlənməsi üzrə olduqca səmərəli səbəbləri də ortaya qoymaqdadır.

*Naxçıvan Muxtar Respublikasında AİZ-lərin yaradılmasının iqtisadi və hüquqi əsasları*

Xüsusilə, qeyd etmək olar ki, muxtar respublikada AİZ-lərin yaradılması mövcud iqtisadi reallıqlar və inkişaf səviyyəsinin açmış olduğu zəminlə daha da real görünür (Məmmədli, İsmayılov, 2007). Milli iqtisadiyyatın çoxistiqamətli hədəflərinin müəyyən olunması, onun daha çox regional xüsusiyyətlərinin ələ alınması və nəticə etibarı ilə, sosial mahiyyətli dəyərləri özündə əks etdirmiş olması, bu sahədə iqtisadi və hüquqi yanaşmaları ilə daha çox xarakterik olur. Hər şeydən əvvəl, onu bildirmək olar ki, Naxçıvan Muxtar Respublikası respublikamızın bir sıra xüsusiyyətlərinə malik olmaqdadır ki, onlar da AİZ-lərin yaradılması və fəaliyyətinin təmin olunması sahəsində olduqca mühüm əhəmiyyət kəsb etmiş olacaq (Qəribov, 2011, s.59). Bunu, şəkil 1-in məlumatlarından görmək olar:

**Şəkil 1**

**AİZ-lərin yaradılması sahəsində Naxçıvan Muxtar Respublikasının malik olduğu potensial**

| | |
|---|---|
| İqtisadiyyatın aparıcı sahələrinin, o cümlədən, kənd təsərrüfatı və sənaye sahələrinin qarşılıqlı və perspektivli inkişafı ilə mühüm mezoiqtisadi əhəmiyyətə malikdir | Tarixi İpək Yolunun üzərində yerləşməklə, zəruri ticarət potensialını özündə əks etdirməkdədir |

Ərazisində Beynəlxalq Hava Limanının fəaliyyət göstərməsi, buradakı AİZ perspektivlərini daha da yüksəltməkdədir

Naxçıvan Muxtar Respublikası coğrafi əhəmiyyətinə görə blokada vəziyyətində olsa da, unikal iqtisadi tərəqqi mexanizmini qərarlaşdırmağı bacarmışdır. AİZ-lərin təşəkkülü bəhs olunan mexanizmin davamlı və ardıcıl hissəsini təşkil edir və bir sıra zəruri hədəfləri də əlçatan edir. Bunu şəkil 2-nin məlumatlarında görmək olar:

**Şəkil 2**

**AİZ-lərin yaradılması ilə Naxçıvan Muxtar Respublikası üçün əlçatan olacaq iqtisadi hədəflər**

| | | |
|---|---|---|
| Xarici və yerli investisiyaların stimullaşdırılması | İstehsal və sənaye potensialının artırılması | Yeni iş yerlərinin yaradılması |
| İxrac yönümlü iqtisadiyyatın qurulması | İnnovasiya və texnologiya transferinin təşviqi | |

Xüsusilə, bütün bunlar üzrə, cari və nizamlanan, eyni zananda, prioritet olaraq müəyyən olunan AİZ-lər muxtar respublikanın makroiqtisadi inkişafının olduqca islahatçı mexanizmlərinin daha zəruri qəbuluna səbəb olacaq (Qəribov, 2011, s.99).

Bu sahələr üzrə ölkəmizdə mühüm tənzimləyici mexanizmlərin səfərbər olması daha mühüm nəticələrə malik olmaqdadır. Belə ki, Naxçıvan Muxtar Respublikasının 2023-2027-ci illər üzrə sosial-iqtisadi inkişafına dair Dövlət Proqramında əlverişli biznes mühitinin yaradılması prioritetləri

müstəvisində ilk olaraq, Azad İqtisadi Zonanının təşəkkülü ilə əlaqəli olan addımların atılmış olması qarşıya qoyulmuşdur. Müzəffər Ali Baş Komandanın tərəfindən təsdiq olunan bu hüquqi sənədin böyük elmi və iqtisadi mahiyyətini ifadə etmək olar. Həmin Dövlət proqramında təsbit olunmuşdur ki, Naxçıvan Muxtar Respublikasında iqtisadi inkişafın sürətləndirilməsi və iqtisadi canlanmanın təşviqi üçün əlverişli biznes mühitinin formalaşdırılması bu sahədə prosedurların sadələşdirilməsi və asanlaşdırılması məqsədilə tədbirlərin icrası vasitəsilə həyata keçiriləcəkdir (Alıyev, İbadov, 1999). Burada Azad İqtisadi Zonanın yaradılması ticarət və logistika imkanlarını genişləndirməklə Naxçıvan Muxtar Respublikasının investisiya cəlbediciliyini artıracaq və iqtisadiyyatın inkişafına əhəmiyyətli töhfə verəcəkdir (Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişafına dair 2023–2027-ci illər üçün Dövlət Proqramının təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 3910 №-li Sərəncamı, 2023).

*Naxçıvan Muxtar Respublikasının yeni iqtisadi prioritetləri: AİZ-lər və daha səmərəli iqtisadi idarəetmənin müəyyən olunması*

Bu bir həqiqətdir ki, muxtar respublikanın mühüm iqtisadi potensialı, xüsusilə yüngül sənaye, qida emalı və logistika bölmələrindən ibarət olmaqdadır. Həmçinin, sənaye parkları, məhəllələri və universitet texnoparklarının da təşəkkülü diqqətdə saxlanılmışdır (Sənaye parkları haqqında nümunəvi əsasnamə, 2013). Bəhs olunanlar, muxtar respublikada AİZ-lərin davamlılığının faydalı olacağına təminat olacaqdır. Ümumilikdə, AİZ-lərin proseslərində modern ideya və təşəbbüslərin müəllifi olaraq, sahibkarlara nəzərdə tutulan imtiyazlar olduqca faydalı fəaliyyət məqsədilə şərait yaradır. Bütün bunlar, şəkil 3-ün məlumatlarında ifadə olunur:




AİZ-lərin təşəkkülü eyni zamanda, Naxçıvan Mutar Respublikasının etibarlı qonşuluq münasibətlərində, əsasən də, Türkiyə və İranla ticarət və sənaye münasibətlərini şaxələndirmək məqsədilə faydalı perspektivlər gətirmiş olur. Belə qurumlar tərəfindən muxtar respublika olduqca çoxistiqamətli regional bazarlara çıxış qazana və Azərbaycanın məcmu ixrac potensialına hərəkətverici təsirini göstərə bilər.

Qeyd olunanlarla yanaşı, AİZ-lərin təşəkkülü, uzundövrlü Milli Prioritetlərin və qarşıdakı mərhələlərə istiqamətlənmiş olan iqtisadi yanaşmanın perspektivli dövrlərini özündə ifadə etdirməkdədir. Yəni ki, AİZ-lər muxtar respublikanın iqtisadi perspektivliliyində tamamilə modern bir bölmənin əsasları olaraq dəyərləndirilə bilər. Belə bir yanaşma, istər milli iqtisadiyyatın daha da inkişaf etmiş olmasına, istərsə də gənc sahibkarların ideyalarına dayanıqlı zəmin yaradılmasına səbəb olacaq. Müvəffəqiyyətli reallaşması halında, AİZ-lər muxtar respublikanı Cənubi Qafqazda əhəmiyyətli iqtisadi mərkəzlərdən biri ola bilər (Qəribov, 2011, s.101).

Beynəlxalq iqtisadi münasibətlər üzrə proseslərin sərbəstləşdirilməsi və bölgəsəl iqtisadi inteqrasiyanın möhkəmlənməsi müstəvisində AİZ dövlətlərin iqtisadi tərəqqi konsepsiyalarında zəruri yerə malik olur. AİZ-lər sahibkarlıq şəraitinin səmərəliləşdirilməsi, xarici yatırımların cəlb olunması, yeni məşğulluq göstəricilərinin qərarlaşması və ixrac potensialının yüksəldilməsi əsasında faydalı vasitələrdən biri hesab olunur. Məhz belə bir müstəvidə, ölkəmizin ayrılmaz tərkib

hissəsi olan Naxçıvan Muxtar Respublikası da AİZ mexanizmi müstəvisində zəruri perspektivlərə sahib olmaqdadır.

*Naxçıvan Muxtar Respublikasının yeni iqtisadi reallıqlar müstəvisində logistik mərkəz olaraq üstünlüklərinin əsaslandırılması.* Bütün qeyd olunanlarla yanaşı həm də Naxçıvan Muxtar Respublikasının geosiyasi və iqtisadi perspektivlərini ifadə edərkən, milli prioritetlər müstəvisində əldə olunacaq uğurlar diqqətdə olmaqdadır. Muxtar respublikanın AİZ kimi perspektivli olmasının birinci mühüm səbəbi onun zəruri coğrafi mövqeyə malik olmasıdır (Əliyev, 2013, s.77). Azərbaycan Respublikasının ərazisinin əsas hissəsindən ayrılmış olsa da, Zəngəzur dəhlizi projesi müstəvisində respublikanın əsas ərazisi ilə birbaşa nəqliyyat bağlantısının təşəkkülü qərarlaşacaq.

Bəhs olunanlar muxtar respublikanı eyni zamanda, regional logistika mərkəzi olaraq inkişaf etdirə bilər. Belə bir yanaşmadan yararlanaraq, muxtar respublikanı Orta Asiya, Qafqaz, Yaxın Şərq və Avropa bazarları içərisində əlaqələndirici funksiyasını yerinə yetirə bilər. Əsasən də Türkiyə ilə quru sərhədin olması AİZ modelinin səmərəli icra olunmasına dəstək ola bilər.

Belə bir infrastruktur təsisatları AİZ-lərin göstəricilərinə zəruri olan logistika, sənaye parkları, sərhəd-gömrük idarəetmələri üçün müvəffəqiyyətli baza formalaşdırır. Bununla yanaşı, Naxçıvan Muxtar Respublikası enerji sahəsində özünü təminat yarada bilən bir bölgə olmaqdadır. Günəş və SES-lə yaşıl enerji istehsalı istiqamətində də resurslara malikdir ki, bu da AİZ-lərin davamlı inkişafı üçün əlverişli şərait yaradır (Qasımov, 2024, s.102).

*Logistik mərkəz perspektivlərinin iqtisadiyyatın sahə strukturuna təsiri imkanları.* Naxçıvan Muxtar Respublikasının etibarlı iqtisadi və sənaye potensialına malik olması, onun AİZ-lərin yaradılması sahəsindəki perspektivlərini də gücləndirməkdədir (Vəliyev, Babayev, 1999; Səmədova, 2018). Muxtar Respublikada indiki mərhələdə mövcud olan çoxistiqamətli sənaye müəssisələri fəaliyyət göstərməkdədir. Onların içərisində, qida sənayesi, inşaat materiallarının yaradılması, yüngül sənaye şirkətləri mühüm yerə malik olmaqdadır. Bəhs olunan mövcud təsisatlar və sənaye bazası qarşıdakı dövrlər ərzində AİZ-lərin təşəkkülü üçün baza funksiyasını reallaşdıra bilər. Bir qayda olaraq, AİZ-lərdə vergi imtiyazları, sərbəst valyuta prosesləri, çevik lisenziya və qeydiyyat qaydaları reallaşmış olarsa, bölgəyə yerli və xarici yatırımçıların marağına səbəb olacaq (Qəribov, 2011, s.46). Eyni zamanda, bunu, xarici yatırımlar və ixrac perspektivləri baxımından da önəmlilik kəsb edir. AİZ-lərin yaradılması, muxtar respublikada bir sıra xüsusiyyətlərinə görə də aktuallığa malik olmaqdadır. Bunu şəkil 4-də görmək olar.




## Nəticə

Yeni iqtisadi reallıqlar müstəvisində daha mütərəqqi hədəflərin müəyyən olunması muxtar respublikanın makroiqtisadi inkişafında yeni keyfiyyət mərhələsini başladacaq. Burada Zəngəzur dəhlizinin istismara verilməsi və strateji baxış konsepsiyasının mühüm əhəmiyyətini qeyd etmək olar. Bildirmək olar ki, Azərbaycan hökumətinin uzunmüddətli hədəflərindən biri olan Zəngəzur dəhlizi, muxtar respublikanın iqtisadi əhəmiyyətini zəruri olaraq, yüksəltmiş olacaq (Qasımov,

2024, s.124). Bu dəhliz vasitəsilə Naxçıvan Muxtar Respublikasının uzunmüddətli iqtisadi prioritetləri üçün daha əlverişli zəmin olacaq. Bunlar şəkil 5-n məlumatlarında əks olunub:


**Şəkil 5**

**Zəngəzur dəhlizinin istismara verilməsindən sonra Naxçıvan Muxtar Respublikasında əlçatan olacaq perspektivlər**



*AİZ-lərin fəaliyyətində hüquqi və institusional dəstək mexanizmlərinin əsaslandırılması.* Ölkəmizin AİZ-lər barəsində tənzimləyici mexanizmləri, sahibkarların mənafeyini müdafiə edir, təmiz və faydalı investisiya şəraiti təmin edir. Belə hüquqi baza muxtar respublikada da reallaşmış oluna bilər. Bununla bağlı olaraq:

- AİZ-lərin yönləndirilməsi məqsədilə, xüsusi idarəetmə strukturu təşkil olunmalı;
- Rəqəmsal proseslər və "bir pəncərə" mexanizmi icra olunmalıdır (Qəribov, 2011, s.109).

Həmin təşkilati vasitələr AİZ-lərin səmərəliliyini yüksəltmiş olacaq və yatırımçılar üçün təmiz şərait yaratmış olacaq. Naxçıvan Muxtar Respublikasının AİZ olaraq tərəqqisi, istər bölgənin iqtisadi inkişafının təmin olunması, istərsə də ölkəmizin dolğun iqtisadi konsepsiyasının gerçək olması müstəvisində mühüm təsirə malik olmaqdadır.

## Ədəbiyyat

1. Alıyev, İ., İbadov, S. (1999). *Azərbaycan iqtisadiyyatı.* Ağrıdağ.
2. Əliyev, Ş.T. (2013). *Azad iqtisadi zonalar*.
3. İbadov, S. (2009). *İqtisadi nəzəriyyə*. Şərq-Qərb.
4. Məmmədli, O., İsmayılov, F. (2007). *İqtisadi nəzəriyyə*. MBM.
5. *Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişafına dair 2023–2027-ci illər üçün Dövlət Proqramı*. (2023).
6. Qasımov, F., İsmayılov, İ., Qasımova, L. (2008). *Sahibkarlığın əsasları*.
7. Qasımov, C.Y. (2024). *Naxçıvan Muxtar Respublikası – 100: yeni iqtisadi reallıqlar və davamlı inkişaf*.
8. Qəribov, A.H. (2011). *Azad iqtisadi zonalar və iqtisadi təhlükəsizliyin tənzimlənməsi.*
*Sənaye parkları haqqında nümunəvi əsasnamə*. (2013).
9. Səmədova, O. (2018). *İqtisadiyyata giriş.*
10. Vəliyev, T., Babayev, Ə. (1999). *İqtisadi nəzəriyyə*.
11. Vəliyev, T., Qafarov, Ş. (2004). *İqtisadi nəzəriyyə*.
12. Yıldırım, K., Karaman, D., Taşdemir, M. (2009). *Makro ekonomi*.

Daxil oldu: 17.03.2025
Qəbul edildi: 21.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/26-31

**Камаля Софиева**
Бакинский Государственный Университет
доктор философии по истории
https://orcid.org/0000-0002-4902-5722
kemalesofiyeva@gmail.com

# О мусульманской общине Сингапура

## Резюме

Статья посвящена положению мусульманской общины в Сингапуре. В ней указывается, что Республика Сингапур, страна с многонациональным и многоконфессиональным населением. Сингапур – светское государство: ни одна религия не может быть провозглашена как государственная, все группы должны «проявлять терпимость и сдержанность». В конституции провозглашается свобода вероисповедания и религиозной пропаганды, равноправие всех признанных религий. Однако осуществление религиозной свободы не может противоречить общим национальным интересам.

В сингапурском обществе мусульманская община составляет компактное меньшинство, относительно однородное по этно-национальному преимущественно малайскому составу. Тем не менее, этно-религиозное малайское меньшинство занимает существенное место в общественно-политической сфере. В Сингапуре есть множество местных и международных исламских организаций. Государство поддерживает полуофициальные отношения с мусульманской общиной через Исламский совет улемов Сингапура (Majlis Ugama Islam Singapura – MUIS). Через этот орган власти контролируют деятельность мусульманской общины. В стране действует 75 мечетей.

В статье также отмечается, что мусульмане Сингапура, будучи религиозным меньшинством, стараются вести себя сдержанно и осторожно, соблюдая баланс между своей исламской и сингапурской идентичностями.

***Ключевые слова:*** *Юго-Восточная Азия, Сингапур, Ислам, мусульмане-малайцы,* мусульманская община

**Kəmalə Sofiyeva**
Bakı Dövlət Universiteti
tarix üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-4902-5722
kemalesofiyeva@gmail.com

# Sinqapurun müsəlman icması haqqında

## Xülasə

Məqalə Sinqapurdakı müsəlman icmasının vəziyyətinə həsr olunub. Məqalədə qeyd olunur ki, Sinqapur Respublikasının əhalisi çoxmillətli və çoxkonfessiyalıdır. Sinqapur dünyəvi dövlətdir: heç bir din dövlət dini elan edilə bilməz, bütün qruplar “dözümlülük və təmkin nümayiş etdirməlidir”. Konstitusiya dini etiqad və təbliğat azadlığını və bütün tanınmış dinlərin bərabərliyini elan edir. Lakin dini etiqad azadlığının həyata keçirilməsi ümumi milli maraqlarla ziddiyyət təşkil edə bilməz.

Sinqapur cəmiyyətində müsəlman icması, əsasən malayyalılardan ibarət olan etnik-milli tərkibinə görə nisbətən homojen olan, kompakt azlıq təşkil edir. Bununla belə, etnik-dini malay azlığı ictimai-siyasi sferada mühüm yer tutur. Sinqapurda çoxlu yerli və beynəlxalq islam təşkilatları fəaliyyət göstərir. Dövlət Sinqapur Üləmaları İslam Şurası (Majlis Ugama Islam

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

Singapura – MUIS) vasitəsilə müsəlman icması ilə yarı rəsmi əlaqələr saxlayır. Bu qurum vasitəsilə hakimiyyət müsəlman icmasının fəaliyyətinə nəzarət edir. Ölkədə 75 məscid fəaliyyət göstərir.

Məqalədə, həmçinin, qeyd olunur ki, Sinqapur müsəlmanları dini azlıq olaraq müsəlman və sinqapurlu kimlikləri arasında tarazlığı qoruyaraq, özlərini təmkinli və ehtiyatlı aparmağa çalışırlar.

***Açar sözlər:*** *Cənub-Şərqi Asiya, Sinqapur, islam, malayyalı müsəlmanlar, müsəlman icması*

**Kamala Sofiyeva**
Baku State University
PhD in History
https://orcid.org/0000-0002-4902-5722
kemalesofiyeva@gmail.com

## On Muslim Community of Singapore

### Abstract

The paper is dedicated to the status of the Muslim community in Singapore. It states that the Republic of Singapore, located in the “heart of the Malay world,” is a country with a multiethnic and multireligious population. Singapore is secular republic, there is no state or official religion, all groups have to have tolerance position. The constitution proclaims freedom of religion and religious expression, as well as equality of all recognized religions.

In Singaporean society, the muslim community constitutes a compact minority, relatively homogeneous in its predominantly Malay ethno-national composition. Nevertheless, this ethno-religious Malay minority occupies a significant place in the socio-political sphere. There are many local and international Islamic organizations in Singapore. State maintain semi relations with muslim society through Singapore Ulema Union (Majlis Ugama Islam Singapura – MUIS). Thanks this body state control muslim society. There are 75 mosques.

The paper mentioned muslims of Singapore being minority here demonstrate balance between Islam and Singapore identity.

***Keywords*: *** *Southeast Asia, Singapore, Islam, Malay muslims, muslim community*

### Введение

Республика Сингапур, с 1819 г. являлась английской колонией. За этот период английские колониальные власти проводили политику неограниченной иммиграции. В 1951 г. Сингапур стал самоуправляемым государством в рамках Британской империи, а в 1963 году присоединился к Малайзии. 9 августа 1965 года Сингапур уже отделился и стал независимым государством.

**Исследование**

Население Сингапура выросло в результате притока иммигрантов. Иммиграция привела формированию многонационального населения, при этом наиболее распространенной этнической группой были китайцы, за которыми следовали индийцы и малайцы. С 1824 по 1860 год население Сингапура увеличилось с 11 000 до 81 000 человек, из которых 62% были китайцами, 16% — индийцами и менее 14% — малайцами (Горбунова, 2016, с. 59). Экономическое и геополитическое значение Сингапура неуклонно росло, как и его население. Население острова уже достигло 96,1 тыс. человек в 1871 году и 181,6 тыс. человек в 1891 году (Осипова, 2018, с. 211). В течение первого десятилетия XX века ежегодное число китайцев, прибывающих в Сингапур, составляло от 150 000 до 220 000. В 1911 году индийское население выросло почти до 267 000 человек (10,1% от общей численности) (Тюрин, 1980, с.79).

Население Сингапура делится на четыре этнические группы: китайцы, малайцы, индийцы и другие. В 2018 году китайская этническая группа составляла 74,3%, далее следуют

малайцы (13,4%), индийцы (9%) и другие (3,2%). По данным Департамента статистики Сингапура на 2010 год, 33,3% постоянного населения исповедовали буддизм, 18,3% — христианство, 14,7% — ислам, 10,9% — даосизм и 5,1% — индуизм. Другие религии (иудаизм, зороастризм, джайнизм, сикхизм, «культ предков») — 0,7%; 17,0% сингапурцев не исповедовали никакой религии (Одинцова, 2015, с. 208). По состоянию на 2015 год 43,2% населения исповедовали буддизм и даосизм, 18,8% — христианство, 14 — ислам, 5 — индуизм и 18,5% не исповедовали никакой религии (Астафьева, 2020, с. 81-82). По данным переписи 2020 года, мусульмане составляют около 15,6% населения (9).

Сингапур является светским государством, в котором ни одна религия не признана официальной, все организации обязаны «проявлять терпимость и сдержанность», а секуляризация общества далека от завершения. Статья 15 Конституции Сингапура гарантирует свободу вероисповедания всем; тем не менее, осуществление религиозной свободы не может наносить ущерб общенациональным интересам (Лавров, Харитонова, 2020, с. 637).

Почти все этнические малайцы — мусульмане; среди индийцев 55% — индуисты, 25% — мусульмане и 12% — христиане; среди китайцев 54% — буддисты, 16,5% — христиане и 11% — даосы (Одинцова, 2015, с. 210). Небольшую часть китайских мусульман составляют женщины, вышедшие замуж и принявшие Ислам (Астафьева, 2013, с. 247).

Мусульманское влияние в современном Сингапуре можно проследить еще с 11-13-го веков. Большинство коренных малайских мусульман, арабов и китайцев являются суннитами-шафиитами, в то время как большинство мусульман-индуистов являются суннитами-ханафитами или шиитами. До отделения Сингапура от Малайзии в 1965 году судьбы малайских исламских общин на обеих территориях были переплетены самым тесным образом и Сингапур был транзитным пунктом для паломников, прибывающих из стран Юго-Восточной Азии в Мекку. В 1915 году британскими колониальными властями был создан Мусульманский консультативный совет. Основная роль Совета заключалась в консультировании колониальных правителей по вопросам исламских традиций и обрядов. После основания Республики Сингапур как независимого государства в Конституцию были включены положения, устанавливающие особый статус малайцев, исповедующих ислам, в Республике Сингапур (статьи 152 и 153) (Астафьева, 2013, с. 247).

Мусульманская община Сингапура состоит из небольшого числа людей, которые идентифицируют себя как малайцы. Тем не менее, этно-религиозное меньшинство малайцев занимает важное место в общественно-политической жизни страны. Конституция закрепляет статус малайцев-мусульман как коренного населения страны и требует от правительства защиту их прав в политической, религиозной, экономической, образовательной, социальной и культурной сферах (Ефимова, 2013, с. 4). Например, Юсуф бин Исхак, первый президент страны, был мусульманином. И по сей день память о президенте-мусульманине остаётся предметом особого уважения и бережного отношения. На банкнотах Сингапура с 1999 года изображается его лицо, а Институт исследований Юго-Восточной Азии и мечеть в районе Вудландс в Сингапуре названы в его честь (7).

Закон позволяет мусульманам выбирать между светским и шариатским правом в брачных и семейных вопросах. Шариатский суд занимается разводами и другими семейными и брачными спорами с участием мусульман Сингапура с 1958 года. Полномочия шариатских судов распространяются на нарушения конкретных мусульманских религиозных норм. Решения шариатских судов исполняются обычными гражданскими судами. Мужчины-мусульмане могут иметь несколько жен, если их жены не возражают, и у них есть достаточные финансовые ресурсы (Ефимова, 2013, с. 4).

В 1968 году был основан Исламский совет улемов Сингапура (Majlis Ugama Islam Singapura, MUIS), после принятия Закона, предусматривающего применение мусульманского права в соответствии с положениями конституции. MUIS выступает в качестве полуофициального посредника между государством и мусульманской общиной. К числу

ключевых функций MUIS относится консультирование президента страны по вопросам Ислама, а также поддержка религиозной, социально-экономической, образовательной и культурной деятельности в соответствии с исламскими принципами и традициями, зафиксированными в Коране и Сунне. На MUIS возложена ответственность за принятие решений, а также за формирование политики и оперативного планирования. Совет состоит из президента MUIS, муфтия Сингапура, лиц, рекомендованных Министерством по делам мусульман, и других лиц, предложенных мусульманскими организациями. Всех членов Совета назначает президент Сингапура (Астафьева, 2011, с. 74-75). Власти используют этот орган для мониторинга деятельности мусульманской общины: еженедельно подготавливаются тексты религиозных выступлений для использования в мечетях по всей стране, регулируется религиозная жизнь, контролируется деятельность добровольных частных фондов (Ефимова, 2013, с. 4). Представители MUIS собирают религиозные налоги (закят) с мусульман, держат под контролем состояние мечетей, мусульманских могил и вакуфов, проводят конкурсы по чтению Корана, консультируют по вопросам шариата и контролируют, как мусульмане исполняют свои религиозные обязательства. Правовая основа контроля закреплена в законе 1966 года, согласно которому мусульмане должны строго соблюдать религиозные обязанности. С 1975 года Совет следит за организацией хаджа и регулирует вопросы, связанные с хаджем (Астафьева, 2013, с. 248). В Сингапуре 75 мечетей. Наиболее известные из них: Масджид Султан, мечеть Абдул Гафар, мечеть Аль-Ислах, мечеть Хадж Фатима и другие (Ибрагимова, 2019).

Кроме MUIS в Сингапуре есть много местных и международных организаций, которые обеспокоены не столько глобальными вызовами современности, сколько насущными проблемами, касающихся исламско-малайской общины в пределах самой страны. Их деятельность охватывает сферу исламского образования, благотворительности, консолидации местной уммы, а также распространения и защиты исламских ценностей. Так, мусульманская община Сингапура развернула широкомасштабную протестную кампанию в ответ на правительственный запрет на ношение исламских платков в государственных школах. Одна из известных исламских организаций Союз улемов и исламских учителей Сингапура (Pergas), была основана в 1957 году. Эта организация ориентирована на подготовку нового поколения современных лидеров исламской уммы. Поддерживает эмансипацию женщин в рамках шариатских норм, занимается разработкой вопросов исламских финансов, а также правовой защитой заключённых (Ефимова, 2013, с. 5). Большое влияние на сингапурское общество оказывает движение «Исламский даават» (в переводе с арабского — «приглашение»). С 1980 года в стране действует «Ассоциация новообращённых мусульман Сингапура» («Дарул Аркам»), оказывающая поддержку принявшим ислам, а также занимающаяся религиозными и социальными вопросами, с которыми сталкиваются новые члены мусульманской общины (Ибрагимова, 2019). По инициативе MUIS в октябре 2006 года был открыт Центр гармонии, которая занимается углублением понимания Ислама и мусульман среди полиэтнического населения Сингапура, а также развитием диалога и взаимодействия между представителями различных конфессий во всех слоях общества (Астафьева, 2020, с. 87).

При этом в соответствии с разделом 2 статьи 152 Конституции Сингапура, с целью предотвращения расовой и религиозной напряжённости, правительство не одобряет миссионерскую деятельность, направленную на обращение малайцев из Ислама в другие религии. В то же время мусульманская община активно занимается благотворительной деятельностью (7). Являясь религиозным меньшинством, мусульмане Сингапура стремятся к сдержанному и осторожному поведению, стараясь сохранять баланс между своей исламской и сингапурской идентичностями.

## Заключение

Актуальность данной проблемы объясняется, прежде всего, характером творчества Лермонтова, его основными идейно-художественными поисками, эстетическими воззрениями на человека и мир. В центре всех художественных и философских размышлений Лермонтова находится личность, ее психология и мировидение, деяния и жизненное назначение. Лермонтов с особой симпатией относится к свободной в волевом отношении личности, воспевает ее свободу воли, понимая, что она (свобода воли) не приносит человеку счастья и во многом разделяет его трагическую участь.

М.Лермонтов один из первых создателей жанра психологического романа в русской литературе. Человек, его сложный внутренний мир, психология в центре внимания писателя. С тех пор, как существует искусство и литература, основной целью его остается изображение человека. По глубокому убеждению поэта, для полноты своего бытия человек должен быть свободен в своих задачах, деяниях. Вместе с тем он четко сознавал, что абсолютизация свободы воли приводит личность в противоречие с непререкаемыми нравственно- этическими принципами, установленными в обществе.

## Литература

1. Виноградов, И.А. (1964). Философский роман М.Ю.Лермонтова. *Новый мир*. №10, с.120-231.
2. Гегель, Г.В. (1971). *Эстетика*. в 4-х тт. т.1-2. Наука.
3. Лермонтов, М.Ю. (1984). *Сочинения в 4-х тт*. Худож. лит.
4. Мережковский, Д.С. (1969). *М.Ю.Лермонтов – поэт сверхчеловечества*.
5. Михайлова, Е.Н. (1957). *Проза М.Ю.Лермонтова*. Гослитиздат.
6. Осмоловский, О.Н. (1981). *Идея личности и метод её раскрытия в романе М.Ю.Лермонтова «Герой нашего времени». Ф.М.Достоевский и русский психологический роман*. Штиинца.
7. Олридж, Дж. (1975). *Писатель в идеологических джунглях*. Судьбы романа.
8. Соловьев, В.С. (1989). *Чтения о богочеловечестве*. Соч.: в 2-х тт.
9. Тамарченко, Д.Е. (1961). *Из истории русского классического романа. Пушкин. Лермомтов. Гоголь*. Изд-во АН СССР.
10. Удодов, Б.Т. (1973). *М.Ю.Лермонтов. Художественная индивидуальность и творческие процессы*. Изд-во Воронеж. ин-та.
11. Шевченко, Т.Г. (1962). О своеобразии метода психологического анализа в романе М.Ю.Лермонтова «Герой нашего времени». *Учёные записки Харк. ун-та. Труды филолог. фак-та*, т. 10.
12. Шеллинг, В.Ф. (1908). *Философские исследования о сущности человеческой свободы*.
13. Щенников, Т.К. (1982). *Принципы детерминации характера в философском романе Ф.М.Достоевского*.

Поступило: 10.03.2025
Принято: 23.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/45-50

**İradə Bağırova**
Naxçıvan Dövlət Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0001-9326-3322
iradebagirova@yahoo.com

# Kadr potensialı iqtisadi inkişafın əsasıdır

**Xülasə**

İqtisadi inkişafla bağlı araşdırmalarda 1980-ci illərdən sonra diqqət daha çox ölkələrin sosial, mədəni və iqtisadi xüsusiyyətlərinə yönəldilib. Bu çərçivədə təxminən son 40 ilə qədər araşdırmalarda arxa planda qalan insan kapitalı anlayışı bu gün daha çox öyrənilməyə başlanılıb. Belə ki, klassik istehsal amilləri ilə yanaşı, əmək amilinin keyfiyyət aspekti kimi qiymətləndirilən insan kapitalı da ölkələrin inkişaf siyasətlərində öz yerini tutmuşdur. Ümumilikdə şəxsiyyətin bilik, bacarıq və qabiliyyətlərinin məcmusu kimi ifadə olunan insan kapitalının iqtisadi inkişafa təsiri bu gün daha da aktuallaşıb. İqtisadi inkişaf, iqtisadi artımla yanaşı, ölkədəki struktur inkişafları da özündə ehtiva edən bir anlayışdır.

İnsan kapitalı ölkələrdə struktur dəyişikliyi və transformasiyanı həyata keçirən ən mühüm amillərdən biridir. Bu səbəbdən də insan kapitalı ölkələrdə struktur dəyişikliyi və transformasiya ilə inkişafı reallaşdıracaq ən mühüm amil kimi görülür. Bu araşdırmada bu gün davamlı iqtisadi həyatda qalmanın ən mühüm təyinedicisinə çevrilmiş insan kapitalının iqtisadi inkişafda oynadığı rol üzə çıxarılmağa çalışılacaqdır. Bu çərçivədə təhsil, səhiyyə kimi keyfiyyət elementləri ilə iqtisadi inkişafda insan kapitalının əhəmiyyətindən danışılacaqdır.

***Açar sözlər:*** *iqtisadi inkişaf, insan kapitalı, texnoloji inkişaf, səhiyyə və təhsil, informasiya cəmiyyəti*

**Irada Baghirova**
Nakhchivan State University
PhD in Economics
https://orcid.org/0009-0001-9326-3322
iradebagirova@yahoo.co

# Human Resources are the Key of Economıc Development

**Abstract**

After the 1980s mostly in studies on economic development, economical, social and cultural characteristics of countries are emphasized. Concept of human capital that staying in backround at studies have begun to be studied in last 40 years. Human capital has replaced the country's growth and developmentpolicies as a classical production factors in addition to labour, physical capital, natural resources and enterprising factors. Human capital expressed as the sum of the knowledge, skills and abilities that has individuals. Today the impact of human capital on economic development has become more important. Economic development, in addition to economic growth in the country, it is a concept involving structural developments in the country. Human capital is the most important factor that performs the structural development and tranformation in the countries. For this reason, aimed to demonstrate the relationship development and human capital in countries. Therefore, human capital is seen as the most important factor that will carry out the development with structural progress and transformation in the countries. In this studies, we will try to explain the role of human capital on economic development. In recent years human capital become most important determinant of economic development. In this context, qualitative factors such as

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0) 

education and health will be referred to the importance of human capital in economic development and will be discussed view of human development.

***Keywords:*** *economic development, human capital, technological development, healthcare and education, information society*

## Giriş

Klassik iqtisadi yanaşmada istehsal amilləri torpaq, əmək, kapital, təbii ehtiyatlar və sahibkarlardır. Lakin müasir informasiya əsrində klassik iqtisadi yanaşmanın əsas kimi qəbul etdiyi bu istehsal amilləri ölkələrin üzləşdiyi iqtisadi hadisələri izah etmək üçün kifayət etmir. Ona görə də bugünkü müasir iqtisadi və sosial şəraitə uyğun olaraq iqtisadi ədəbiyyatda bu istehsal amillərinin yenidən müəyyən edilməsi və şərh edilməsi zərurəti yaranmışdır.

Kapital dedikdə ilk ağıla gələn fiziki dəyərlər fabrik binaları, maşın, avadanlıq və puldur. Lakin bu gün kapital anlayışı insan kapitalı anlayışı ilə əvəzlənib. Belə ki, ən dəyərli kapital insan kapitalı olaraq müəyyən edilir. İnsan kapitalı fərdlərin iqtisadi fəaliyyətlərində daha səmərəli və faydalı olmaq üçün əldə etdikləri bilik və bacarıqların məcmusu kimi müəyyən edilir. Bu tərifin səbəbi informasiya əsrinə keçidlə iqtisadi hadisələrin də informasiya ilə izah olunmağa başlamasıdır. Həqiqətən də klassiklərin irəli sürdüyü iqtisadiyyatda gəlirlərin azalması qanununu ortadan qaldıraraq insan kapitalı vasitəsilə informasiya istehsal funksiyasına daxil edilmiş və texnologiyadan texnologiya istehsal edən informasiya iqtisadiyyatı irəliləməyə başlamışdır. 1980-ci illərdən sonra informasiya əsri başlayanda insan kapitalı iqtisadi artım və inkişafda yaratdığı daxili təsirlərə görə fiziki kapitalla yanaşı istehsal amili kimi də qəbul edilmişdir. Beləliklə, əməyin keyfiyyət ölçüsü və buna görə də ölkələrin insan kapitalı ehtiyatları və dinamikası hər zamankından daha vacib olmuşdur.

Sürətli texnoloji inkişaflar və dəyişən istehsal üsulları bir tərəfdən bəşəriyyətin rifahını artırır, digər tərəfdən isə məşğulluq imkanlarını ciddi şəkildə çətinləşdirir. Sosial ədaləti təmin etmək və insan kapitalı ehtiyatını səmərəli qiymətləndirmək üçün əhalinin çox olduğu ölkələrin iqtisadiyyatlarının bu transformasiyanı həyata keçirməsi mühüm zərurətdir. Səhiyyə və təhsil kimi ən təməl ehtiyacları ehtiva edən insan kapitalı anlayışı XX əsrlə birlikdə bu kontekstdə böyük bir sıçrayış yaşamış, inkişaf etmiş və inkişaf etməkdə olan ölkələr üçün həm strateji istehsal faktoru, həm də iqtisadi inkişafın mövzusuna çevrilmişdir.

*İqtisadi inkişaf və insan resursları arasındakı asılılıq*. İnkişaf konsepsiyasının tarixən yaranmasının əsasını inkişaf etməmiş ölkələrdə insanların iztirablarının azalması və bu ölkələrdə maddi rifahın yüksəlməsi təşkil edir. Ən ümumi mənada iqtisadi inkişaf bir xalqın arzu olunan şəkildə inkişaf etməsi üçün bütövlükdə milli iqtisadiyyatın təşkilidir. Bu ümumi ifadədə inkişaf bir cəmiyyətdə iqtisadi, sosial və siyasi baxımdan arzu olunan hər hansı dəyişiklik və inkişaf kimi müəyyən edilə bilər. Bundan əlavə, iqtisadi inkişaf ilk növbədə adambaşına düşən milli gəlirin artırılması kimi müəyyən edilir. Bununla belə, iqtisadi inkişaf adambaşına milli gəlirin artırılması ilə yanaşı, istehsal amillərinin kəmiyyət və səmərəliliyinin artırılması, milli gəlir və ixracda sənaye sektorunun payının artırılması kimi struktur dəyişikliklərini də əhatə edir (Han, Kaya, 2008, s.2). Ölkələrin iqtisadi, sosial və siyasi strukturları müəyyən fərqlərə malik olduğundan, iqtisadi inkişafı tək dəyişən əsasında meyarlarla izah etmək kifayət qədər çətindir. İqtisadi inkişafı tam başa düşmək üçün inkişafı həm iqtisadi, həm də sosial baxımdan bir çox dəyişənlərdə qiymətləndirmək zərurəti yaranmışdır (Tuna, Yumuşak, 2002, s.2). İnkişaf iqtisadi və sosial dəyişənlərdə inkişafın birləşməsi kimi müəyyən edildiyi üçün bu konsepsiyanın mərkəzində insan amilinin yerləşdirilməsi düzgün olardı.

Müasir informasiya cəmiyyətində iqtisadi inkişafın əsasını fərdlərin keyfiyyətlərinin inkişafını ön plana çıxaran insan inkişafı təşkil edir və iqtisadi inkişafla bağlı araşdırmalarda fərdlərin keyfiyyətlərini vurğulayan dəyişənlərdən istifadə olunur. Bu kontekstdə Birləşmiş Millətlər Təşkilatının İnsan İnkişafı Təşkilatı (BMTİİT) ölkələrin insan inkişafının göstəriciləri kimi doğulanda gözlənilən ömür uzunluğu, orta təhsil illəri, adambaşına düşən real ÜDM kimi

dəyişənlərdən istifadə edərək ölkələrin insan inkişafı indeksini (İİİ) hesablayır (İnsan İnkişafı Hesabatı, 2010, s. 215).

**Tədqiqat**

Dayanıqlı İnkişaf Məqsədləri (DİM) Birləşmiş Millətlər Təşkilatı tərəfindən 2030-cu ilə qədər bütün dünyada davamlı inkişafı təşviq etmək məqsədi daşıyan hərtərəfli planı təmsil edir. Ümumilikdə 17 məqsəddən ibarət olan bu plan iqtisadi, sosial və ekoloji ölçülərdə davamlılığı dəstəkləmək və dünyada yoxsulluğu azaltmaq məqsədi daşıyır. Bu hədəflər aşağıdakılardır: yoxsulluğa son, sıfır aclıq, sağlamlıq və rifah, keyfiyyətli təhsil, gender bərabərliyi, təmiz su və kanalizasiya, sərfəli və təmiz enerji, yaxşı iş və iqtisadi inkişaf, sənaye, innovasiya və infrastruktur, bərabərsizliklərin azaldılması, davamlı şəhərlər və icmalar, məsuliyyətli istehlak və istehsal, iqlim fəaliyyəti, dəniz və okean resurslarının mühafizəsi, torpaq ekosistemlərinin mühafizəsi, meşələrin davamlı idarə edilməsi, səhralaşmanın və torpaq itkisinin qarşısının alınması, sülh, ədalət və güclü qurumlar, qlobal əməkdaşlıq və tərəfdaşlıq

*Davamlı iqtisadi inkişafın müəyyənediciləri.* İqtisadi inkişafın öz amillərinin olması qaçılmazdır. Əsas amillər təbii ehtiyatlar, fiziki kapitalın yığılması, texnoloji inkişaf və insan resurslarıdır. Bu amillərin ədədi bolluğu özlüyündə kifayət etməsə də, onların həm də keyfiyyət fərqlərinin olması inkişafın hərəkətverici və müəyyənedici qüvvəsinə çevrilməsinə səbəb olmuşdur. Bir ölkənin iqtisadi, mədəni və siyasi strukturunun transformasiyasında rol oynayan ən mühüm amillər inkişaf dinamikasını təşkil edir. Bu inkişaf dinamikasının ən mühüm ölçüsü iqtisadi ölçülərdir. İqtisadi inkişafın əsas ölçüləri təbii ehtiyatlar, fiziki kapitalın yığılması, texnoloji inkişaf və əməkdir (Taban, Kar, 2005, s.9). İqtisadi inkişafın əsasını təşkil edən bu amillər inkişafa iki şəkildə təsir edir. Birincisi, inkişafı şərtləndirən amillərin kəmiyyətinin artırılması, ikincisi isə inkişafı şərtləndirən bu amillərin səmərəliliyinin artırılmasıdır. Məhsuldarlığın bu artımı təhsil səviyyəsinin artması, iş bölgüsü və daha qabaqcıl texnologiyaların inkişafı kimi səbəblərdən istehsal amillərinin keyfiyyətinin artması ilə bağlıdır (Yıldırım, Karaman, Taşdemir, 2009, s.19).

*İxtisaslı insan resurslarının önəmi*: ixtisaslı insan resursları öz təhsili, bacarıqları və təcrübəsi ilə iqtisadiyyata töhfə verir. Bu ehtiyatlar yeni iş yerləri yaradır, istehsalın səmərəliliyini artırır, ölkənin rifahını yüksəldir.

*İqtisadi inkişaf və innovasiya*: insan resursları həm də iqtisadi artımın əsas dinamikası olan innovasiyaların mənbəyidir. İnnovativ ideyalar və texnologiyalar iqtisadi inkişafı sürətləndirir, ölkənin rəqabət qabiliyyətini artırır.

*İnsan resurslarının idarə edilməsi:* insan resurslarının idarə edilməsi ölkənin iqtisadi inkişafına dəstək verməkdə strateji rol oynayır. İnsan resurslarının idarə edilməsi işçilərin səriştələrini artırır, onların motivasiyasını artırır və işçilərin fəaliyyətini yaxşılaşdırır**.**

*Son nəticə:* insan resursları potensialı ölkənin iqtisadi inkişafının əsasını təşkil edir. Bacarıqlı və istedadlı insan resursları iqtisadi inkişafın davamlılığını təmin edir, innovasiyaları təşviq edir və rəqabət qabiliyyətini artırır.

*Təbii sərvətlər:* insan ehtiyaclarının ödənilməsinə və sosial məqsədlərin həyata keçirilməsinə imkan verən, habelə bu təşəbbüsləri asanlaşdıran bütün vasitələr resurslar adlanır. Təbii ehtiyatlar istehsal prosesinin mühüm elementlərini təşkil edir. Neft, təbii qaz, dəmir, polad və kömür kimi ehtiyatlar istehsal prosesi üçün əvəzolunmazdır. Bu kontekstdə təbii sərvətlərdən insan həyatının davamlılığı və rahatlığı üçün istifadə iqtisadi fəaliyyət kimi qəbul edilir. Bu səbəbdən cəmiyyətlərin iqtisadi inkişafı ilə malik olduqları təbii sərvətlər arasında güclü əlaqə vardır. İnkişaf etməkdə olan ölkələrin inkişaf prosesi baxımından onların bu təbii sərvətlərə sahib olmaları nə qədər vacibdirsə, onların istehsal prosesində bu resursları istifadəyə yararlı hala gətirə bilmələri də bir o qədər vacibdir. İqtisadi inkişafa nail olmaq üçün böyük miqdarda təbii sərvətlərə malik olmaq kifayət deyil. Bəzi inkişaf etməmiş ölkələr təbii sərvətlərlə zəngindirlər, lakin təbii sərvətlərindən səmərəli şəkildə faydalana bilmirlər.

*Fiziki kapitalın yığılması:* inkişaf etməkdə olan ölkələr üçün inkişaf ilk növbədə kapital yığılmasının artırılması deməkdir. Bu səbəbdən kapitalın yığılması əksər iqtisadçılar tərəfindən inkişafın əsas şərti kimi qəbul edilir. Kapital yığılması ümumiyyətlə cəmiyyətin istehsal etdiyi

dəyərlərin hamısını istehlak etməməsi, lakin onların bir hissəsini istehsalı da reallaşdıracaq kapital mallarına ayırmasıdır. Alətlər, maşınlar, nəqliyyat sistemləri və nəqliyyat vasitələri, sənaye avadanlıqları, fabriklər və avadanlıqlar kimi kapitalın tərkibində istehsalın artırılmasında böyük rol oynayan obyektlər fiziki kapitalın müxtəlif maddələridir (Han, Kaya, 2008, s. 53). Kapital toplanmasının vacibliyini dərk edən az inkişaf etmiş ölkələr istehsallarını artırmaq üçün investisiya səviyyəsini artırmaq lazım olduğunu müdafiə edirlər. Bu kontekstdə inkişaf sənayeləşmə ilə, sənayeləşmə isə kapitalın toplanması və kapital ehtiyatının artırılması ilə mümkündür (Kaynak, 2007, s. 237). Kapitalın yığılması üçün əldə edilən xalis gəlirin bir hissəsi istehlak edilməməli, qənaət edilməli və xalis investisiyalara çevrilməlidir. Yeni fabriklər, maşınlar, alətlər və avadanlıqlar ölkənin fiziki imkanlarını və kapital ehtiyatını artırır, lakin bu kapital artımı üçün ümumi investisiyalar cari kapitalın köhnəlməsi payından çox olmalıdır.

*Texnoloji inkişaf:* ölkələrin inkişafında əsas resurslardan biri, bəlkə də ən önəmlisi texnoloji amil kimi görülür. Texnologiya mal və ya xidmətin istehsalı üçün tələb olunan məlumat, təşkilat və texnikanın məcmusu kimi ifadə edilə bilər. (Kaya, 2004, s. 236) Texnologiyanın səviyyəsi ən geniş mənada istehsal prosesi, məhsulun özü, istehsalın və idarəetmənin təşkili, marketinq və satış sonrası xidmətlə bağlı məlumat və təcrübələrin məcmusu və ya ehtiyatı kimi müəyyən edilə bilər (Kibritçioğlu,1998, s.5). Bu ehtiyatın artması, yəni texnoloji tərəqqi iqtisadi inkişafın lokomotivi kimi görünür. Texnoloji tərəqqi fərdlərin yeni yaradıcı ideyaların qazanc formasında yaratdığı sosial qazancların bir hissəsini əldə etmək üçün yeni informasiya axtarmaq səyləri nəticəsində meydana çıxır (Cons, 2001,s. 115).

Sənayeləşmiş ölkələrdə uzunmüddətli iqtisadi artımın yarıdan çoxu məhsuldarlığı artıran və ya sənaye sahələrinin inkişafına səbəb olan texnoloji inkişaflara əsaslanır. Sənaye inkişafı isə yeni texnoloji bacarıqların davamlı şəkildə mənimsənilməsini təmin edən proses deməkdir. Texnoloji inkişafla məhsuldarlıq arasında da birbaşa əlaqə var və qabaqcıl texnologiya məhsuldarlıq deməkdir. Bu gün inkişaf etməkdə olan ölkələr inkişaf etmək üçün beynəlxalq arenada rəqabət apara bilməlidirlər. Bu rəqabətin əsas şərti ucuz və keyfiyyətli məhsul istehsal edə bilməkdir. Bu istiqamətdə inkişafa can atan ölkələr ucuz və keyfiyyətli məhsul istehsal etmək üçün istehsal texnologiyalarını yeniləməli və inkişaf etdirməlidirlər. Beynəlxalq bazarlarda gərgin rəqabətin yaşandığı bir mühitdə müvəffəqiyyət əldə etmək üçün ölkələrin strukturuna və xüsusiyyətlərinə uyğun gələn ən son texnologiyaların istifadəsi təmin edilməlidir (Kaya, 2004, s. 240).

*İnsan resursları:* iqtisadi inkişafın digər müəyyənedici amili insan resurslarıdır. İnsan resursları həm də iqtisadi inkişafın əsasını təşkil edir. Burada inkişafın əsasını təşkil edən insan resursları dedikdə, inkişafı şərtləndirən digər resursların səmərəliliyinin insan resursları tərəfindən müəyyən edilməsi nəzərdə tutulur. Bu kontekstdə iqtisadi inkişafa təsir edən digər resursların səmərəliliyini artırmaq üçün onların da səmərəliliyi artırılmalıdır (Çoban, 2004, s. 132). İnsan resursları ümumiyyətlə əhali amilinin kəmiyyət və keyfiyyət xüsusiyyətlərinin cəmindən ibarətdir. Əhalinin kəmiyyət xüsusiyyətlərinə ilk növbədə əhalinin sayı, yaş və cins strukturu daxildir. Əhalinin təhsil və səhiyyə ilə bağlı xüsusiyyətləri əhalinin keyfiyyət xüsusiyyətlərini təşkil edir. Əhalinin bu keyfiyyət və kəmiyyət xüsusiyyətləri iqtisadi inkişafın effektivliyini də müəyyən edir (Yumuşak, 2008,s. 11). İnkişaf etməkdə olan ölkələrdə əhalinin kəmiyyət aspekti kimi görünən sürətli əhali artımının sosial-iqtisadi əhəmiyyəti inkişaf iqtisadiyyatının gündəmində xüsusi yer tutmuşdur. Əhali ilə iqtisadi inkişaf arasındakı əlaqə iqtisadiyyata iki nöqteyi-nəzərdən təsir göstərir: tələb və təklif. Əhalinin təklif tərəfdən artımı əmtəə və xidmətlərin istehsalı üçün işçi qüvvəsinin artımını göstərsə də, tələb tərəfdən bazarın genişlənməsini göstərir (Han, Kaya, 2008, s. 95). Əhali artımı inkişaf etmiş və zəif inkişaf etmiş ölkələr üçün ayrıca qiymətləndirilir. İnkişaf etmiş ölkələrdə əhalinin artımı gəlir, təhsil və səhiyyə səviyyəsinin artması ilə paraleldir. İnkişaf etməmiş ölkələrdə yüksək doğum səviyyəsi, o cümlədən ölüm və epidemiya xəstəliklərin azalması əhalinin kəmiyyətcə artmasına səbəb olur, lakin bu artım gəlirlərin, təhsilin və səhiyyənin səviyyəsinin artması ilə paralel deyil. Bu vəziyyətin təbii nəticəsi olaraq, inkişaf etməmiş ölkələrdə əhalinin artımı ilə iqtisadi inkişaf arasında mənfi əlaqə mövcuddur (Taban, Kar, 2005, s. 21).

İqtisadi inkişafla bağlı çoxlu araşdırmaları olan Romerin fikrincə, bir ölkənin inkişaf sürətinə təkcə fiziki kapitalın artımı çox da təsir etmir. Bildirir ki, inkişaf tempinin artmasında əsas təsir dünya bazarına açılmaq, ixtisaslı mühəndis və alimlərin sayının artması ilə bağlıdır. İqtisadi artım modellərində insan kapitalı xüsusi rol oynayır. Məhz insan kapitalı yeni məhsulların istehsalına imkan verir, texnoloji inkişafın əsasını təşkil edir və tədqiqat və inkişaf sektorunun açarıdır. İnsan kapitalı yüksək olan ölkələr bazara böyük sürətlə yeni məhsullar çıxarır və nəticədə sürətli artıma nail olurlar. Təhsil - bilik istehsal edən, ixtira və yeniliklər yaradan, insan yaradıcılığının mənbəyini təşkil edən əsas mənbədir. İqtisadi inkişafın əsas qüvvələrini təşkil edən elm və texnologiya ilk növbədə insan beyni gücünün məhsuludur, lakin bu gücü hərəkətə gətirən adətən təhsildir (Baş, 2004, s. 25).

*İnsan kapitalı və təhsil:* təhsilin cəmiyyətin istehsal potensialını artırmaqla iqtisadi inkişafa töhfə verməsi Adam Smitdən başlayır (Wıgley, Akkoyunlu, 2011, s. 375). Fərdlərin öz qabiliyyət-lərini inkişaf etdirərək bilik və bacarıqlara yiyələnməsini və sosiallaşmasını təmin edən bir proses olan təhsil iqtisadi inkişafla sıx bağlıdır. İnkişaf üçün lazım olan insan gücünün yetişdirilməsi və inkişafı, fərdlərin məhsuldar olması təhsil vasitəsilə həyata keçirilir (Arabacı, 2011, s.101). Təhsil çox vaxt sözün həqiqi mənasında fərdin sosiallaşması, öz yaşıdlarına bənzəyən, cəmiyyətə faydalı bir şəxsiyyətin hazırlanması deməkdir. Təhsil səviyyəsinin yüksəlməsi ilə elmi tədqiqatlar artır, bir çox inkişaf etməmiş ölkələrdə ixtisaslı işçi qüvvəsi darboğazı aradan qaldırılır və bilik ehtiyatı artır. Nəticədə texnoloji inkişaflar sürətlənir, sosial-mədəni mühitin maneə törədən elementləri qırılır və bu istiqamətdə iqtisadi inkişaf sürətlənir (Çolak, 2010, s. 115). Digər tərəfdən, təhsilin məhsuldarlığa təsiri nəsillər boyu davam edir. Təhsilli ana və atalar daha sağlam və savadlı övladlar yetişdirir və nəticədə onların övladları həyatları boyu iqtisadi cəhətdən daha məhsuldar olurlar. Bu savadlı insan kapitalı həm birbaşa, həm də dolayı yolla məhsuldarlığı artırmaqla iqtisadi inkişafa töhfə verir (Baş, 1997, s.137).

Təhsil yoxsulluqla mübarizədə və gəlir bölgüsünün bərabərləşdirilməsində ən fundamental amillərdən biridir. Təbii ki, təhsil vasitəsilə bacarıqlarını artıran şəxslərin daha yüksək maaşlı işlə təmin olunması mümkün olacaq. Bu çərçivədə təhsil- aztəminatlı qruplarda yoxsulluğun nəsildən-nəslə ötürülməsinin qarşısını alacaq əsas vasitələrdən biridir. Təhsil, xüsusilə qadınların iş gücündə iştirakını artırmaqla ölkələrin öz insan resursları potensialından səmərəli istifadə etmələrini təmin edir (Sayğılı, Cihan, 2006,s. 23). Elmi tədqiqatlar müəyyən etmişdir ki, təhsilin səviyyəsi ilə inkişaf elementləri, yəni iqtisadi inkişaf, siyasi və sosial inkişaf arasında xətti əlaqə mövcuddur. Bu xüsusiyyətləri ilə təhsil təkcə fərdin deyil, həm də cəmiyyətə fayda gətirir və ictimai rifahın xərclərini azaldır (Taş, Yenilmez, 2008, s.161). Danılmaz faktdır ki, təhsil insan kapitalının formalaşmasına töhfə verir. Bu səbəbdən insan kapitalı ilə bağlı bir çox tədqiqatlarda təhsil yeganə elementdir. Cəmiyyətin təhsil səviyyəsinin təhlilində istifadə olunan meyarlar savadlılıq səviyyəsi, məktəbdə oxuma səviyyəsi, milli gəlirdən təhsil və təlimə ayrılan pay, müəssisələrdəki müəllim, şagird və texniki işçilərin sayı kimi sıralana bilər.

*İnsan kapitalı və sağlamlıq:* Ümumdünya Səhiyyə Təşkilatının (ÜST) məlumatına görə, sağlamlıq fərdin fiziki və əqli cəhətdən optimal nöqtədə olmasıdır. Sağlam olmaq təkcə xəstəlik və xəstəliyin olmaması deyil, həm də əqli, zəka, əqli və mənəvi cəhətdən sağlam olmaqdır. Digər tərəfdən, sağlamlıq insanın mədəni, dini və ya sosial vəziyyətinə görə dəyişə bilər. Sağlamlıq da fərdlərin təhsil və iqtisadi vəziyyətinə görə dəyişir. Buna görə də sağlamlıq həm subyektiv, həm də obyektiv olaraq nəzərdən keçirilə bilər. Subyektiv sağlamlıq insanların özünü sağlam hiss etdiyi vəziyyətdir. Bir ölkənin iqtisadi inkişafında təhsilə qoyulan investisiyaların rolu səhiyyə sektoruna qoyulan investisiyaların rolu qədər böyükdür. Buna görə də təhsil və səhiyyənin bir-birini tamamladığını və fiziki kapitala və təhsilə edilən oxşar investisiyaların iqtisadi inkişaf baxımından səhiyyəyə də edilməsi lazım olduğunu ortaya qoyur (Taban, Kar, 2004, s. 290). Ümumi səhiyyə xərclərinin cəmiyyətə əksi olan adambaşına düşən həkimlərin sayı, çarpayıların sayı, dərman istehlakı, səhiyyə xidmətlərinin keyfiyyəti və onların əlçatanlığı kimi əsas sağlamlıq göstəriciləri və uşaq ölümü, ümumi ölüm əmsalı və orta ömür uzunluğu cəmiyyətin inkişaf səviyyəsini göstərən amillərdir.

## Nəticə

İnsan inkişafı sağlamlıq, təhsil və gəlir ölçüləri əsasında hazırlanır. Bu gün inkişaf etməkdə olan ölkələrin əsas məqsədləri iqtisadi inkişaf, sosial və siyasi aspektlər baxımından öz inkişafına tez bir zamanda nail olmaq, inkişaf etmiş ölkələr sırasında öz yerini tutmaq, vətəndaşlarının həyatını yüksək həyat səviyyəsində saxlamağa çalışmaqdır. Bu baxımdan iqtisadi inkişafın göstəricisi kimi ilk növbədə adambaşına düşən ÜDM götürülür və bu meyar ölkələr arasında ilkin inkişaf göstəricisi hesab olunur. Lakin bugünkü informasiya əsrində inkişaf göstəricisinin yalnız iqtisadi rakursdan qiymətləndirilməsində çatışmazlıq ön plana çıxdığından, informasiya istehsalçısı olan fərdlə bağlı göstəricilərdə dinamiklik ölkələrin inkişaf meyarları sırasındadır. Qeyd etdiyimiz bu məsələləri növbəti tədqiqatımıza cəlb edəcəyik.

## Ədəbiyyat

1. Arabacı, İ.B. (2011). Eürkiye'de ve oecd ülkelerinde eğitim harcamaları. *Elektronik Sosyal Bilimler Dergis*i, Cilt: 10, Sayı: 35, s.100- 112.
2. Baş, K. (2004). Türkiye'de zorunlu eğitim süresinin arttırılmasının sağlayacağı kazançlar. *Ankara Üniversitesi Siyasal Bilgiler Fakültesi Dergisi*, Cilt: 59, Sayı: 3, s. 21-42.
3. Baş, K. (1997). Eğitim, kalkınma, gelir ve doğurganlık ilişkileri: Mersin örneği. *Mersin Üniversitesi İktisadi Ve İdari Bilimler Fakültesi Dergisi,* Sayı: 4, ss. 135-152.
4. Çolak, M. (2010). Eğitim ve beşeri sermayenin kalkınma üzerine etkisi. *Kamu-İş Dergisi*, Cilt: 11, Sayı: 3, s. 109-125.
5. Çoban, O. (2004). Beşeri sermayenin iktisadi büyüme üzerine etkisi: Türkiye örneği. *İstanbul Üniversitesi Siyasal Bilgiler Fakültesi Dergisi*, No: 30, s. 131-142.
6. Han, E., Kaya, A.A. (2008). *Kalkınma ekonomisi: teori ve politika*. Nobel Kitap Dağıtım.
7. Jones, C.I. (2001). *İktisadi büyümeye giriş*.
8. Karakayalı, H., Dilber, İ. (2010). *Kuramlarda büyüme ve kalkınma.* Emek Matbaacılık Yayıncılık.
9. Karataş, M., Çankaya, E. (2010). İktisadi kalkınma sürecinde beşeri sermayeye ilişkin bir inceleme. *Mehmet Akif Ersoy Üniversitesi Sosyal Bilimler Enstitüsü Dergisi*.
10. Kaya, A.A. (2004). *Uygun teknoloji seçimi ve kalkınma*.
11. Kaynak, M. (2007). *Kalkınma iktisadı.*
12. Kibritçioğlu, A. (1998). İktisadi büyümenin belirleyicileri ve yeni büyüme modellerinde beşeri sermayenin yeri. *Ankara Üniversitesi Siyasal Bilgiler Fakültesi Dergisi,* Cilt No: 53, Sayı No: 1-4, s.207-230.
13. Saygılı, Ş., Cihan, C. (2006). *Eğitim ve sürdürülebilir büyüme: Türkiye deneyimi riskler ve fırsatlar.* Tüsiad Büyüme Stratejileri Dizisi No: 7, Yayın No: Tüsiad-T/2006-06-420.
14. Taban, S., Kar, M. (2005). *İktisadi gelişmenin temel dinamikleri ve kaynakları*.

Daxil oldu: 23.03.2025
Qəbul edildi: 24.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/51-55

**Жахонгир Нематов**
Ташкентский Исламский Институт имени Имама Бухари
https://orcid.org/0009-0000-6909-0698
nematovjahongir@oliymahad.uz

# Современные исследования Мухаммад Джазари

**Резюме**

В настоящем исследовании основное внимание уделяется истории современных подходов к изучению трудов Мухаммад Джазари, в частности его «Аль-Мукаддима аль-Джазарийя», а также комментариев, написанных различными учеными на протяжении веков. Мухаммад Джазари является основателем одного из важнейших трудов в этой области и сыграл значительную роль в развитии науки таджвида. Современные исследования подчеркивают важность анализа фонетических, грамматических и теоретических аспектов таджвида, раскрывая их значение для правильного чтения и понимания Корана. Также обсуждается влияние этих исследований на распространение знаний в различных регионах, таких как Анатолия, Египет и Сирия, и ставится цель углубленного исторического аналитического исследования различных школ таджвида и их взаимодействия.

***Ключевые слова:*** *Мухаммад Джазари, Ал-Муқаддима, таджвид, комментарии, фонетика, грамматика, исламская наука, кораническое чтение*

**Jahongir Nemətov**
İmam Buxari adına Daşkənd İslam İnstitutu
https://orcid.org/0009-0000-6909-0698
nematovjahongir@oliymahad.uz

# Məhəmməd Cəzari yaradıcılığının müasir araşdırması

**Xülasə**

Bu araşdırma Məhəmməd Cəzarinin əsərlərinin, xüsusən də onun “Əl-Müqəddimə əl-Cəzariyyə” əsərinin tədqiqinə müasir yanaşmaların tarixinə, eləcə də müxtəlif alimlərin əsrlər boyu yazdığı şərhlərə diqqət yetirir. İbn Cəzəri bu sahədə ən mühüm əsərlərdən birinin banisidir və təcvid elminin inkişafında mühüm rol oynamışdır. Müasir tədqiqatlar təcvidin fonetik, qrammatik və nəzəri aspektlərinin təhlilinin vacibliyini vurğulayır, onların Quranın düzgün oxunması və başa düşülməsi üçün əhəmiyyətini üzə çıxarır. Bu tədqiqatların Anadolu, Misir və Suriya kimi müxtəlif bölgələrdə biliyin yayılmasına təsiri də müzakirə edilir və müxtəlif Təcvid məktəblərinin və onların qarşılıqlı təsirlərinin dərin tarixi analitik tədqiqinə yönəldilir.

***Açar sözlər:*** *Məhəmməd Cəzari, Əl-Müqəddimə, təcvid, təfsir, fonetika, qrammatika, İslam elmi, Quran tilavəti*

**Jahongir Nematov**
Tashkent Islamic Institute named after Imam Bukhari
https://orcid.org/0009-0000-6909-0698
nematovjahongir@oliymahad.uz

# Modern Studies on Muhammad Jazari's Creativity

**Abstract**

This study focuses on the history of modern approaches to the study Muhammad Jazari's works, particularly his “Al-Muqaddima al-Jazariya”, as well as the commentaries written by various scholars over the centuries. Ibn Jazari is the founder of one of the most important works in this field

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

and played a significant role in the development of tajwid science. Modern research emphasizes the importance of analyzing the phonetic, grammatical, and theoretical aspects of tajwid, revealing their significance for the proper reading and understanding of the Quran. The influence of these studies on the spread of knowledge in regions such as Anatolia, Egypt and Syria is also discussed, with the aim of conducting an in-depth historical analytical study of different schools of tajwid and their interactions.

***Keywords:*** *Muhammad Jazari, Al-Muqaddima, tajwid, commentaries, phonetics, grammar, Islamic science, Quranic recitation*

## Введение

Одна из самых известных работ имама аль-Джазария по науке таджвида - трактат «Аль-Мукаддима» - стала объектом более ста научных исследований. Это произведение занимает выдающееся место в области изучения и преподавания таджвида, так как представляет собой один из основных источников, в котором вся необходимая информация и дополнительные рекомендации по науке таджвида изложены читателю в упорядоченной и доступной форме. Именно поэтому данное сочинение было признано авторитетным трудом и стало предметом широкого изучения со стороны многих учёных.

Учёные по таджвиду начинали свои исследования, посвящённые трактату «Аль-Мукаддима», с утверждений о важности соблюдения правил таджвида, основываясь на предписаниях и указаниях из Корана и Сунны, акцентируя внимание на точности произношения слов Корана и создавая многочисленные работы в этой области. Несмотря на небольшой объём, трактат «Аль-Мукаддима» стал объектом научных исследований на протяжении различных исторических периодов. Анализируя примерно 30 комментариев и примечаний, можно прийти к выводу, что хотя к трактату «Аль-Мукаддима» было написано множество комментариев, точное количество этих комментариев остаётся неизвестным. В этой связи число комментариев, упоминаемых в источниках, варьируется. Безусловно, с течением времени появление новых комментариев и восстановление утерянных рукописей сыграло свою роль и привело к увеличению их числа.

**Исследование**

Трактат «Аль-Мукаддима» с давних времён был признан учеными и хадисоведами, и к нему на протяжении различных исторических периодов были написаны комментарии, примечания, толкования и переводы. Большая часть этих трудов была написана в Аравийском полуострове, Марокко, Египте, Шаме и Средней Азии. В последние годы важно отметить, что исследовательская активность в этой области переместилась в Турцию. Например, в 2021 году исследователь Абдуллатиф Четин в своей работе «Сравнительный анализ комментариев к произведению Мухаммад Джазари «Аль-Мукаддима аль-Джазария», сделанных в Анатолии» провёл глубокий анализ комментариев к трактату «Аль-Мукаддима» в Анатолии. В исследовании было рассмотрено 12 комментариев, из которых 10 являются рукописями, а 2 – печатными изданиями. В ходе анализа были изучены различия и сходства между комментариями, а также их вклад в науку таджвида, что позволило на основе результатов исследования выявить особенности и историю развития науки таджвида (Четин, 2021).

В 2022 году Абдуссамад Кёкер провёл исследование на тему «Комментарий Гонима Каддурий Хамада к аль-Мукаддима аль-Джазария». Одним из самых важных аспектов исследования А.Кёкера является то, что произведение представляет собой стихотворное произведение, которое в 107 стихах кратко и в поэтической форме излагает практически все основные темы науки таджвида. Это делает его удобным и системным источником для изучающих науку таджвида. Также в комментарии Гонима Каддурий Хамада «Аль-Мукаддима» подробно объясняется каждый стих, однако сложным научным обсуждениям уделяется меньше внимания (Кекер, 2022).

Исследование, проведённое Уммугульсум Байрактар Салтык на тему «Сравнение манзумных таджвидов Хокония, Сахавия и Ибн аль-Джазария», посвящено изучению одного из основных направлений науки таджвида — манзумных таджвидных произведений. В исследовании представлены сведения о определении, значении, цели и шариатном праве науки таджвида. Рассматривается происхождение традиции манзумного таджвида, её развитие, а также анализируются манзумные таджвидные произведения, выбранные для исследования. Эти произведения сравнены с точки зрения науки таджвида, и проведён анализ их научного уровня и методов, с выявлением различий и сходств между ними (Байрактар, 2022).

Ещё один исследователь, Мустафа Сари, в своей работе «Сравнительный анализ произведения Бадриддина Ахмада ат-Тийбий «Ал-Муфид фи тажвид» и «Аль-Мукаддима аль-Джазария»», провёл анализ краткой биографии Ахмада ат-Тийбий и Ибн аль-Джазария, их учителей и учеников, а также исследовал их работы, связанные с наукой таджвида, проводя сравнительный анализ этих произведений (Мустафа, 2022).

В 2023 году исследователь Сулаймон Деде в своей работе «Аль-Минах аль-Фикрийя фи шарх аль-Мукаддима аль-Джазария» провёл анализ произведения, в котором рассматриваются политическая и социальная обстановка времени жизни учёного, его биография и научная личность, его вклад в науку о чироате и его произведения. Исследователь стремится показать, что начиная с эпохи Имама Джазари было написано множество комментариев к его произведению, что свидетельствует о высоком интересе исследователей к его труду (Сулейман, 2023).

Исследование Али Ризо Кучукчетина «Сравнительный анализ произведений Абу Амра ад-Дони ат-Тахдид фи-Итконе ват-Таджвид» и Ибн аль-Джазария «Ат-Тамхид фи Илм таджвида» посвящено анализу двух важных произведений, являющихся основными источниками в науках о чироате и таджвиде. Несмотря на то, что эти произведения указаны как основные источники в книгах по чироату и таджвиду, научных исследований, непосредственно связанных с их сравнением, встречается немного. Исследование рассматривает, насколько связаны эти произведения, их общие темы и сходства в изложении, а также различия между ними и причины этих различий. В работе также рассматриваются вопросы влияния этих различий на практическое применение чироата и таджвида, а также анализируется стиль их написания, теоретический и практический подходы, методология в обработке тем (Кючюкчетин, 2023).

Египетский исследователь Хасан Насир в своей работе «Исследование и анализ произведения аль-Фавоид ас-Санхурийя фи Шарҳуль-Джазарийя» поясняет значения слов в тексте Джазари, раскрывая их цели и важность. В произведении он глубоко анализирует каждую тему манзумы, объясняя её значение в практическом применении. Исследователь стремится полностью объяснить теоретические и практические аспекты правил таджвида и подчеркивает высокую научную значимость таких классических произведений (Насир, 2023).

Исследователь Абдуллоҳ Гуллуже, действовавший как казы в таких регионах, как Мекка и Медина в османскую эпоху, изучил произведение Муҳаммада ибн Бадруддина аль-Мунશийа «Шарҳ Муқаддима Ибн аль-Джазарий», которое он написал, будучи активным ученым в различных областях. Гуллуже стремится оценить роль этого произведения в обучении Корану. Он сопоставляет этот классический комментарий с последующими произведениями в области науки о чироате и излагает свои взгляды (Гюллудже, 2023).

Одним из самых последних исследований, проведенных в 2024 году Хусейином Узтюрком, является исследование произведения «Аль-Хавоший аль-Азхарийя фи халли альфозиль-Муқаддиматиль-Джазарийя», которое было написано с целью простого и понятного комментария текста Джазари в прозе. В рамках исследования анализируются рукописные экземпляры этого произведения и оно изучается с применением сравнительно-аналитического подхода (Озтюрк, 2024).

Изучение текста Джазари до настоящего времени подтверждает его высокое положение среди ученых в области науки о тажвиде. Основной причиной популярности этого произведения является сам автор, то есть его заслуги не только в области чироата и тажвида, но также в хадисах, фикхе, балогате и других многих областях, где он был одним из передовых ученых своего времени, а его уровень знаний был величайшим. Второй причиной является то, что данное произведение собралось в себе все правила тажвидской науки в доступной форме и легко воспринимаемыми выражениями.

До написания и после написания упомянутых выше книг на произведение «Ал-Муқаддима" были написаны комментарии. Ученые, написавшие эти комментарии, добавили множество полезных аспектов, подробных объяснений и различных значений в строки стихов, что придает этим работам высокую ценность, которая сохраняется до сих пор. Эти комментаторы усердно трудились, чтобы донести заложенные автором значения до читателей, делая их доступными и понятными. Каждый комментатор стремился, чтобы его работа не повторяла произведения предшествующих комментаторов, а дополняла их, заполняя те места, которые были упущены в их трудах. Причиной этого было то, что они стремились восполнить пробелы, оставшиеся в работах их предшественников. Один из предыдущих комментаторов, Мухаммад Махмуд Хава, объясняет причину написания своего комментария к «ал-Муқаддима» следующим образом:

Некоторые комментаторы для того, чтобы материал был более понятен студентам, размещали текст на верхней части страницы, а комментарии — под ним. Однако при этом не уделяли должного внимания связи между текстом и комментариями. Некоторые комментарии были чрезмерно растянутыми, в них не использовался стиль, характерный для манзумных произведений, часто останавливали внимание на вопросах эъроба, а также возникали проблемы между текстом и комментарием. В некоторых комментариях были сделаны сокращения, которые иногда приносили больше вреда, чем пользы, в том числе по вопросам, требующим подробного разъяснения, например, таких как махраж и характеристики букв, что стало причиной написания новых комментариев.

## Заключение

В заключение можно сказать, что комментарии, написанные в разные исторические периоды и в разных местах, были направлены на расширение содержания «Ал-Муқаддима» и разъяснение его значимых аспектов. Примечания и пояснения были сосредоточены на объяснении конкретных моментов, таких как махраж букв, их характеристики и правильное применение правил таджвида. Эти комментарии, примечания и пояснения повысили значимость произведения и облегчали его изучение. Каждый исследователь уделял внимание определённым аспектам произведения, обогащая его содержание. Особенно в современных исследованиях глубоко анализируются фонетические, грамматические и семантические аспекты правил таджвида, а также их значение в чтении Корана.

Хотя произведение «Ал-Муқаддима ал-Джазария» было написано в Анатолии (территория современной Турции), первый комментарий к нему был написан в Эдирне, результаты исследования показывают, что большинство комментариев к «Ал-Муқаддима» были написаны в других регионах, за пределами Анатолии.

## Литература

1. Байрактар, У., (2022). *Сравнение поэтических трудов по таджвиду Хакани, Сахави и Ибн аль-Джазари*. Государственный университет Сиваса.
2. Гюллудже, А., (2023). *Исследование труда Мухаммада Бадруддина аль-Мунши «Шарх аль-Мукаддима Ибн аль-Джазари».* Университет Ялова.
3. Исматуллаев, А. (2020). *Источники по науке таджвида, созданные в Туркестане в конце XIX – начале XX вв*. Докторская диссертация PhD.

4. Кекер, А., (2022). *Введение Ибн аль-Джазари в труде Ганима Каддурия аль-Хамада «Шарх аль-Мукаддима аль-Джазари».* Университет Гази Осман Паша.
5. Кючюкчетин, А.Р. (2023). *Сравнительное изучение трудов Абу Амра ад-Дани «ат-Тахдид фи аль-Иткан ва ат-Таджвид» и Ибн аль-Джазари «ат-Тамхид фи ʻИльм ат-Таджвид».* Университет Караманоглу Мехметбея.
6. Мустафа, С., (2022). *Труд Бадруддина Ахмада ат-Тиби «аль-Муфид фи таджвид» и его сравнение с «аль-Мукаддима аль-Джазари».* Университет Мармара.
7. Насир, Х. (2023). *Исследование и критическое издание труда «аль-Фаваид ас-Санхурийя фи Шарх аль-Джазари».* Университет Ататюрка.
8. Озтюрк, Х. (2024). *Исследование труда Халида аль-Азхари «Аль-Хаваши аль-Азхарийя фи Халль аль-Алфаз аль-Мукаддима аль-Джазари».* Университет Кастамону, с. 8.
9. *Рукопись*. (n.d.). Рукопись под № K16, хранящаяся в библиотеке Честер Битти, Дублин.
10. *Рукопись*. (n.d.). Фотокопия рукописи под № 69, коллекция Лалали, хранящаяся в библиотеке Сулеймание, Турция.
11. Сулейман, Д., (2023). *Роль Муллы Али Кари в науке о чтении Корана и анализ труда «Аль-Минах аль-Фикрийя фи Шарх аль-Мукаддима аль-Джазари».* Университет Неджметтина Эрбакана.
12. Четин, А. (2021). *Сравнительный анализ комментариев, написанных в Анатолии к труду Ибн аль-Джазари «Мукаддима».*

Поступило: 10.03.2025
Принято: 21.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/56-61

**Nigar Bababəyli**
Naxçıvan Dövlət Universiteti
doktorant
https://orcid.org/0009-0004-7250-9671
nigarbababeyli@ndu.edu.az

# Naxçıvan Muxtar Respublikasında balneoloji əhəmiyyətli suların səciyyəsi

**Xülasə**

Bir çox tədqiqatçılar tərəfindən "mineral sular muzeyi" adlandırılan Naxçıvan Muxtar Respublikasında yerləşən çoxsaylı mineral bulaqlar həm turizim-rekreasiya, həm də müalicəvi cəhətdən çox mühüm əhəmiyyətə malikdir. Bu baxımdan məqalədə ərazinin mineral bulaqları haqqında məlumatlar toplamış, onların sutkalıq debiti, temperaturu, kimyəvi tərkibi, müalicə əhəmiyyəti haqqında məlumat verilmiş eyni zamanda, balneoloji turizm cəhətdən qiymətləndirilmişdir. Yer qabığında geniş yayılmış mineral xammallar bəşəriyyətin maddi mədəniyyətinin formalaşmasında və inkişafında mühüm rol oynamışdır. Ümumilikdə, maddi mədəniyyətin yüksəlişi yeni faydalı qazıntıların aşkarlanması ilə sıx bağlı olmuşdur. Xüsusilə inşaat materialları, neft, daş kömür, duz və su kimi qeyri-filiz faydalı qazıntılar insanların gündəlik həyatı və iqtisadi fəaliyyətləri üçün əhəmiyyətlidir. Bu ehtiyatlar arasında mineral sular da xüsusi yer tutur. Respublikamızın, xüsusilə də Naxçıvan Muxtar Respublikasının ərazisində mineral su ehtiyatları olduqca zəngindir.

***Açar sözlər:*** *mineral sular, balneoloji turizm, kimyəvi tərkib, debit, müalicəvi tərkib, bulaq*

**Nigar Bababayli**
Nakhchivan State University
PhD student
https://orcid.org/0009-0004-7250-9671
nigarbababeyli@ndu.edu.az

# Characteristics of Balneologically Significant Waters in the Autonomous Republic of Nakhchivan

**Abstract**

Numerous mineral springs of the Nakhchivan Autonomous Republic, called "museum of mineral waters" by many researchers have a great importance as a therapeutic and a tourist-recreational point of view. In this regard, the article contains information about the mineral springs of the area, given information about their daily flow rate, temperature, chemical composition, therapeutic value and simultaneously assessed with tourist-recreational point of view. Mineral raw materials, widely distributed in the earth's crust, have played an important role in the formation and development of the material culture of mankind. In general, the rise of material culture has been closely related to the discovery of new minerals. In particular, non-metallic minerals such as construction materials, oil, coal, salt and water are important for people's daily life and economic activities. Mineral waters also occupy a special place among these resources. Mineral water resources in our republic, especially in the territory of the Nakhchivan Autonomous Republic are very rich.

***Keywords:*** *mineral water, balneological tourism, chemical composition, debit, therapeutic composition, spring*


Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

## Giriş

Yer qabığında geniş yayılmış mineral xammallar bəşəriyyətin maddi mədəniyyətinin formalaşmasında və inkişafında mühüm rol oynamışdır. Ümumilikdə, maddi mədəniyyətin yüksəlişi yeni faydalı qazıntıların aşkarlanması ilə sıx bağlı olmuşdur. Xüsusilə inşaat materialları, neft, daş kömür, duz və su kimi qeyri-filiz faydalı qazıntılar insanların gündəlik həyatı və iqtisadi fəaliyyətləri üçün əhəmiyyətlidir. Bu ehtiyatlar arasında mineral sular da xüsusi yer tutur. Respublikamızın, xüsusilə də Naxçıvan Muxtar Respublikasının ərazisində mineral su ehtiyatları olduqca zəngindir.

Mineral sular tərkibində müxtəlif kimyəvi maddələr və qazlar olan, yerin dərin qatlarından təbii bulaqlar vasitəsilə səthə çıxan yeraltı sulardır. Bu sular yüksək miqdarda kimyəvi elementlərlə və onların birləşmələri ilə zəngin olmaqla yanaşı, bəzi hallarda radioaktiv xüsusiyyətlərə də malik olurlar. Yeraltı suların tətbiq sahələri çoxşaxəlidir: onlar balneoloji (sağlamlıq məqsədilə müalicəvi istifadə), enerji istehsalı və kimyəvi elementlərin əldə olunması kimi məqsədlər üçün istifadə olunur.

**Tədqiqat**

Naxçıvan Muxtar Respublikası balneoloji baxımdan xüsusi əhəmiyyətə malikdir. Buradakı mineral suların müxtəlifliyi və zənginliyi bu ərazini adeta “hidrokimyəvi muzeyə” çevirir. Ümumilikdə, Naxçıvanda 215 mineral bulaq mövcuddur ki, onlardan 212-si karbonlu, 3-ü isə kükürdlü-hidrogenli sular kateqoriyasına daxildir. Darıdağ, Badamlı, Sirab, Vayxır, Qızılvəng və Nəhəcir kimi məşhur bulaqlarla yanaşı, Biləv, Tivi, Nəsirvəz, Ələhi, Bist, Dəstə, Parağa, Kotam, Ləkətağ, Gülüstan, Biçənək, Sürməlik və Dərəşam kimi bulaqlar da bu zənginliyə daxildir.

Naxçıvan ərazisində yer alan mineral bulaqlar qədim zamanlardan bəri insanlar tərəfindən müalicə məqsədilə istifadə olunmuşdur. Hər bir bulaq, onun suyu və təsiri əsasında özünəməxsus adlarla tanınmışdır: “Qotur suyu” (Gömür), “Yel suyu” (Darıdağ, Vayxır), “Şor su” (Sirab) və s. Bu bulaqların əksəriyyəti sağlamlıq üçün əhəmiyyətli müalicəvi xüsusiyyətlərə malikdir. Ümumilikdə, Naxçıvan Muxtar Respublikasında 200-dən çox isti və soyuq sulu mineral bulaq mövcuddur.

Mineral suların yaranmasında regionun relyefi, iqlimi, geoloji strukturu və çay sistemləri mühüm rol oynayır. Bu sular müxtəlif geoloji qatlarda və fərqli yaşda olan çöküntü süxurlarından çıxır ki, bu da onların kimyəvi və balneoloji xüsusiyyətlərini müəyyən edir. Tarixi mənbələrə əsasən, bu bulaqlardan “dirilik suyu” kimi istifadə olunmuş və onların şəfalı gücünə inanılaraq “Tanrı ocağı” adlandırılmışdır (Babayev, 1999).

Mineral sular müalicə məqsədi ilə müəyyən proseduralar əsasında istifadə edilir. Mədə-bağırsaq, qaraciyər, öd kisəsi və digər daxili orqan xəstəliklərinin müalicəsində bu suların faydalı təsiri elmi şəkildə sübut olunmuşdur. Dünyada torpaq sahələrinin təxminən 60%-də belə bulaqlara rast gəlinmədiyi halda, Naxçıvan regionu nadir və bol mineral su ehtiyatlarına malikdir. Məsələn, Darıdağ mərgümüşlü suyu yüksək debiti ilə seçilir. Sirab suyu barjomi tiplidir. Nəhəcir suyu isə yesentuki tipinə aiddir. Qızılvəng suları isə botoliniski tiplidir. Bu müxtəlif növlü mineral sular təkcə sağlamlıq baxımından deyil, həm də kimya sənayesi və iqtisadi sahələr üçün də əhəmiyyətlidir. Onların səmərəli istifadəsi üçün dövlət səviyyəsində bir sıra tədbirlər həyata keçirilmişdir.

Mineral bulaqların və onların geoloji strukturlarının elmi araşdırmalarına Naxçıvanda ilk dəfə 1843-cü ildə başlanmış, lakin sistemli geoloji-kəşfiyyat işləri yalnız XX əsrdə aparılmışdır. Araşdırmalar nəticəsində məlum olmuşdur ki, bu bölgədə mineral sular altı əsas tipə, on altı sinfə və otuz üç müxtəlif növə bölünür. Onların 98%-i karbon qazı ilə zəngindir və hidrokarbonat tipinə aiddir (Babayev, 1999).

Kimyəvi tərkiblərinə görə bu sular aşağıdakı qruplara ayrılır:

- Acı və şor sular (Qızıl Vəng, Cuğa, Dərəşam, Dostu bulaqları);
- Şor və acı-şor sular (Darıdağ və Vayxır bulaqları);
- Karbon qazlı, əhəngli sular (Badamlı və Gömür bulaqları);
- Qələvi sular (Sirab və Nəhəcir bulaqları).

Yerin səthinə çıxdıqda bu sular müxtəlif formalı çöküntülər meydana gətirirlər. Həmin çöküntülər stalaktit, stalaqmit, kristal, tozvari və dənəvər formada olur. Aragonit, melantenit və travertin kimi minerallardan ibarət bu çöküntülər bəzən elə miqdarda toplanır ki, sənaye baxımından istifadə oluna biləcək səviyyəyə çatır. Məsələn, Babək rayonundakı Sirab kəndində əmələ gələn aragonitlər yüksək keyfiyyətli mərmər kimi qiymətləndirilir (Abbasov, Məmmədova, Heydərova, 2015).

Naxçıvan mineral su ehtiyatları baxımından dünyanın ən zəngin bölgələrindən biridir. Aparılan araşdırmalar göstərir ki, bu sular çay vadilərində, yerin dərin qatlarında, müxtəlif dövrlərə aid çöküntü süxurlarında baş verən tektonik proseslər nəticəsində formalaşmışdır. Bu baxımdan Şərqi Arpaçay, Naxçıvançay, Gilançay, Əlincəçay, Ordubadçay, Qurudərə və Əylis çay vadiləri əhəmiyyətlidir.

Şahbuz rayonu ərazisində, çay vadiləri boyunca 40 km²-lik sahədə 50-dən çox mineral su qaynağı aşkarlanmışdır. Bu bulaqlar arasında Badamlı, Gömür, Batabat və Karvansaray kimi məşhur mənbələr xüsusi əhəmiyyətə malikdir. Məlumata görə, bu sular şəffaf, rəngsiz və qoxusuz olmaqla yanaşı, dad baxımından da olduqca xoşdur. Tərkib baxımından əsasən karbon turşulu, hidrokarbonatlı, natriumlu, xloridli və kalsiumludur.

Bu rayonun ən tanınmış mənbələrindən biri olan Badamlı bulağı, müalicəvi xüsusiyyətləri ilə seçilir. Tədqiqatlar bu suyun qaraciyər və öd kisəsi xəstəliklərinə müsbət təsir etdiyini göstərmişdir. Ürək fəaliyyətinin bərpasında və tənzimlənməsində də əhəmiyyətli rol oynadığı müəyyən edilmişdir. Araşdırmalar göstərir ki, bu su damarların divarlarını qısa müddətlik genişləndirir, və daralma baş verir. Nəticədə, aşağı qan təzyiqi normallaşa bilir, yüksək təzyiq isə nisbətən azalır. Bu xüsusiyyət suyun qan dövranı sistemi üzərində tənzimləyici təsirini təsdiqləyir.

Badamlı suyu həmçinin, qaraciyər və öd kisəsinin iltihablı proseslərinin azalmasına təsir göstərərək ürək fəaliyyətinə də müsbət yön verir. Araşdırmalarda bu suyun orqanizmdə qan və digər toxumalarda dəyişikliklər yaratdığı aşkar edilmişdir (Əliquliyev, İsmayılova, 2002).

*Batabat bulağı*, Naxçıvan çayının yuxarı qolunda, 1700 metr yüksəklikdə yerləşir. Delüvial çöküntülərdə yerləşən bu mənbənin sutkalıq su verimliliyi 3600 litr təşkil edir.

*Biçənək bulağı*, yerli əhali tərəfindən "Qotursu" adlandırılır və Biçənək kəndi yaxınlığında yerləşir. Mehdi dərəsindəki digər mənbə ilə birlikdə bu bulaqların ümumi sutkalıq debiti 2160 litrdir.

*Gömür bulaqlar qrupu*, Gömür kəndindən 3 km aralıda yerləşir və travertin qatından çıxan yeddi bulaqdan ibarətdir. Əsas bulaq, Kömürçayının sol sahilində, kənddən 300 metr cənubda yerləşir. Bu su şor və qoxusuzdur, tərkibində karbon qazı yoxdur, dəmir hidrooksid çöküntülərinə görə qırmızı-qəhvəyi çalarlıdır. Bulağın debiti 43000 litr/sutkadır.

Ordubad rayonu da mineral su ehtiyatları ilə zəngindir. Təqribən 1000 km² sahədə 29 bulaq mövcuddur. Ərazidə yerləşən zəngin faydalı qazıntılar qızıl, gümüş, mis, molibden və volfram – bu suların mineral tərkibini də zənginləşdirmişdir. Bulaqlar arasında Ələhi, Bist, Dəstə, Nəsirvaz, Kotam, Tivi, Biləv, Kilit və Gənzə kimi mənbələr qeyd olunmalıdır. Bu suların əksəriyyəti zəif mineralizasiyaya və qazlılığa malikdir. Tərkibində Na+ və K+ ionları olan bu suların müalicəvi xüsusiyyətlərini onların qələvi komponentləri müəyyənləşdirir. Bəzi suların tərkibi məşhur "Narzan" suyu ilə oxşardır.

*Ələhi bulaqları*, Gilançayın mənbəyində, Ələhi kəndindən 500 metr cənub-qərbdə yerləşir. İki bulaqdan ibarət bu mənbənin suyu 18°C temperaturda olub, sutkalıq debiti 21600 litrdir.

*Biləv bulağı*, Uluçayın sol sahilində, Biləv kəndindən 45 km məsafədə yerləşir. Bu vadidə bir sıra kiçik bulaqlar da mövcuddur.

*Dəstə bulaqları,* Araz çayının sol sahilində, Dəstə kəndindən 1,5 km cənub-qərbdə yerləşir. İki bulaq və iki quyu burada qeyd olunur. Əsas bulağın temperaturu 19°C, sutkalıq debiti 5000 litrdir.

*Nəsirvaz bulaqları*, kənd ətrafında müxtəlif yüksəkliklərdə yerləşir. Birinci bulaq 2200 m hündürlükdə yerləşir, zəif $SO_2$ qazı ayrılır. Temperaturu 14.3°C, debiti 8640 litrdir. İkinci bulaq 2405 m hündürlükdə, Şirlançay çayının mənbəyində yerləşir, debiti 100000 litrdir. Üçüncü bulağın debiti 220000 litrdir, 2380 m yüksəklikdə yerləşir və burada qaz ayrılması daha güclüdür.

*Nüsnüs bulağı,* Nüsnüs kəndindən 600 metr qərbdə, Şamxal çayının başlanğıcında yerləşir. Su turşməzə dadlı, rəngsiz və qoxusuzdur. Temperaturu 12°C, debiti isə 86400 litrdir.

*Parağa bulağı,* mis-molibden-qızıl yataqlarının yaxınlığında yerləşir. Burada çıxan sular, silisium oksidi ilə zəngin qaya qatlarında formalaşır. Bu səbəbdən bulaqlarda sulfat ionları üstünlük təşkil edir və sular kalsium sulfatlı-hidrokarbonatlı qrupa aid edilir. İkinci Parağa bulağında isə karbon qazının ayrılması müşahidə olunur və bu bulaq kalsium-maqnezium karbonatlı sulara daxildir.

*Culfa rayonunun mineral suları və balneoloji resursları:* Culfa rayonu zəngin hidrogeoloji ehtiyatlara malik bölgələrdən biridir. Ərazidə ümumilikdə 900 km² sahədə 85-dən çox mineral bulaq qeydə alınmışdır. Bu bulaqlar əsasən karbonat-mərgümüş tərkibli olub, karbonatlı-mərgümüşlü, dəmirli-xlorlu-hidrokarbonatlı və natriumlu sulardan ibarətdir. Ümumilikdə, 37 mənbə mövcuddur ki, bunlardan 32-si qazılmış quyulardır. Bir çox mənbələr yüksək təzyiqli fontan şəklində səthə çıxır. Mineral bulaqların coğrafi yayılması belədir: Darıdağ - 37, Nəhəcir - 10, Ləkətağ - 5, Qazançı - 2, Başkənd - 2, Ağsal - 2, Nevi - 2, Dərəşam - 2, Teyvəz - 2, Xoşkeşin və Gülüstan hər biri 1 bulaqla təmsil olunur.

Bəzi sularda arsen və stibium elementləri ilə yanaşı, onların qrupu ilə assosiasiya edən bismut elementi də cüzi miqdarda aşkarlanmışdır. Bismutun aşkarlandığı əsas ərazilər Darıdağ və onun yaxınlığında yerləşən Kərimqulu-Dizə sahəsidir (Axundov, 1981).

*Darıdağ mineral suyu,* Darıdağ bulağı dünyada nadir fiziki-kimyəvi xüsusiyyətlərə malik mərgümüşlü mineral sular qrupuna daxildir. Su yüksək dərəcədə mineralizasiya olunmuş, karbon qazı və qələvi ilə zəngin, xlorlu-hidrokarbonatlı-natrium tərkiblidir. Mərgümüş ionlarının orqanizmə təsiri sayəsində Darıdağ suyu qanyaradıcı orqanların fəaliyyətində müsbət dəyişikliklərə səbəb olur. Araşdırmalara görə, bu suyun müalicəvi effekti yalnız istifadəsi zamanı deyil, istifadə dayandırıldıqdan sonra da davam edir. Osmotik davamlılığı artırmaqla, periferik qana daha davamlı eritrositlərin daxil olmasına şərait yaradır. Eyni zamanda, sinir sistemi, endokrin və retikulo-endotelial sistemlərə də müsbət təsir göstərir (Rzayev, 1983).

*Nəhəcir mineral suyu,* Naxçıvan şəhərindən 17 km məsafədə, Culfa rayonunun Nəhəcir kəndi yaxınlığında, 1700 metr yüksəklikdə yerləşən bu bulaq az minerallaşmış, hidrokarbonatlı-xlorlu-natrium tərkibli sulardandır. Kimyəvi xüsusiyyətlərinə görə "Yesentuki" tipinə yaxındır. Nəhəcir suyu süfrə suyu kimi istifadəyə yararlıdır və diş minası, sinir sistemi və digər əsəb xəstəlikləri üçün faydalıdır. Suda xlorla yanaşı brom və flüor da tapılmışdır ki, bu elementlər də onun terapevtik əhəmiyyətini artırır. Tərkibcə bənzər sulardan Teyvaz, Saldaş və Kafakömür bulaqları da qeyd olunmalıdır. Xüsusilə, Teyvaz bulaqları karbon qazı ilə zəngin olması ilə seçilir və biokimyəvi reaksiyalarda aktiv iştirak edir.

*Qazançı mineral suları,* Əlincə çayının Daşarası dərəsində, Qazançı kəndindən 2.5 km cənub-şərqdə yerləşən iki bulaq maqmatik süxurların kontakt zonalarından süzülərək yer səthinə çıxır. Bu sularda dəmirin miqdarı olduqca yüksəkdir. Birinci bulaqda 31 mq/l, ikinci bulaqda isə 33 mq/l səviyyəsindədir. Bu səbəbdən də Qazançı mineral suyu qan azlığı kimi hematoloji problemlərin müalicəsində effektiv vasitə kimi tövsiyə olunur. Suyun tərkibində karbon qazının olması da onun müalicəvi təsirini artırır.

*Ləkətağ mineral suları,* Ərəfsə kəndinin şimal-şərq hissəsində, Ləkətağ çayının sol sahilində yerləşən bu bulaq zəif minerallaşmış, hidrokarbonatlı-kalsiumlu-maqneziumlu tərkibə malikdir. Debiti gündəlik 54.000 litr, temperaturu isə 13.5 °C təşkil edir. Qayaların aşınması nəticəsində yer səthinə çıxan bu bulaq Ca və Mg ionlarının birləşməsi və hidrokarbonat tərkibi baxımından terapevtik əhəmiyyət daşıyır. Su həm içmək, həm də balneoloji məqsədlər üçün yararlıdır.

*Nevi və Ağsal mineral suları,* Əlincə çayının yuxarı hövzəsində, Nevi dərəsinin yamacında yerləşən iki bulaq aliqoritli gilli süxurların arasından çıxaraq səthə çatır. Suyun axını boyunca dəmir hidroksidlərinin çökməsi və travertin təbəqələrinin mövcudluğu bu mənbələrin qədim geoloji mənşəyini sübut edir. Su soyuq və turş dadlıdır, balneoloji baxımdan önəmlidir.

Ağsal bulaqları Ərəfsə kəndi yaxınlığında, 1980 metr yüksəklikdə yerləşir. Təxminən 20 kv.m sahədə 13 bulaq mövcuddur ki, bunlardan ikisi əsas bulaqlar hesab edilir. Temperatur 13.5–14.5 °C

arasında dəyişir, debiti isə sutkada 18.400–25.000 litr təşkil edir. Sular şəffaf, dadsız olub, zəif mineralizasiyaya malikdir və bəzi hallarda süxur səthində rəng dəyişmələrinə səbəb olur.

Babək rayonu, təxminən 1200 kvadrat kilometr ərazini əhatə edən sahəsində 50-yə yaxın müalicəvi mineral su qaynağı müəyyən edilib. Bu mənbələrin 27-si qazılmış buruq quyuları vasitəsilə aşkarlanmışdır. Ən çox bulaq Sirab (23), Vayxır (9), Qızılvəng (8), Qahab (4), Kalbəağıl (3), həmçinin Quyuludağ, Cəhri və Əshabi-Kəhf bölgələrində qeydə alınmışdır. Bunlar arasında müalicəvi xüsusiyyətlərinə görə Sirab, Qahab, Vayxır, Qızılvəng və Cəhri suları xüsusi əhəmiyyət daşıyır.

## Nəticə

Sirab mineral suyu qədim zamanlardan müalicə məqsədi ilə istifadə olunur. Xüsusilə, mədə-bağırsaq sistemi və maddələr mübadiləsi pozğunluqlarının aradan qaldırılmasında faydalı təsiri məlumdur. Bu səbəbdən xalq arasında "Sirli su" adlandırılan Sirab suyu, təkcə yerli əhalinin deyil, uzaqdan gələn insanların da müalicəsində istifadə olunmuşdur. Kimyəvi tərkibinə görə karbonlu, hidrokarbonatlı, xloridli, natriumlu və kalsiumlu olan bu su, Barjomi tipinə aid edilir. 1966-cı ildə aparılmış qiymətləndirməyə əsasən Sirab bulağının gündəlik ehtiyatı 1053 kubmetr təşkil edir.

*Kalbəağıl bulağı,* Sirab qrupuna aid olub, Sirabdan 2 km şərqdə yerləşir. Buradakı əsas bulağın günlük su çıxışı 56,000 litrdir. Əhəngağıl bulağı isə Əhəngağıl dərəsinin cənub-şərqində yerləşir və burada 265 metr dərinliyə qədər qazılmış quyudan 50,000 litr su əldə olunur.

*Küleymar bulağı*, Küleymar kəndinin yaxınlığında, süxurlar arasında təbii olaraq axıb çıxır. Tektonik qırılma zonasında yerləşən bu bulağın temperaturu 18°C, suyu isə turşməzəli və acıtəhərdir. Bütün bulaqların birgə sutkalıq su ehtiyatı 120,000 litr təşkil edir.

*Əshabi-Kəhf* bulaqları isə xüsusilə fərqlidir. Bu bulaqlar karbon qazlı, hidrokarbonatlı, natrium-kalsiumlu tərkibə malikdir və tərkibində yod, brom, litium, radon və digər mikroelementlər vardır. Əshabi-Kəhf suyu xüsusilə radonun yüksək miqdarı ilə fərqlənir və Rusiyanın Pyatiqorsk radonlu suyuna bənzər müalicəvi keyfiyyətlərə malikdir. Radonlu sular əsasən sinir sistemi və ürək-damar xəstəliklərinin müalicəsində istifadə olunur.

*Qahab bulaqları*, Babək rayonunun eyni adlı kəndindən 6 km cənub-şərqdə yerləşir. Bu ərazidə qazılmış quyulardan 120 metr dərinlikdə 22°C temperaturda və 1.2 milyon litr/gün debiti olan təzyiqli mineral sular çıxır. Bu sularda balneoloji xüsusiyyətlərin müxtəlifliyi müşahidə olunur.

Şərur rayonu isə mineral bulaqlar baxımından daha az zəngindir. 1316 kv.km ərazidə cəmi 7 bulaq (Şahtaxtı, Danyeri, Dəhnə, Başnoraşen, Quşçu və s.) aşkar edilib. Bu suların tərkibi zəif minerallaşmış, hidrokarbonatlı-kalsiumlu olmaqla yanaşı, bəzi hallarda maqnezium, sulfat və qazlılıqla zəngin olur. Xüsusilə Şərur bulağında qaz qabarcıqları müşahidə edilir ki, bu da suyun təbii qazlı olması ilə əlaqədardır. Bu sular yel xəstəliklərinin müalicəsində uğurla istifadə edilir.

Aparılan təxmini hesablamalara görə, Naxçıvan Muxtar Respublikasında yerləşən mineral bulaqların gündəlik ümumi su ehtiyatı 30 milyon litr civarındadır. Bu suların tərkibindəki duzların illik miqdarı isə tonlarla ölçülür. Bu potensial, bölgədə quru mineral duz istehsal edən zavodların yaradılması üçün ciddi iqtisadi əsas verir.

Naxçıvan Mineral sular muzeyi kimi tanınır və bu ad özünü tam doğruldur. Regionun zəngin rekreasiya resursları, sağlamlığa faydalı müalicəvi suları və təmiz təbiəti onun turizm inkişafı üçün böyük potensialını göstərir. Mineral sular yalnız çıxdıqları ərazilərdə deyil, uzaq bölgələrdə də öz müalicəvi xüsusiyyətlərini qoruyur.

Bu zəngin təbii sərvətlərin daha effektiv və məqsədyönlü şəkildə istifadəsi üçün son dövrlərdə müvafiq təşkilatlar tərəfindən tədbirlər görülməkdədir. Eyni zamanda Qahab, Cuğa, Dəstə, Kilit, Kotam, Dərəşam, Ərəfsə, Ləkətağ və Karvansara kimi bulaqlarda kliniki müşahidələrin aparılması və onların tibbi əhəmiyyətinin araşdırılması vacibdir.

Gələcəkdə bu suların rasionallaşdırılmış istismarı, sanatoriyaların, istirahət komplekslərinin yaradılması və genişmiqyaslı balneoloji turizmin inkişafı regionun sosial-iqtisadi inkişafına əhəmiyyətli töhfə verə bilər.

## Ədəbiyyat

1. Axundov, Ə. (1981). *Naxçıvan MSSR-ın mineral suları və onların müalicəvi əhəmiyyəti.*
2. Abbasov, Ə., Məmmədova, F., Heydərova, F. (2015). *Təbii suların geokimyası və Naxçıvan MR-də yayılma xüsusiyyətləri*.
3. Axundov, Ə.B. (1981). *Naxçıvan MSSR-nın mineral suları və onların müalicəvi əhəmiyyəti*.
4. Babayev, S.Y. (1999). *Naxçıvan Muxtar Respublikasının fiziki coğrafiyası.*
5. Babaev, A.M. (2000). *Mnnepal"nye vody ropno-ckladchatax oblactei Azepbaidzhana.*
6. Bağırov, F. (2008). *Naxçıvanın təbii sərvətləri.*
7. Əliquliyev, R., İsmayılova, M. (2002). *Naxçıvan MR-ın mineral suları.*
8. Əliquliyev, R., İsmayilova, M. (2003). *Sirab.*
9. Əliquliyev, R.İ., İsmayılova, M.M., Əliquliyev, A.R. (2002). *Naxçıvan Muxtar Respublikasının mineral suları.*
10. Məmmədova, F. (2004). *Naxçıvan MR -in su mənbələrinin kimyəvi tərkibi. Naxçıvanın tarixi, maddi və mənəvi mədəniyyətinin öyrənilməsi.*
11. *Naxçıvan Muxtar Respublikasının təbii sərvətləri və onlardan istifadə yolları*. (2001).
12. Rzayev, B. (1983). *Arsen və Darıdağ termal suyu.*
13. Zaxapov, B. F. (1931). *Gidrogeologiya Zpivanskoi Hizmennosti.*

Daxil oldu: 19.03.2025
Qəbul edildi: 23.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/62-66

**Kəmalə Ağayeva**
Bakı Dövlət Universiteti
doktorant
https://orcid.org/0009-0002-6018-1264
kamala.aghayeva.sardar@bsu.edu.az

# Diqqət əskikliyi və hiperaktivlik pozuntusu olan uşaqlarda diqqətin tənziminin pozulması

## Xülasə

Diqqət əskikliyi və hiperaktivlik pozuntusu (DƏHP) yaşa uyğun olmayan diqqətsizlik, hiperaktivlik və impulsivlik ilə xarakterizə olunan mürəkkəb neyroinkişaf pozuntusudur. Əsasən, uşaqlarda diaqnoz qoyulsa da, simptomlar çox vaxt yetkinlik dövrünə qədər və böyüklərdə də davam edir. DƏHP olan uşaqlarda diqqət, tapşırıqların təşkil edilməsində, impulsivliyi idarə etməkdə və emosiyalara nəzarət etməkdə çətinliklər olur ki, bu da evdə, məktəbdə və sosial mühitdə funksional pozuntulara səbəb olur. Dünyada uşaqlar arasında yayılma göstəriciləri 5–10% arasında dəyişir. Azərbaycanda isə dəqiq statistik məlumatlar məhdud olsa da, bu diaqnoz qoyulan uşaqların sayı artmaqdadır. DƏHP-in yaranmasında genetik amillər mühüm rol oynayır və irsiyyətin rolu 70–80% civarındadır. Dopamin və serotonin sistemlərinə təsir edən genetik faktorlarla yanaşı, prenatal toksinlər, ana psixopatologiyası və doğuşla bağlı risklər də mühüm ətraf mühit amilləridir. DƏHP zamanı diqqət əskikliyindən daha çox onun tənzimlənməsi pozulur. Hiperfokus- uşağın maraqlandığı fəaliyyətə həddindən artıq diqqət yönəltməsi bu pozuntunun vacib cəhətlərindəndir və bu da dopaminin tənziminin pozulması ilə əlaqələndirilir. DƏHP-in erkən diaqnozu, simptomların müxtəlifliyinin nəzərə alınması və fərdi müdaxilələr uşağın həyat keyfiyyətini əhəmiyyətli dərəcədə yaxşılaşdıra bilər.

***Açar sözlər:*** *diqqət, hiperfokus, hiperaktivlik, impulsivlik, tormozlanma*

**Kamala Aghayeva**
Baku State University
PhD student
https://orcid.org/0009-0002-6018-1264
kamala.aghayeva.sardar@bsu.edu.az

# Violation of Attention Regulation in Children with Attention Deficit and Hyperactivity Disorder

## Abstract

Attention Deficit Hyperactivity Disorder (ADHD) is a complex neurodevelopmental disorder characterized by age-inappropriate inattention, hyperactivity and impulsivity. Although it is primarily diagnosed in children, symptoms often persist into adolescence and adulthood. Children with ADHD experience difficulties with attention, task organization, impulse control, and emotional regulation, which lead to functional impairments at home, in school and in social settings. Globally, the prevalence of ADHD in children ranges between 5–10%; although precise statistics for Azerbaijan are limited, the number of children diagnosed with ADHD appears to be increasing. Genetic factors play a major role in the development of ADHD, with heritability estimated at around 70–80%. In addition to genetic influences on dopaminergic and serotonergic systems,

 Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

environmental risk factors such as prenatal exposure to toxins, maternal psychopathology and birth-related complications are also significant. In ADHD, the core issue is not a complete lack of attention, but rather a disruption in attention regulation. Hyperfocus—the intense concentration on activities of personal interest—is one of the key features of this condition and is linked to dysregulation in dopamine systems. Early diagnosis, recognition of symptom heterogeneity, and individualized interventions can significantly improve the child's quality of life.

***Keywords:*** *attention, hyperfocus, hyperactivity, impulsivity, inhibition*

## Giriş

Diqqət əskikliyi və hiperaktivlik pozuntusu (DƏHP) əsasən uşaqlarda aşkar olunan, böyüklərdə də davam edən neyroinkişaf pozuntusudur və yaşa uyğun olmayan səviyyədə davamlı diqqətsizlik, hiperaktivlik və impulsivlik simptomları ilə xarakterizə olunur (American Psychiatric Assosiation, 2013). DƏHP olan usaqlar çox vaxt diqqətini saxlamaqda çətinlik yaşayır, xarici stimullar asanlıqla onların diqqətini yayındır və tapşırıq edən zaman tam diqqətlərini verə bilmirlər. Onlar dərs zamanı dinləməkdə, mürəkkəb təlimatlara qulaq asıb yadda saxlamaqda və həm sinifdə, həm də evdə, yaxud oyun zamanı diqqəti saxlamaqda çətinlik çəkirlər. Təşkilati çətinliklər, tez-tez şəxsi əşyaların itirilməsi və tapşırıqların idarə olunması problemləri ilə özünü göstərir. Hiperaktiv uşaqlar daim hərəkətli olur, sakit oturmaq tələb olunan yerlərdə belə sakit qala bilmirlər. İmpulsivlik isə kiminsə sözünü kəsmək, söhbətə yersiz müdaxilə etmək, səbirsizlik, növbə gözləməkdə çətinlik, fikirləşmədən danışmaq, yaxud hərəkət etmək, sualı sona qədər dinləmədən tələsik cavab vermək kimi əlamətlərlə özünü göstərir. Bu simptomlar müxtəlif mühitlərdə davam edir və evdə, məktəbdə və sosial həyatda funksional pozuntular yaradır. Valideynin mütəxəssisə müraciət etməsinə və diaqnozun qoyulmasına çox vaxt simptomların özü yox, zəif akademik göstəricilər, davranış pozuntuları və s. nəticələr səbəb olur.

DƏHP bütün dünya üzrə yayılma dərəcəsi uşaqlar arasında təxminən 5–10%, böyüklər arasında isə 3–5% kimi göstərilir (Scahill, 2000; Song, 2021). Azərbaycana dair dəqiq statistik məlumatlar məhdud olsa da 2021-ci ildə 100,000 nəfərdən 1,320-də DƏHP olduğu qeyd edilmişdir. DƏHP böyüklərdə də davam edə bilər. Uşaqların 55–66%-i yetkinlik yaşlarında da simptomları saxlayır, yaxud simptomlar özünü başqa cür göstərir. Təxminən uşaqlar arasında 5% DƏHP diaqnozu qoymaq üçün meyarlara tam uyğun olmasa da, diqqət və davranış problemləri yaşayır (Sayal, 2018). Simptomların hansı yaşda başlaması haqda məlumatlar da fərqlidir. Avropa ölkələri arasında simptomların 2.5–7.5 yaş arasında başladığı göstərilir, lakin xüsusən də yanaşı gedən xəstəliklər olduqda diaqnoz daha gec qoyula bilir (Rocco, 2021). Uşaqlar məktəbə ilk başladığı yaşlarda DƏHP diaqnozunun qoyulması daha çox artır. Bu dövrdə uşaqların akademik və sosial öhdəlikləri daha artır və diqqətsizlik, hiperaktivlik və impulsivliklə bağlı problemlər daha açıq görünür. Kiçik uşaqlarda diaqnoz qoymaq çətindir, çünki erkən dövrlərdə olan simptomlar yaşla əlaqədar olan normal davranışlarla səhv salına bilər. Son dövrlərdə DƏHP diaqnozunda artım müşahidə edilir. Bu da əhali arasında DƏHP haqqında maariflənmənin artması, DSM-5 meyarlarının daha əhatəli olması (simptomların ilkin başlanğıc yaşının 7-dən 12-yə uzadılması) və akademik öhdəliklərin yüksəlməsi ilə əlaqələndirilir (American Psychiatric Assosiation, 2013). Müxtəlif mədəniyyətlərdə və hətta ailələrdə DƏHP simptomlarına müxtəlif baxışların mövcud olması da diaqnoza təsir edir. Məsələn, uşaqlarda normal halda da olan çox hərəkətli olması bəzi valideynlər tərəfindən hiperaktivlik kimi qəbul olunması və sair kimi səbəblərdən də bəzi hallarda çox diaqnoz qoyulması riski mövcuddur. Yayılma DƏHP formalarına görə də dəyişir diqqətsizliyin üstünlüyü ilə gedən forma daha çox yayılmışdır, bundan sonra hiperaktiv-impulsiv və kombinə edilmiş formalar gəlir. Oğlanlar arasında bu diaqnoz daha çoxdur (~13%), qızlarda isə (~6%) daha azdır. Bu da ondan irəli gəlir ki, qızlar arasında daha çox diqqət əskikliyinin üstünlüyü ilə gedən forma olur, bu isə

valideynləri narahat edən problemlərə səbəb olmadığı üçün mütəxəssisə müraciət olunmur (Bitsko, 2022).

DƏHP əmələ gəlməsində genetik amillərin rolu çoxdur. Ailələr himayəyə götürülmüş uşaqlar və əkizlər üzərində aparılmış tədqiqatlar göstərir ki, DƏHP zamanı irsilik 70–80%-dir (Faraone, 2019). Lakin tək bir gen DƏHP əmələ gəlməsində məsul deyil. Bu, poligen pozuntudur və dopaminergik və serotoninergik neyrotransmitter sistemlərinə təsir edən çoxlu genetik variantları əhatə edir (Yadav, 2021). DNA metilləşməsi kimi epigenetik mexanizmlər genin ifadə olunmasını tənzimləyə bilər və genetikanı ətraf mühit təsirləri ilə bağlayır (da Silva, 2023). Ətraf mühit risk faktorları arasında prenatal dövrdə toksinlərin təsiri, ananın siqaret və spirtli içki istifadəsi, doğuş zamanı çəkinin az olması, erkən doğuş və uşağın həyatının erkən dövrlərində beyin zədələnməsi kimi amillər göstərmək olar (Dong, 2018; MacDonald, 2024). Valideynlərdə olan psixi xəstəliklər, xüsusən ananın depressiyası və maddə istifadəsi, övladlarda DƏHP riskini artırır və bu təsirlər qız uşaqlarında daha çox özünü göstərir (Joelsson, 2017). Prenatal dövrdə anada piylənmə, hipertoniya xəstəliyi olan anaların övladlarında da DƏHP riski daha çoxdur (Kim, 2020). Bu genetik və ətraf mühit faktorlarının qarşılıqlı təsiri DƏHP-in etiologiyasının mürəkkəb olduğunu göstərir.

**Tədqiqat**

Uşaqlarda DƏHP yaşa uyğun olmayan səviyyədə diqqətsizlik, hiperaktivlik və impulsivlik ilə xarakterizə olunur və gündəlik funksionallığa ciddi təsir göstərir (American Psychiatric Assosiation, 2013). Bu pozuntu heterogen xarakter daşıyır və simptomlar fərdlər arasında yaş, cins, ətraf mühit və yanaşı gedən hallar əsasında geniş fərqlənir. Uşaqlar böyüdükcə hiperaktivlik azalsa da, diqqət problemləri, impulsivliyə nəzarət, təşkilatçılıq və vaxtın idarə olunmasında çətinliklər davam edir.

Diqqət problemləri zamanı uşaqlar uzun müddət ərzində diqqəti cəmləməkdə, dərsi, yaxud söhbətləri izləməkdə, çoxaddımlı təlimatları xatırlamaqda, kənar müdaxiləni tormozlamaqda çətinlik çəkirlər. Bu problemlər çox vaxt səhvən zehni qüsur kimi qəbul edilsə də, əksər hallarda qavrama deyil, operativ yaddaşın zəifliyindən qaynaqlanır. Bu uşaqlar çox vaxt tapşırıqları başlayıb tamamlamır, şəxsi əşyalarını itirir və vaxtın idarə olunmasında çətinlik çəkirlər.

Hiperaktivlik kontekstdən və yaşdan asılı olaraq dəyişir. Belə uşaqlar çox vaxt bir yerdə sakit otura bilmir, çox hərəkətli olur, həddindən artıq çox danışırlar. Bu davranışlar adətən yaşla azalır, amma impulsivlik başqalarının sözünü kəsmək, növbə gözləməkdə çətinlik və riskli davranışlarda iştirak kimi özünü göstərir və sosial münasibətlərdə və təhlükəsizliklə bağlı problemlərə səbəb olur.

DƏHP zamanı vacib xüsusiyyətlərindən biri diqqət problemlərinin olmasıdır. Lakin burada diqqət əskikliyindən daha çox diqqətin idarə edilməsində çətinliyin olmasıdır. DƏHP olan uşaqlarda çox vaxt hiperfokus müşahidə olunur, yəni onlar üçün maraqlı olan, daxili motivasiyadan irəli gələn fəaliyyətlər üzərində uzun müddət və intensiv diqqəti cəmləyə, vaxtın necə keçdiyini hiss etmədən saatlarla istədikləri bir məşğuliyyət üzərində fokuslana bilirlər. Başqaları digər tapşırıqla məşğul olmağa başlasalar da bu cür uşaqlar özlərinin xoşuna gələn fəaliyyətdən ayrıla bilmirlər. Bu tapşırıqlar dərhal məmnunluq və psixoloji mükafat təqdim edir, bu da diqqətin davamlılığını gücləndirir (Flippin, 2025).

Hiperfokus fərqli bir diqqət fenomenidir. Bu zaman tapşırıq fərd üçün cəlbedici olmalıdır, diqqət intensiv şəkildə həmin tapşırığa yönəlir, hazırda onun üçün əhəmiyyətsiz olan stimullar diqqəti cəlb etmir, qavranılmır sanki və performans yaxşılaşır (Ashinoff, 2021). Diqqətin tənzimində olan bu pozulma icraedici funksiyaların defisiti ilə yaxından bağlıdır. Ümumi diqqət problemləri, həm də hiperfokus ADHD simptomlarının nə dərəcədə kəskin olması və icraedici funksiyalarda olan defisitlə əlaqəlidir. Hiperfokusun nə üçün baş verdiyini və mexanizmini başa düşmək onun güclü tərəflərindən istifadə etməyə, eyni zamanda mənfi təsirlərini azaltmağa kömək edə bilər (Garcia Pimenta, 2024). Əslində hiperfokus özü zərərli olmaya bilər, amma nəzarətsiz qalarsa, gündəlik fəaliyyətdə problemlərə səbəb ola bilər. Detallara fikir vermək, işə həddindən artıq diqqəti cəmləşdirib onun üzərində işləmək müvəffəqiyyətə gətirə bilər, ancaq bu zaman lazımi nəzarət olmadıqda digər lazım olan, xoşuna gəlməyən işlərdə laqeydliyə gətirib çıxara bilər. Dəstək

və nəzarət olmadıqda, bu cür uşaqlar onlara maraqlı olan, daha stimullaşdırıcı fəaliyyətlərə üstünlük verirlər, lakin onlara maraqlı olmayan, əslində isə vacib olan digər tapşırıqlardan qaçırlar. Bunu uşaqlar məqsədyönlü şəkildə etmirlər, bu davranışın neyrobioloji əsasları var. DƏHP olan uşaqlarda diqqət problemlərini, onaların mexanizm və səbəblərini anlamaq, uşaqlara da bunu izah etmək, müxtəlif fəaliyyətlər üçün vaxt məhdudiyyətləri qoymaq və akademik tapşırıqların cəlbediciliyini yenilik, interaktivlik və ya mükafat yolu ilə artırmaq bu cür problemlər zamanı faydalı ola bilər. Bu zaman uşaqlar tapşırıqlara daha məsuliyyətlə yanaşmaq, vaxtı daha yaxşı idarə etməyi öyrənə bilərlər.

Tədqiqatlar göstərir ki, diqqətin yayınması və hiperfokus problemləri beyində dopamin səviyyəsinin azalması ilə bağlı ola bilər. Bu neyrotransmitter çatışmazlığı motivasiyanı zəiflədir və uşaqların az stimullaşdırıcı, lakin vacib fəaliyyətlərə keçməsini çətinləşdirir. Hiperfokus hiperaktivlikdən daha çox diqqətsizlik simptomları ilə əlaqəlidir, yəni daha çox diqqət əskikliyinin üstünlüyü ilə gedən formada rast gəlinir. Bu da onu göstərir ki, hiperfokus DƏHP diaqnostikasında klinik cəhətdən əhəmiyyətli cəhət kimi nəzərə alınmalıdır (Ishi, 2023).

MacDonald və digərləri öz tədqiqatalrında DƏHP zamanı hiperfokusun dopamin çatışmazlığı deyil, dopaminin tənziminin pozulması nəticəsində olduğunu göstərir. Müəlliflər göstərir ki, hiperfokus və diqqət əskikliyi bir-birinə zidd xüsusiyyətlər deyil (MacDonald, 2024).

## Nəticə

Nəticə olaraq qeyd edə bilərik ki, DƏHP mürəkkəb, heterogen neyroinkişaf pozuntusudur. Adında diqqət əskikliyi qeyd olunsa da, əslində DƏHP zamanı diqqətdə əskiklik deyil, diqqətə nəzarətin pozulması olur. Bu da dopaminin tənziminin pozulması nəticəsində meydana çıxır. DƏHP diaqnozunun erkən qoyulması, uşağın hərtərəfli dəyərləndirilməsi, fərdi müdaxilə nəticələrin daha uzunmüddətli olması və uşağın həyat keyfiyyətinin yaxşılaşdırılması üçün vacibdir.

## Ədəbiyyat

1. American Psychiatric Association. (2013). *Diagnostic and Statistical Manual of Mental Disorders.*
2. Ashinoff, B.K., Abu-Akel, A. (2021). Hyperfocus: the forgotten frontier of attention. *Psychological Research*, 85(1), pp.1-19.
3. Bitsko, R. H., Claussen A.H., Lichstein, J. (2022). Mental health surveillance among children. *MMWR Suppl*, 71(Suppl-2), pp.1-42.
4. Da Silva, B.S., Grevet, E.H., Silva, L. (2023). An overview on neurobiology and therapeutics of attention-deficithyperactivity disorder. *Discover Mental Health*.
5. Dong, T., Hu, W., Zhou, X. (2018). Prenatal exposure to maternal smoking during pregnancy and attention-deficithyperactivity disorder in offspring: A meta-analysis. *Reproductive Toxicology*. №76, pp.63-70.
6. Faraone, S.V., Larsson, H. (2019). Genetics of attention deficit hyperactivity disorder. *Molecular Psychiatry*, 24(4), pp.562-575.
7. Flippin, R. (2025). Hyperfocus and the ADHD brain: Intense fixation with ADD. *ADDitude*.
8. Garcia Pimenta, M., Gruhnert, R.K., Fuermaier, A.B.M., Groen, Y. (2024). The role of executive functions in mediating the relationship between adult ADHD symptoms and hyperfocus in university students. *Research in Developmental Disabilities*. №144.
9. Ishii, S., Takagi, S., Kobayashi, N. (2023). Hyperfocus symptom and internet addiction in individuals with attention-deficit hyperactivity disorder trait. *Frontiers in Psychiatry*. №14.
10. Joelsson, P., Chudal, R., Uotila, J. (2017). Parental psychopathology and offspring attention-deficit hyperactivity disorder in a nationwide sample. *Journal of Psychiatric Research*, №94, pp. 124-130.

11. Kim, J.H., Kim, J.Y., Lee, J. (2020) Environmental risk factors, protective factors, and peripheral biomarkers for ADHD: an umbrella review. *The Lancet Psychiatry*, 7(11), pp. 955–970.
12. MacDonald, H. J., Kleppe, R. Szigetvari, P. D., Haavik, J. (2024). The dopamine hypothesis for ADHD: An evaluation of evidence accumulated from human studies and animal models. *Frontiers in Psychiatry*, №15.
13. Rocco, I., Corso, B., Bonati, M. (2021). Time of onset and/or diagnosis of ADHD in European children: a systematic review. *BMC Psychiatry*, 21(1).
14. Sayal, K., Prasad, V., Daley, D. (2018). ADHD in children and young people: prevalence, care pathways, and service provision. *Lancet Psychiatry*, №5, pp.175–186.
15. Scahill, L. (2000). Epidemiology of ADHD in school-age children. *Child and Adolescent Psychiatric Clinics of North America*, 9, pp.541–555.
16. Song, P., Zha, M., Yang, Q. (2021). The prevalence of adult attention-deficit hyperactivity disorder: A global systematic review and meta-analysis. *Journal of Global Health*.
17. Yadav, S.K., Bhat, A. A., Hashem, S. (2021). Genetic variations influence brain changes in patients with attention-deficit hyperactivity disorder. *Translational Psychiatry*, 11(1).

Daxil oldu: 19.03.2025
Qəbul edildi: 20.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/67-70

**Mehman Şabanov**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0002-3510-7847
mehmansabanov@ndu.edu.az.

# Ermənilərin Azərbaycana qarşı ərazi iddiaları və Heydər Əliyevin Azərbaycanın ərazi bütövlüyünün qorunması istiqamətində fəaliyyəti

### Xülasə

1920-ci ildə ermənilər Azərbaycanın Zəngəzur bölgəsinə nəzarəti ələ keçirdikən sonra 1921-ci ildə Dağlıq Qarabağın da Ermənistana birləşdirilməsi üçün cəhdlər göstərmişlər. Nəriman Nərimanovun prinsipial və qəti mövqeyi bu niyyətin həyata keçməsinin qarşısını almışdır. 1922-ci ilin sonlarında N.Nərimanovun Moskvaya köçürülməsindən sonra, 1923-cü ilin iyul ayında Dağlıq Qarabağa muxtar vilayət statusunun verilməsinə nail olunmuşdur. Bununla bağlı erməni tərəfi Qarabağ üzərində iddialarından əl çəkməmiş, müxtəlif dövrlərdə bu məsələni yenidən gündəmə gətirməyə davam etmişdir. Nəriman Nərimanovun prinsipial mövqeyi və ardıcıl fəaliyyəti nəticəsində Rusiya Kommunist (bolşevik) Partiyası Qafqaz Bürosunun 1921-ci il 5 iyul tarixli iclasında xüsusi qərar qəbul edilmişdir. Həmin qərarda bölgədə yaşayan müsəlmanlar və ermənilər arasında milli barışın təmin olunması, Yuxarı və Aşağı Qarabağ arasında mövcud iqtisadi bağların qorunması, eləcə də Qarabağın Azərbaycanla tarixi və coğrafi əlaqələrinin vacibliyi əsas götürülərək, Dağlıq Qarabağın Azərbaycan SSR-in tərkibində saxlanılması məqsədəuyğun sayılmışdır.

***Açar sözlər**: Heydər Əliyev, Qarabağ, partiya, katib, büro*

**Mehman Shabanov**
Nakhchivan State University
https://orcid.org/0009-0002-3510-7847
mehmansabanov@ndu.edu.az.

# Armenians' Territorial Claims Against Azerbaijan and Heydar Aliyev's Activities in Protecting the Territorial Integrity of Azerbaijan

### Abstract

In 1920, when the armenians seized control of the Zangazur region of Azerbaijan, they made attempts to annex Nagorno-Karabakh to Armenia in 1921. Nariman Narimanov prevented the realization of this intention. However, after N. Narimanov was transferred to Moscow at the end of 1922, in July 1923, Nagorno-Karabakh was granted the status of an autonomous region. In this regard, the Armenian side did not give up its claims on Garabagh and continued to raise this issue again at various times. As a result of Nariman Narimanov's principled position and consistent activity, a special decision was adopted at the meeting of the Caucasus Bureau of the Russian Communist (Bolshevik) Party on July 5, 1921. In that decision, it was considered expedient to maintain Nagorno-Karabakh within the Azerbaijan SSR, taking into account the need to ensure national peace between Muslims and Armenians living in the region, to preserve the existing economic ties between Upper and Lower Garabagh, as well as the importance of Garabagh's historical and geographical ties with Azerbaijan.

***Keywords:** Heydar Aliyev, Garabagh, party, secretary, bureau*

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

## Giriş

Zaqafqaziya Mərkəzi İcraiyyə Komitəsinin Rəyasət Heyətinin müxtəlif iclaslarında Azərbaycan və Ermənistan SSR-ləri arasında inzibati-sərhəd bölgüsünə dair bir sıra qərarlar qəbul edilmişdir. Bu qərarların nəticəsində Mehri və Cəbrayıl qəzalarının 24 kəndi, eləcə də Zəngəzur və Kürdüstan qəzalarına daxil olan 1.065 desyatin torpaq sahəsi Ermənistanın inzibati idarəçiliyinə verilmişdir. Daha sonra keçirilən başqa bir toplantıda, qurumun sədri M.Sxakayanın rəhbərliyi və Azərbaycan nümayəndələri – M.Bağırov, D.Bünyadzadə və digərlərinin iştirakı ilə aparılan müzakirələr zamanı "Mehridə rayonlaşdırma" adı altında Qazax rayonuna məxsus 50 kvadrat kilometrlik ərazi ilə yanaşı, Cəbrayıl qəzasının Nüvədi, Elnəzir və Tüğud kəndlərinin də Ermənistana verilməsi qərara alınmışdır. Bu inzibati dəyişikliklər nəticəsində Naxçıvanla Azərbaycanın əsas ərazisi arasında fiziki bağlantının kəsilməsinə səbəb olan coğrafi ayrıseçkilik başqa sözlə, "dəhliz boşluğu" formalaşmışdır.

Tarixi sənədlər və Azərbaycan tədqiqatçılarının son dövrlərdə apardığı araşdırmalar göstərir ki, Dağlıq Qarabağ Muxtar Vilayətinin Ermənistana birləşdirməsi ilə bağlı cəhdlər onun yaradıldığı dövrdən etibarən fasiləsiz şəkildə gündəmdə olmuşdur. Bu istiqamətdə ilk ciddi və sistemli təşəbbüs isə II Dünya müharibəsindən dərhal sonra reallaşdırılmağa çalışılmışdır (Məmmədov, 2010). Tarixçi E.İsmayılov verdiyi məlumata görə, həmin dövrdə Azərbaycan KPMK katibi vəzifəsində çalışan Mirhəsən Seyidovun xatirələrinə əsasən, 1945-ci ilin payızında M. Bağırov ÜK(b)P MK-nın qəbul otağında Anastas Mikoyan və Lavrenti Beriya ilə qarşılaşır. Onlar bildirirlər ki, Cənubi Azərbaycan məsələsi artıq həll olunub və tezliklə Azərbaycanın ərazisi genişlənəcək. Bu zaman M.Bağırov da söhbət zamanı qeyd edir ki, Dağlıq Qarabağın Ermənistana, respublikanın şimal-qərb bölgələrinin isə Gürcüstana verilməsi məsələsinə etiraz etməyə bilər. Mitinqlərdə bəzi radikal erməni qruplarının Türkiyə və Azərbaycan əleyhinə əsassız ərazi iddiaları ilə çıxış etdiklərinin şahidi olmuşdu. Bu kimi separatçı çağırışlar Heydər Əliyevin diqqətindən yayınmamışdı və o, sonrakı rəhbərlik illərində bu cür millətçi təşəbbüslərin qarşısını sistemli şəkildə almağa çalışmışdı (Əliyev, 2007, s.249). O, xalqlar arasında qarşıdurma yaratmağa çalışan erməni millətçi dairələrinin fəaliyyətinə qətiyyən yol vermir, onların bu istiqamətdəki niyyətlərinə qarşı sərt tədbirlər həyata keçirirdi. Nəticə etibarilə, 1970-ci illərdə erməni millətçiliyinin fəaliyyəti ciddi şəkildə zəiflədilmiş və bu ideoloji istiqamət böhranla üzləşmişdi. Qanun pozuntusuna yol verən millətçi qruplar hüquqi müstəvidə sərt şəkildə cəzalandırılırdı. Məsələn, Azərbaycan SSR DTK-nın beşinci şöbəsi 1973-cü ilin avqust ayında "erməni millətçiləri" adlı əməliyyat işi çərçivəsində daşnaküstü partiyası ilə əlaqəsi olan şəxslərə qarşı tədbirlər həyata keçirmiş və onların bir çoxu həbs edilmişdi (Mahmudov, 2011).

**Tədqiqat**

1967-ci ildə ilk dəfə Azərbaycan Dövlət Təhlükəsizliyi Komitəsinin sədri vəzifəsinə azərbaycanlının təyin edilməsi, böyük tarixi hadisə idi. Düz 47 il yad əllərdə, yad millətlərin nəzarəti altında olan Azərbaycan DTK-nə Heydər Əliyevin sədr təyin edilməsi gözlənilməz olsa da, xalq tərəfindən böyük sevinclə, qürur hissi ilə qarşılandı. Heydər Əliyevin bu yüksək vəzifəyə təyin edilməsi xalqın özünə inamını artırdı. DTK əməkdaşı, bu orqanın sədr müavini və sədri vəzifələrində işləyərkən Heydər Əliyevin başlıca fəaliyyət istiqamətlərindən biri ölkə daxilində və xaricdə daşnaklara, erməni millətçilərinə qarşı amansız mübarizə aparmaq idi. Heydər Əliyevin hakimiyyətə gəlişindən sonra onun siyasi fəaliyyətində Azərbaycanın ərazi bütövlüyünə yönəlmiş təhdidlərin qarşısının alınması, xüsusilə də bəzi erməni dairələrinin iddialarının neytrallaşdırılması prioritet istiqamətlərdən birinə çevrilir. Sovet dövrünün əvvəlki mərhələlərində olduğu kimi, Heydər Əliyevin siyasi rəhbərliyə qayıdışı zamanı da erməni tərəfi Dağlıq Qarabağ üzərindəki şəksiz iddialarında əl çəkməmiş, əksinə bu iddiaları daha da genişləndirmək üçün müxtəlif vasitələrə əl atmağa çalışmışdır. Lakin H.Əliyevin qətiyyətli mövqeyi ilə bu niyyətlərinin reallaşmasına imkan verməmiş, regionda, xüsusilə Ermənistanla Azərbaycan arasında, eləcə də Dağlıq Qarabağda yaşayan azərbaycanlılar və ermənilər arasında münasibətlərin sabit və dinc əsaslar üzərində qurulması üçün səylər göstərmişdir.

Azərbaycan SSR ilə Ermənistan SSR arasında Zaqafqaziya MİK tərəfindən təsdiq edilmiş sərhədin göstərilən respublikaların Paritet komissiyası tərəfindən 1:25.000 miqyaslı topoqrafik xəritələrin vərəqələrinə keçirilmiş və Azərbaycan SSR Nazirlər Soveti tərəfindən təqdim olunmuş qrafik təsviri bəyənilsin. 2. Azərbaycan SSR Nazirlər Sovetinə tapşırılsın ki, respublika sərhədi təsvirinin müvafiq sahələrdə Ermənistan SSR nümayəndələri ilə birlikdə naturaya keçirilməsini 1969-cu il noyabrın 1-dək təmin etsin" (Mahmudov, 2002). 13 may 1969 cü il tarixində Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinin bürosunda "Azərbaycan SSR ilə Ermənistan SSR arasındakı sərhəddin qrafik təsvirinin təsdiq edilməsi haqqında" layihə bəyənildi. Lakin bu qərar qəbul ediləndən bir müddət sonra, respublikanın düşdüyü bu ağır vəziyyətində Azərbaycan rəhbərliyində mühüm dəyişiklik oldu (Mehdiyev, 2001). 1969-cu il iyulun 14-də Heydər Əlirza oğlu Əliyevin Azərbaycan KP MK-nın Birinci katibi vəzifəsinə seçilməsi həm bu bədnam, antiazərbaycan qərarın yerinə yetirilməsinə imkan vermədi, həm də ermənilərin Azərbaycandan yeni-yeni torpaq iddialarına birdəfəlik son qoydu. Bununla da Sovet Azərbaycanının tarixində böyük dönüş dövrü başlandı. Tarixi inkişafın sonrakı gedişi sübut etdi ki, bugünkü müstəqil Azərbaycanı Heydər Əliyev hələ o zaman qurmağa başlamışdı ("Respublika" qəzeti, 1998).

Heydər Əliyev çıxışlarının birində vurğulayırdı ki, 1968-ci ildə respublika rəhbərliyində olan şəxslər Ermənistan rəhbərləri ilə dəfələrlə torpaq məsələləri ilə bağlı görüşlər keçirmiş hətta, bu məsələlər üzrə protokol da imzalanmışdı. Həmin protokola əsasən, Ermənistan tərəfi Naxçıvanın Sədərək rayonu istiqamətində yerləşən bəzi ərazilərə, Ordubadın Mehri ilə sərhəd hissəsində yerləşən torpaqlara, eləcə də Gədəbəydəki Tağlar kəndinə, Qazax, Qubadlı və Laçın rayonlarının bəzi hissələrinə iddialar irəli sürürdü (Mahmudov, 2011). Təəssüf ki, o dövrün Azərbaycan rəhbərliyi bu iddialara müəyyən razılıq nümayiş etdirmişdi. Heydər Əliyev həmin hadisələri xatırlayaraq bildirirdi ki, bu məsələlər ona yeni rəhbər təyin edildiyi vaxt təqdim edilmişdi. Moskvadan isə bu protokolun tezliklə icrası ilə bağlı ciddi təzyiqlər göstərilirdi. O qeyd edirdi: "Dedim, bu qərar may ayında qəbul olunubsa və iyula qədər icra edilməyibsə, mənə imkan verin, məsələni araşdırım. Araşdırmadan sonra məlum oldu ki, bu razılaşmanı icra etmək olmaz və mən də buna razılıq vermədim. Mən Azərbaycanda işlədiyim dövrdə həmin qərar reallaşmadı". Beləliklə, 1969-cu il mayın 7-də qəbul edilmiş həmin sənəd faktiki olaraq qüvvəyə minmədi və 1984-cü ilə qədər bu məsələ Ermənistan tərəfindən bir daha gündəmə gətirilmədi. Heydər Əliyevin möhkəm iradəsi və siyasi qətiyyəti erməni dairələrində də dərin təsir yaratmışdı. Elə buna görə də Qorbaçovun "yenidənqurma" siyasəti başlayanda erməni millətçi dairələri və daşnak təfəkkürlü ideoloqlar Heydər Əliyevə qarşı təxribat xarakterli fəaliyyətlərini daha da fəallaşdırdılar.

Heydər Əliyevin hakimiyyəti illərində Dağlıq Qarabağda yaşayan ermənilər Azərbaycan torpaqlarına gəlmə olduqlarını başa düşmüşdülər. Nəinki başa düşmüşdülər, hətta diyara köçürülmələrinin 150 illiyi münasibəti ilə abidə də qoymuşdular. Bütün bunların sayəsində çoxlu erməni Dağlıq Qarabağı özünə doğma torpaq hesab etməyərək köçüb gedirdi. Heydər Əliyev SSRİ rəhbərliyində çalışmaq üçün Moskvaya yola düşərkən Azərbaycan rəhbərliyinə Dağlıq Qarabağ məsələsinə diqqətli yanaşmağı və Ermənistanla münasibətlərə xüsusi həssaslıq göstərməyi tövsiyə etmişdi. Lakin bu tövsiyələrin nəzərə alınmaması nəticəsində erməni dairələri yenidən Azərbaycana qarşı hərəkətə keçdilər (Qasımlı, 2006). 1983-cü ildən etibarən Ermənistanın Azərbaycana münasibəti gərginləşməyə başladı və ardıcıl ərazi iddiaları gündəmə gətirildi. Respublikada rəhbərliyin zəifliyi isə bu iddiaların daha da genişlənməsinə şərait yaradırdı. Həmin ildə Qazax rayonunun Kəmərli kəndində yerləşən 1675 hektarlıq meşə sahəsinin istifadəsi ilə bağlı yaranan mübahisə iki respublika arasında açıq münaqişəyə səbəb oldu. Ermənistan tərəfi bu əraziyə nəzarəti ələ keçirməyə çalışırdı. Kənd sakinləri məsələ ilə bağlı Sov. İKP MK-ya da müraciət etmişdilər. 1984-cü ilin oktyabrında məsələni araşdırmaq üçün Azərbaycan SSR-dən o cümlədən, Nazirlər Soveti sədrinin müavininin də daxil olduğu nümayəndə heyəti Qazaxa göndərildi, lakin 24 oktyabrda yerli əhali onları qəbul etməyərək, fiziki təzyiqlə bölgədən uzaqlaşdırdı. Bu etirazın siyasi nəticəsi olmadı. 12 noyabr 1984-cü il tarixində Azərbaycan KP MK Bürosunda məsələ müzakirəyə çıxarıldı və on maddədən ibarət qərar qəbul edildi. Nəticədə, rayon rəhbərliyində çalışan bir neçə şəxs vəzifədən və partiya sıralarından çıxarıldı, bəziləri inzibati tədbirlərlə

cəzalandırıldı. Bu hadisə faktiki olaraq respublika rəhbərliyinin iradəsizliyini üzə çıxarırdı. 1980-ci illərin ortalarından etibarən erməni tərəfi fəaliyyətini daha sistemli şəkildə genişləndirməyə başladı. Əvvəlcə, Ermənistanın millətçiyönümlü ziyalıları – yazıçılar, alimlər, jurnalistlər və şairlər Azərbaycan və Türkiyə əleyhinə təbliğat xarakterli nəşrlərlə çıxış etdilər. Antiazərbaycan mövqelər ictimai rəyə sirayət edirdi. Ermənipərəst mövqeyi ilə seçilən M.S.Qorbaçovun SSRİ rəhbərliyinə gəlməsi ilə erməni dairələrinin fəallığı daha da artdı. Qorbaçovun bu dairələri açıq şəkildə dəstəkləməsi və onların təzyiqləri altında qərarlar verməsi bu prosesləri sürətləndirdi. Lakin Heydər Əliyev SSRİ rəhbərliyində olduğu müddətdə bu iddiaların gerçəkləşməsi mümkün olmurdu. Bu səbəbdən, zamanla o, rəhbərlikdən uzaqlaşdırılmağa başlanıldı. Qorbaçov onun siyasi nüfuzunu və idarəetmə bacarığını təhlükə kimi görür, rəhbərliyə potensial alternativ hesab etdiyi üçün ona qarşı mənfi münasibət bəsləyirdi. 1987-ci ilin oktyabrında Heydər Əliyevin yüksək dövlət vəzifəsindən uzaqlaşdırılması isə erməni separatçılarının planlarının həyata keçirilməsinə ümidlərini daha da artırdı.

1987-ci ilin oktyabrında Yerevanın Puşkin meydanında "Qarabağ" komitəsinin ilk açıq mitinqi keçirildi. Azərbaycanın Sovetlər Birliyinin tərkibində olduğu yetmiş illik dövrünü öyrənərkən qətiyyətlə bu nəticəyə gəlmək mümkündür ki, Azərbaycana rəhbərlik etmiş əksər şəxslər ermənilərin ərazi iddialarına qarşı çıxa bilməmiş, bunun da nəticəsində torpaqlarımızın bir hissəsi ermənilər tərəfdən zəbt edilmişdi. Heydər Əliyev Azərbaycana rəhbərlik etmiş bütün şəxslərdən fərqli olaraq, onun rəhbərliyi dövründə bir qarış da torpağımız ermənilərə verilməmişdir.

## Nəticə

Göründüyü kimi, XX əsrin 60-80-ci illərində ermənilər Azərbaycan ərazilərinə qarşı iddialar irəli sürmüş, buna nail olmaq üçün SSRİ rəhbərliyi səviyyəsində fəaliyyət göstərmişlər. Lakin onların bu istəklərini Heydər Əliyev alt-üst etmiş, ərazi bütövlüyümüzün pozulmasına imkan verməmişdi. Heydər Əliyevdən əvvəlki rəhbərlər Azərbaycanın bəzi ərazilərini Ermənistana güzəştə getsələr də o, siyasi hakimiyyətə qayıtdıqdan sonra əvvəllər qəbul olunmuş, lakin milli maraqlara zidd olan qərarların icrasını dayandırdı. Onun rəhbərlik etdiyi dövrdə Ermənistan tərəfinə heç bir ərazi güzəştə getmədi və Azərbaycanın ərazi bütövlüyü prinsipial şəkildə qorundu.

## Ədəbiyyat

1. *"Azərbaycan" qəzeti*. (2008).
2. Aliev, I. (). *Nagornyi Karabakh. Istoriya, fakty, sobytiya.*
3. ARDA. (1925).
4. Əliyev, H. (2007). *Müstəqilliyimiz əbədidir*. 22-ci kitab.
5. Ismaiylov, E. (). *Vlast i narod. Posle voennyi stalinizm v Azerbaidzhane (1945-1953).*
6. *K istorii obrazovaniya Nagorno-Karabakhskoi avtonomnoi oblasti Azerbaidzhanskoi SSR.* (1989).
7. Qasımlı. (2006). *Heydər Əliyev - istiqlala gedən yol (1969-1987-ci illər).*
8. Mahmudov, Y. (2011). *Heydər Əliyev ideyalarının zəfər yürüşü*.
9. Mahmudov, Y. (2002). *Azərbaycan tarixində Heydər Əliyev şəxsiyyəti.*
10. Mehdiyev, R. (2001). *Azərbaycan Respublikası 1991-2001.*
11. Məmmədov, M. (2010). *Azərbaycan-Türkiyə əlaqələrində Naxçıvanın yeri*.
12. *"Respublika"* qəzeti. (1998).

Daxil oldu: 01.03.2025
Qəbul edildi: 16.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/71-76

**Sədaqət Əhmədova**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0001-3329-4055
sedaqet.ahmedova@bk.ru
**Məhsəti Əsgərova**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0001-1899-3325
mahsati554@gmail.com

# Gənclik və iqtisadiyyat: yeni nəsil sahibkarlarının rolu

## Xülasə

Müasir dünyada gənclik, iqtisadi inkişafın təkanverici qüvvəsi olaraq əhəmiyyətini daha da artırır. Gənclər yalnız gələcəyin iş qüvvəsi olmaqla kifayətlənməyib, həm də sahibkarlıq, innovasiya və sosial təşəbbüslər sahələrində önəmli rola malikdirlər və onlar yeni biznes modelləri, texnoloji yeniliklər və sosial təşəbbüslərlə iqtisadiyyatda əsas dəyişikliklərə səbəb olurlar. Bu məqalədə gənclərin iqtisadiyyatdakı rolu və yeni nəsil sahibkarlarının iqtisadi inkişafa necə təkan verdikləri təhlil olunacaqdır.

Göstərilir ki, modern mərhələnin sürətlə dəyişən iqtisadi gerçəkliklər müstəvisində gənclər cəmiyyətin olduqca strateji ehtiyatlarını təşkil etmişdir. Onların enerjisi, kreativliyi, avadanlıqlara açıq yanaşması və çevikliyi dövlətin iqtisadi tərəqqisində zəruri rola malik olur. Gənclər iqtisadiyyatın fərqli istiqamətlərində əmək bazarından başlamış, sahibkarlığa, yenilikçiliyə qədər fəal təmsil olunmağa təkcə öz perspektivlərini yox, ümumilikdə, ölkənin sosial-iqtisadi tərəqqi xəttini də təsbit edirlər.

Gənclərin ölkə iqtisadiyyatında mövqeyi çoxistiqamətlidir. Onlar işçi heyətinin yenilənməsi, modern avadanlıqların reallaşmış olması, rəqəmsal iqtisadiyyatın tərəqqisi və modern sahibkarlıq mexanizmlərinin icra olunması əsasında əvəzolunmazdır. Gənclərin müxtəlif yanaşma tərzi və riskə meyilli baxışı onları yenilikçi və startap istiqamətində daha çevik və müvəffəqiyyətli edir. Əsasən, avadanlıq və məlumat əsrində gənclər olduqca fəal qaydada beynəlxalq bazarlara inteqrasiya və rəqəmsal platformalar üzərindən qlobal iqtisadi münasibətlər yarada bilirlər.

***Açar sözlər:*** *gənclik, iqtisadiyyat, sahibkarlıq, innovasiya, iqtisadi inkişaf*

**Sadaqat Ahmadova**
Nakhchivan State University
https://orcid.org/0009-0001-3329-4055
sedaqet.ahmedova@bk.ru
**Mahsati Asgarova**
Nakhchivan State University
https://orcid.org/0009-0001-1899-3325
mahsati554@gmail.com

# Youth and the Economy: the Role of the New Generation of Entrepreneurs

## Abstract

In the modern world, youth is increasingly becoming a driving force for economic development. Young people are not only the workforce of the future, but also have an important role in the fields of entrepreneurship, innovation and social initiatives and they are causing major changes in the economy with new business models, technological innovations and social initiatives. This article

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

will analyze the role of young people in the economy and how the new generation of entrepreneurs is driving economic development.

It is shown that against the backdrop of the rapidly changing economic realities of the modern era, young people have become the most strategic resource of society. Their energy, creativity, openness to technologies and flexibility play an important role in the country's economic development. By actively participating in various sectors of the economy - from the labor market to entrepreneurship and innovations - young people determine not only their own future, but also the trajectory of socio-economic development of the country as a whole.

The role of young people in the economy is multifaceted. They are indispensable in terms of renewing the workforce, applying new technologies, developing the digital economy and implementing modern entrepreneurial models. The different mindset and risk-taking approach of the younger generation make them more active and successful in the field of innovation and startups. Especially in the age of technology and information, young people can more flexibly connect to global markets and establish international economic relations through digital platforms.

***Keywords:*** *youth, economy, entrepreneurship, innovation, economic development*

## Giriş

İqtisadiyyat daim dəyişir, yenilənir və zamanın tələblərinə uyğun inkişaf edir. Bu dəyişimin mərkəzində isə gənclər dayanır. Rəqəmsal dövrün gətirdiyi imkanlar və texnologiyadakı sürətli inqilablar sayəsində gənclər iqtisadiyyata yeni nəfəs, yeni istiqamətlər gətirirlər. Onların rolu artıq sadəcə işçi qüvvəsi olmaqdan çıxıb – onlar eyni zamanda yeni biznes sahələri yaradır, əmək bazarını yenidən şəkilləndirir və iqtisadiyyatın sosial, hətta ekoloji yönünü dəyişməyə başlayırlar.

Sahibkarlıq gənclər üçün təkcə gəlir mənbəyi deyil. Bu, onların öz ideyalarını gerçəkləşdirdikləri, yaradıcılıqlarını ortaya qoyduqları və innovasiyalara yönəldikləri bir yol kimi çıxış edir. Yeni nəsil biznes modelləri ilə gənclər bazarlara fərqli yanaşmalar gətirir. Məsələn, startap mədəniyyəti – çeviklik, yaradıcılıq və sosial məsuliyyət anlayışlarının birləşdiyi bir sahədir və bu, məhz gənclərin enerjisi və baxış bucağı ilə formalaşır. Rəqəmsal texnologiyalar və yeni nəsil alətlər onlara bizneslərini daha səmərəli idarə etmək, qlobal bazarlara çıxmaq və iqtisadiyyatın müxtəlif sahələrində dəyişiklik yaratmaq imkanı verir.

Gənclərin önəm verdiyi sahələrdən biri də sosial sahibkarlıqdır. Onlar yalnız qazanc üçün deyil, cəmiyyətə fayda vermək, sosial problemlərə həll tapmaq məqsədilə də fəaliyyət göstərirlər. Bu yanaşma daha ədalətli, davamlı və inklüziv bir iqtisadiyyatın formalaşmasına xidmət edir (Məmmədov, 2021).

Eyni zamanda, gənclərin təşəbbüsü ilə formalaşan rəqəmsal iqtisadiyyat, paylaşım iqtisadiyyatı və davamlı iqtisadiyyat kimi yeni modellər həm şəhər, həm də qlobal miqyasda iqtisadi inkişafı sürətləndirir. Paylaşım iqtisadiyyatı buna əla nümunədir resursların daha səmərəli istifadəsinə yönəlik bu model Airbnb, Uber kimi platformaların ortaya çıxmasına səbəb olub. Bu platformalar, gənclərin yaratdığı çevik və adaptiv yanaşmalarla, mövcud iqtisadi sistemin daha dayanıqlı və effektiv olmasına imkan verir.

**Tədqiqat**

Bu günün yeni nəsil sahibkarları artıq klassik iş modeli ilə kifayətlənmirlər. Onlar fəaliyyətlərinə daha çox texnologiya və sosial məsuliyyət baxımından yanaşırlar. Bu gənc sahibkarlar yalnız gəlir qazanmaqla kifayətlənmir eyni zamanda,cəmiyyətə fayda vermək, sosial problemlərə həll tapmaq və daha bərabər iqtisadi imkanlar yaratmaq üçün çalışırlar. Onların innovasiyayönümlü təşəbbüsləri təkcə iş yerləri yaratmır, həm də ənənəvi iqtisadi strukturları dəyişdirərək daha dinamik və ədalətli bir iqtisadi sistemin qurulmasına zəmin yaradır.

Texnologiyanın sürətli inkişafı ilə gənclər rəqəmsal sahibkarlıq sahəsində ön sıralarda yer alırlar. Artıq bir ideyanı həyata keçirmək üçün böyük bir ofisə və ya fiziki məkana ehtiyac yoxdur. İnternetin və smartfon texnologiyalarının həyatımızın ayrılmaz hissəsinə çevrildiyi bu dövrdə, gənclər dünyanın istənilən nöqtəsindən öz işlərini idarə edə bilir və qlobal bazarda rəqabət apara bilirlər. Fintex, biotexnologiya, süni intellekt kimi sahələrdə çalışan bu gənc sahibkarlar, yalnız öz

bizneslərini inkişaf etdirmir, eyni zamanda iqtisadiyyata çeviklik, səmərəlilik və davamlılıq gətirirlər.

Süni intellekt və rəqəmsallaşma bu yeni nəsil sahibkarların ən güclü silahlarındandır. Onlar bu texnologiyalardan istifadə edərək iş gücünün məhsuldarlığını artırır, rəqəmsal iş mühitləri qurur və bununla da yeni iş imkanları yaradırlar (Əliyev, 2020).

Azərbaycan Respublikasında da bu dinamika özünü göstərir. Mikro, kiçik və orta sahibkarlıq subyektləri ölkə iqtisadiyyatında mühüm rol oynayır. Bu bizneslər təkcə iqtisadiyyatı canlandırmır eyni zamanda, işsizliyin azaldılması, regionların inkişafı və vergi bazasının genişlənməsi baxımından da əhəmiyyətli töhfələr verirlər. Onların innovasiya və rəqabət qabiliyyətinin artırılması isə ölkənin iqtisadi müxtəlifliyinin təmin olunması və uzunmüddətli dayanıqlı inkişafı üçün əsas şərtlərdən biridir.

Mikro, kiçik və orta sahibkarlıq subyektlərinin əsas makroiqtisadi gostəriciləri.

**Cədvəl 1**. 2023-ci il üzrə məlumatlar

| Göstəricilər, *Indicators* | 2022 | | | | 2023 | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | Cəmi *Total* | o cümlədən *of which* | | | Cəmi *Total* | o cümlədən *of which* | | |
| | | Mikro *Micro* | Kiçik *Small* | Orta *Medium* | | Mikro *Micro* | Kiçik *Small* | Orta *Medium* |
| Yaradılmış əlavə dəyər*, milyon manat *Value added*, million manat* | *17.170,4* | 7.091,9 | 2.796,1 | 7.282,4 | *20.087,1* | 7.653,2 | 3.200,8 | 9.233,1 |
| İşçilərin sayı, min nəfər *Number of employees, thsd. person* | *370,1* | 42,4 | 104,8 | 222,9 | *390,8* | 49,9 | 110,3 | 230,6 |
| Orta aylıq nominal əməkhaqqı, manat *Average monthly nominal wages, manat* | *707,9* | 450,8 | 575,6 | 843,0 | *765,8* | 501,5 | 642,8 | 899,4 |
| Əsas kapitala investisiyalar, milyon manat *Investments directed to fixed capital, million manat* | *2.827,1* | 857,1 | 955,1 | 1.014,9 | *2.366,1* | 303,5 | 794,0 | 1.268,6 |
| Fəaliyyətdə olan sahibkarlıq subyektləri *The number of active enterprises* | *377.842* | 366.944 | 7.760 | 3.138 | *401.149* | 389.133 | 8.610 | 3.406 |

Gənclərin iqtisadiyyatda oynadığı rol gün keçdikcə daha əhəmiyyətli və hiss olunan bir gücə çevrilir. Yeni nəsil sahibkarlar artıq yalnız biznes qurmaqla kifayətlənmirlər, onlar texnoloji yeniliklərə, sosial təşəbbüslərə və davamlı iqtisadiyyata əsaslanan fəaliyyətləri ilə həm iqtisadi strukturda dəyişikliklər yaradır, həm də cəmiyyət və ətraf mühit üçün ciddi töhfələr verirlər. Bu təşəbbüslər daha çevik, inklüziv və davamlı iqtisadi modellərin formalaşmasına səbəb olur. Nəticədə, gənclər yalnız şəxsi inkişaflarına deyil, həm də cəmiyyətin və dünyanın gələcəyinə yönəlmiş dəyişikliklərin əsas iştirakçılarına çevrilirlər. Onların yaradıcılığı, yenilikçi düşüncəsi və təşəbbüskarlığı, iqtisadiyyatın gələcək konturlarını formalaşdıran əsas qüvvələrdəndir.

*Gənclərin iqtisadiyyatdakı təsiri.* Gənclərin yaratdığı sosial sahibkarlıq təşəbbüsləri isə yalnız iqtisadi gəlir məqsədi güdmür. Bu layihələr eyni zamanda, sosial və ekoloji problemlərə diqqət yetirir. Onlar tərəfindən qurulan yaşıl startaplar, sosial proqramlar və ekoloji dayanıqlılıq təşəbbüsləri, iqtisadiyyatın ekoloji dəyərlərlə zənginləşməsinə xidmət edir. Belə sahibkarlar yalnız qazanmağa deyil, cəmiyyətə və ətraf mühitə faydalı olmağa da üstünlük verirlər (Drucker, 2014).

Bu gənc sahibkarlar təşəbbüsləri ilə iqtisadiyyatın müxtəlif sahələrinə yeni nəfəs verirlər. Onlar innovativ texnoloji platformalar qurur, rəqəmsal imkanlardan istifadə edərək öz bizneslərini beynəlxalq bazarlara çıxarır və yerli səviyyədə yeni iş imkanları yaradırlar. Green tech (yaşıl texnologiya), biotexnologiya və sağlamlıq texnologiyaları kimi sahələrdəki startaplar onların yaratdığı dəyişikliklərin bariz nümunələridir. Bu sahələrdəki yeniliklər təkcə iqtisadi deyil, həm də ekoloji və sosial baxımdan cəmiyyət üçün böyük əhəmiyyət daşıyır.

Bununla yanaşı, gənclər iqtisadiyyatın yalnız texnoloji və kommersiya hissəsində deyil, sosial inklüzivlik sahəsində də yeni yanaşmalar təqdim edirlər. Sosial sahibkarlıq təşəbbüsləri vasitəsilə, iqtisadiyyatın zəif təbəqələrində olan insanlara yeni fürsətlər yaradılır. Bu təşəbbüslər həmçinin iqtisadi bərabərliyin təmin olunmasına, müxtəlif sosial qrupların iqtisadi sistemə inteqrasiyasına şərait yaradır (Zamanov, 2022).

Gənclər üçün sahibkarlıq yalnız bir iş qurmaq anlamına gəlmir – bu, davamlı öyrənmə, inkişaf və təkamül yoludur. Onlar müasir iqtisadi modelləri mənimsəyərək, eyni zamanda təhsil və peşə bacarıqlarını təkmilləşdirirlər. Rəqəmsal texnologiyalarla işləmək, çevik və uyğunlaşa bilən iş mühiti qurmaq və yeni biliklər qazanmaq bu sahədə uğur qazanmağın əsas yollarındandır.

Bildiyimiz kimi, "Gənclik və iqtisadiyyat: yeni nəsil sahibkarlarının rolu" mövzusu müasir dövrün ən aktual istiqamətlərindən biridir və gələcəkdə daha da əhəmiyyətli hala gələcək. Gənc sahibkarlar yeni ideyaları, innovativ baxış bucaqları və dinamik iş modelləri ilə iqtisadiyyatda dönüş nöqtələri yarada biləcək potensiala malikdirlər.

*1. Təhsil və bacarıqların inkişafı.* Yeni nəsil sahibkarların uğur qazanması üçün onların güclü təhsil və bacarıq bazasına malik olmaları vacibdir. Bu istiqamətdə bir neçə mühüm təklif var: Sahibkarlıq təhsili: gənclərə iqtisadiyyat, maliyyə, idarəetmə, marketinq, hüquq və biznes sahələrini əhatə edən kurslar təşkil olunmalıdır. Bu təhsil həm universitetlərdə, həm də xüsusi təşəbbüslər çərçivəsində həyata keçirilə bilər. Praktik təcrübə imkanları: təhsil müəssisələri və universitetlər gənc sahibkarlar üçün real iş mühiti təqdim etməli, onları praktiki fəaliyyətlərlə tanış edərək iş dünyasına hazırlamalıdır.

2. *Sahibkarlıq ekosisteminin gücləndirilməsi.* Gənc sahibkarların uğurlu fəaliyyət göstərə bilməsi üçün onların fəaliyyətinə uyğun və dəstəkverici bir mühitin yaradılması vacibdir. Belə mühit onların potensialını daha rahat reallaşdırmasına imkan verər.

Maliyyə dəstəyi və kredit imkanları: gənclər, xüsusilə işə yeni başlayan zamanlarda maliyyə çatışmazlığı ilə üzləşirlər. Bu problemi aradan qaldırmaq üçün gənclərə yönəlmiş xüsusi fondlar və mikrokredit proqramları yaradılmalıdır. Belə imkanlar onların işə başlamasını və davam etməsini asanlaşdırar.

Vergi güzəştləri və stimullar: gənc sahibkarlara təqdim ediləcək vergi güzəştləri və digər maliyyə stimulları onların fəaliyyətlərini həm daha əlverişli edir, həm də motivasiyanı artırır.

İnnovasiya mərkəzləri: yaradıcılıq və yeni ideyalar üçün əlverişli məkanlar çox vacibdir. Bu baxımdan, inkubatorlar, akseleratorlar və texnoparkların yaradılması və genişləndirilməsi, gənclərin

ideyalarını reallaşdırmaqda onlara böyük dəstək olacaq. Həmçinin, bu mərkəzlərdə mentor dəstəyi almaq imkanı da mühüm əhəmiyyət daşıyır.

*3. Yeni texnologiyalar və rəqəmsal ticarətə yönəltmə.* Yeni nəsil sahibkarlar texnologiyaya daha açıqdır və rəqəmsal platformalarda fəaliyyət göstərməkdə daha bacarıqlıdır. Bu xüsusiyyətlərdən istifadə olunması üçün aşağıdakı addımlar önəmlidir:

Rəqəmsal təhsil və resurslar: gənclərə onlayn kurslar vasitəsilə rəqəmsal marketinq, e-ticarət, proqramlaşdırma və veb dizayn kimi sahələrdə təlimlər verilməlidir. Bu biliklər onların rəqəmsal dünyada uğur qazanmasına imkan yaradacaq.

E-ticarət və startap dəstəyi: gənclərin öz onlayn bizneslərini qurması üçün e-ticarət platformalarına texniki və maliyyə dəstəyi göstərilməlidir. Eyni zamanda blockchain, kriptovalyuta kimi yeni texnologiyalar haqqında maarifləndirici seminarlar və təlimlər təşkil oluna bilər.

4. *Şəbəkələşmə və əməkdaşlıq imkanları.* Sahibkarlıq fəaliyyəti təkbaşına aparıldıqda çətinliklər yarada bilər. Bu səbəbdən, gənclərin bir-biri ilə və təcrübəli şəxslərlə əlaqə qurması vacibdir:

İşgüzar şəbəkələr: gənclər üçün müxtəlif biznes forumları, partnerlik proqramları və şəbəkə tədbirləri təşkil olunmalıdır. Bu tədbirlərdə onlar həm müştəri, həm də iş ortağı tapmaq imkanına sahib ola bilərlər.

Beynəlxalq əməkdaşlıq: gənc sahibkarların beynəlxalq bazarlara çıxış imkanlarını artırmaq üçün xarici ticarət və ixracat mövzusunda təlimlər və təcrübə proqramları hazırlanmalıdır. Bu yanaşma onların qlobal miqyasda fəaliyyət imkanlarını genişləndirəcək.

5. *Sosial məsuliyyət və dayanıqlı inkişaf.* Müasir gənc sahibkarlar təkcə gəlir əldə etməklə kifayətlənmirlər. Onlar eyni zamanda cəmiyyətin və ətraf mühitin problemlərinə qarşı da həssas yanaşırlar:

Sosial sahibkarlıq və dayanıqlı bizneslər: Gənclərin ekoloji baxımdan dayanıqlı, sosial təsir yaradan layihələr qurmasına təşviq olunmaları vacibdir. Onlara bu mövzularda məlumat verilməli və dayanıqlı yanaşmanın əhəmiyyəti izah edilməlidir.

Sosial təşəbbüslər: gənc sahibkarlar öz layihələrində sosial problemlərin həllinə diqqət yetirməli, məsələn, yoxsulluğun azaldılması, təhsilin dəstəklənməsi və səhiyyə xidmətlərinin yaxşılaşdırılması istiqamətində addımlar atmalıdırlar.

6. *Hüquqi mühit və təşviqat.* Gənc sahibkarların fəaliyyətini daha rahat şəkildə həyata keçirməsi üçün sadə və şəffaf hüquqi mühit vacibdir:

Sadələşdirilmiş qanunvericilik: qeyri-rəsmi fəaliyyətin qanuniləşdirilməsi prosesi asanlaşdırılmalı, hüquqi prosedurların say və mürəkkəbliyi azaldılmalıdır. Bu, xüsusilə yeni başlayanlar üçün ciddi rahatlıq yaradacaq.

Hüquqi dəstək: gənclərin hüquqi məsələlərdə məlumatlı olması üçün məsləhət xidmətləri təqdim olunmalı, hüquqi yardım xidmətlərinə əlçatanlıq artırılmalıdır.

*7. Gənclərin ictimai fəaliyyətə cəlb edilməsi.*

Gənc sahibkarlar yalnız iqtisadi deyil, ictimai sahədə də aktiv olmalıdırlar. Onların sosial həyatdakı iştirakı liderlik və vətəndaş məsuliyyəti baxımından da olduqca önəmlidir:

Könüllülük proqramları: gənclərin sosial təşəbbüslərdə və ictimai layihələrdə iştirakını təmin etmək üçün könüllülük əsaslı proqramlar hazırlanmalıdır. Bu proqramlar onların liderlik və sosial məsuliyyət bacarıqlarını inkişaf etdirəcək.

Gənc liderlərin yetişdirilməsi: gənclərin gələcəyin liderləri kimi formalaşması üçün mentorluq proqramları və liderlik məktəbləri yaradılmalıdır. Bu təşəbbüslər onların həm biznesdə, həm də cəmiyyətdə daha güclü mövqe tutmalarına kömək edəcək.

## Nəticə

Yeni nəsil sahibkarlar, yəni gənclər yalnız enerjiləri və ideyaları ilə deyil eyni zamanda, cəmiyyətə gətirdikləri yenilikçi baxış bucağı ilə də iqtisadiyyatın inkişafında mühüm rol oynayırlar. Onlar gənc yaşlarından etibarən sosial və iqtisadi sahələrdə müsbət dəyişikliklər etməyə çalışır, yeni iş yerləri yaratmaq, texnoloji yenilikləri tətbiq etmək və sosial məsuliyyətə əsaslanan biznes

modelləri qurmaq potensialına malikdirlər. Bu baxımdan gənclər yalnız gələcəyin sahibkarları deyil, həm də bu günün dəyişikliklərini həyata keçirən əsas qüvvədirlər.

Gənc sahibkarların bu potensialını reallaşdırmaları üçün onlara yönələn dəstək proqramları olduqca əhəmiyyətlidir. Bu dəstək, ilk növbədə onların keyfiyyətli təhsil alması, praktik bacarıqlar qazanması, işgüzar əlaqələr qurması, maliyyə mənbələrinə çıxış əldə etməsi və hüquqi cəhətdən qorunması ilə təmin olunmalıdır. Bu sahələrdə atılan addımlar onların uğur qazanmasını asanlaşdırır və sahibkarlıq mühitini daha əlverişli hala gətirir.

Gənclərə investisiya qoymaq istər bilik və bacarıq baxımından, istərsə də maliyyə və struktur dəstəyi baxımından yalnız bir fərdin inkişafı deyil, bütövlükdə ölkənin sosial-iqtisadi gələcəyinə qoyulan sərmayədir. Belə bir yanaşma uzunmüddətli və davamlı inkişafın təməlini təşkil edir. Gənclərin yaratdığı innovativ ideyalar, texnologiya əsaslı həllər və sosial təşəbbüslər, cəmiyyətin bütün sahələrində müsbət təsir yaradır.

Əlavə olaraq, gənclərə verilən dəstək onların təşəbbüskarlıq ruhunu gücləndirir və onları yalnız iş qurmağa deyil, həm də sosial liderliyə təşviq edir. Beləliklə, gənc sahibkarların dəstəklənməsi təkcə iqtisadi artımı deyil, həm də daha inklüziv, dinamik və dayanıqlı bir gələcəyin qurulmasına töhfə verir. Gənclər öz ideyaları ilə gələcəyin dünyasını formalaşdırmağa hazırdır bizə düşən isə onlara bu yolda etibarlı dayaq olmaqdır.

## Ədəbiyyat

1. *Azərbaycan Respublikasında gənclərin vəziyyəti: statistik göstəriciləri.*
2. Əliyev, R. (2020). *Sahibkarlığın əsasları.*
3. Drucker, P. (2014). *Innovation and Entrepreneurship.* HarperBusiness
4. Hüseynova, A. (2021). Yeni nəsil sahibkarların Azərbaycan iqtisadiyyatına təsiri. *Azərbaycan İqtisadiyyatı jurnalı*, 3(45), s. 55-63.
5. Hisrich, R., Peters, M., Shepherd, D. (2017). *Entrepreneurship.*
6. Qasımov, T. (2022). Startap ekosistemi və gənclərin rolu. *Sosial və İqtisadi Tədqiqatlar*, 1(9), s.23-30.
7. Məmmədov, V. (2021). *Azərbaycan iqtisadiyyatı və innovativ sahibkarlıq.*
8. Səmədova, O. (2018). *İqtisadiyyata giriş*
9. Vəliyev, T., Babayev, Ə. (1999). *İqtisadi nəzəriyyə.*
10. Vəliyev, T., Qafarov, Ş. (2004*). İqtisadi nəzəriyyə.*
11. Zamanov, S. (2022). *Gənclər və iqtisadi inkişaf: çağırışlar və imkanlar.* Qanun Nəşriyyatı.
12. https://www.stat.gov.az
13. https://nstat.gov.az/

Daxil oldu: 08.03.2025
Qəbul edildi: 19.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/77-81

**Бекжон Курбонов**
Каршинский Государственный Университет
докторант
https://orcid.org/0000-0003-4555-6937
bekjon.qurbonov@gmail.com

# Деятельность Управления мусульман Узбекистана: исторические этапы развития подготовки кадров в религиозной сфере

**Резюме**

В статье анализируется возрождение религиозного образования в Узбекистане после Второй мировой войны и основные направления религиозной политики СССР. Показано, какие меры были предприняты для создания религиозных учебных заведений и подготовки религиозных деятелей. Особое внимание уделено мерам, реализуемым Духовным управлением мусульман Средней Азии и Казахстана (САДУМ). Автор приходит к следующему выводу: несмотря на давление и напряженность советской системы, муфтии САДУМ активно участвовали в организации просветительской деятельности религиозных учебных заведений.

***Ключевые слова:*** *Медресе Мир Араб и Баракхан, Ташкентский исламский институт, система религиозного образования, шейх Эшон Бабахан, ислам в Узбекистане*

**Bekjon Qurbonov**
Qarşi Dövlət Universiteti
doktorant
https://orcid.org/0000-0003-4555-6937
bekjon.qurbonov@gmail.com

# Özbəkistan Müsəlmanları İdarəsinin fəaliyyəti: dini sahədə kadr hazırlığının tarixi inkişafı mərhələləri

**Xülasə**

Məqalədə İkinci Dünya Müharibəsindən sonra Özbəkistanda dini təhsilin canlanması və SSRİ-nin din siyasətinin əsas istiqamətləri təhlil edilir. Burada dini təhsil müəssisələrinin yaradılması, din xadimlərinin hazırlanması istiqamətində hansı tədbirlərin görüldüyü göstərilir. Mərkəzi Asiya və Qazaxıstan Müsəlmanları Ruhani İdarəsinin (SADUM) həyata keçirdiyi tədbirlərə xüsusi diqqət yetirilir. Müəllif belə bir nəticəyə gəlir: sovet quruluşunun təzyiq və gərginliyinə baxmayaraq, SADUM müftiləri dini təhsil müəssisələrinin maarifləndirici fəaliyyətinin təşkilində fəal iştirak edirdilər.

***Açar sözlər:*** *Mir Ərəb və Baraxan mədrəsəsi, Daşkənd İslam İnstitutu, dini təhsil sistemi, Şeyx Eşon Babaxan, Özbəkistanda İslam*

**Bekjon Qurbonov**
Karshi State University
PhD student
https://orcid.org/0000-0003-4555-6937
bekjon.qurbonov@gmail.com

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

# Activities of the Muslim Board of Uzbekistan: Historical Stages in the Development of Religious Personnel Training

**Abstract**

The article analyzes the revival of religious education in Uzbekistan after the Second World War and the main directions of the religious policy of the USSR. It shows what measures were taken for the establishment of religious educational institutions and the training of religious workers. Special attention is paid to the measures implemented by the Spiritual Administration of the Muslims of Central Asia and Kazakhstan. The author comes to the following conclusion: despite the pressure and tensions of the Soviet system, SADUM muftis actively participated in the organization of educational activities of religious educational institutions.

***Keywords:*** *Mir Arab and Barakhan madrasah, Tashkent Islamic Institute, religious education system, Sheikh Eshon Babakhan, Islam in Uzbekistan*

## Введение

Известно, что Узбекистан, расположенный на перекрестке международной торговли и Великого Шелкового пути, в самом сердце Центральной Азии, с древних времен был местом, где соединялись различные религии, культуры и идеологии. Также эта земля считается страной, развившей основы ислама, мусульманского образования, религиозной науки и теории.

Хотя советское государство проводило иную политику в отношении исламской религии и образования, деятельность Религиозного управления привела к формированию исламской культуры и образования, характерных для своего времени. В исследовании отражен вопрос о значении лидеров САДУМ в восстановлении исламских традиций в культурно-просветительской жизни мусульман страны. Однако на основе обширных архивных источников видно, что деятельность узбекских ученых по налаживанию религиозного образования освещена недостаточно. В связи с этим в данной части на основе новых фактов и информации подчеркивается активное участие руководителей Религиозного управления в организации просветительской деятельности религиозных образовательных учреждений.

**Исследование**

В 1942-1943 годах действия советского правительства в политической и идеологической сфере привели к открытию религиозных центров в ряде городов Советского Союза. Во время Второй мировой войны, то есть в 1943 году, по определенным политическим и социальным причинам Советское государство разрешило деятельность религиозным организациям (Усмонхўжаев, 2013). В частности, постановлением Президиума Верховного Совета СССР от 31 июля 1943 года было разрешено создать Духовное управление мусульман Средней Азии и Казахстана (Национальный архив Узбекистана, далее – НАУ).

20 октября 1943 года в Ташкенте состоится Первое Учредительное собрание Духовного управления мусульман Средней Азии и Казахстана. Таким образом, после создания Духовного управления мусульман Средней Азии и Казахстана одной из следующих задач, стоящих перед ним, стало открытие религиозных образовательных учреждений. Для этого в марте 1945 года по решению ЦК Узбекской ССР был создан оргкомитет под руководством муфтия Эшона Бобохана ибн Абдулмаджидхана. Планируется создать религиозные школы в Ташкенте и Бухаре.

Интенсификация атеистического воспитания в советском государстве, идеология коммунистической партии, естественно, оказали влияние на деятельность медресе. Эта ситуация проявилась в сокращении числа студентов, ограничении преподавания религиозных предметов и усилении контроля за религиозным образованием, особенно в начале 60-х годов. Например, в 1956 году 160 абитуриентов подали заявки на 30 мест для обучения в медресе Барак-хана. В 1975-1980 годах в медресе Мир Араб хотели учиться 300 человек, но приняли только 40 человек. В 1980/1981 учебном году таких студентов было 116,

из них отобрано только 12 (Халилова, 2019). Позже в список предметов, преподаваемых студентам медресе, войдут Конституция СССР, персидский язык, история СССР и русский язык. Несомненно, стоит отметить, что в процессе преподавания учебных программ и предметов имело место прямое влияние правящей системы и идеологии того времени. Медресе Мир Араб (Бухара), начавшее свою деятельность в 1946 году, было единственным мусульманским высшим учебным заведением во всей советской стране.

Ну а теперь если более внимательно рассмотреть тему, то в религиозных учебных заведениях по очереди 11 предметов: правила изучения Священного Корана, описание Корана, хадисы, история религии, фонетика, морфология, синтаксис (арабский язык), арабская грамматика, математика, география, каллиграфия, грамматика и литература узбекского языка. 9 лет обучения в медресе и 4 года для студентов среднего религиозного образования (НАУ).

Для преподавания в этих учебных заведениях были приглашены Эшонджон Махмудходжа, Мухиддин Махсум Мавлон, Шарифкори Латипов, мулла Мухаммад Аминджон Махсум огле, мулла Салих Мирзаев, доктор филологических наук, профессор Абдурахмон Садий, Водуд Фахриддинов и другие (НАУ).

Следует отметить, что медресе Мир Араб имело большое просветительское значение в период распространения исламских знаний в советской стране. По рекомендации муфтия Эшона Бобохана Абдулмаджидханова, известный ученый из Бухары, один из представителей ордена Накшбанди, учитель Гуломджон Изоми, был назначен заместителем директора по воспитательной работе медресе Мир Араб (1946-1956 годы). На должность директора был назначен Ходжиакбархан Мухитдинов, переводчик Института востоковедения ФА, знаток арабского, персидского и русского языков, знающий человек (Усмонхўжаев, 2013).

Если более внимательно взглянуть на деятельность и состояние медресе Мир Араб в советское время и проанализировать его на основе архивных документов, то можно засвидетельствовать, что даже в сложных экономических и социальных условиях это учреждение с честью вело свою деятельность. Например, по словам председателя комитета по делам религии Совета Министров Узбекистана, даже в начале 1960-х годов ситуация в медресе была неудовлетворительной, стипендии были небольшими (35 рублей), в комнатах было холодно и темно, и его было «неудобно показывать даже за границей». В то же время считается целесообразным закрыть медресе Мир Араб (19 декабря 1963 г.). Таким образом, до конца 80-х годов в советской стране действовало единственное медресе Мир Араб (НАУ).

Во второй половине XX века в религиозной жизни мусульман Средней Азии началась новая эпоха. Эти изменения касаются сферы религиозного образования, и по инициативе Духовного управления была создана деятельность медресе Мир Араб в 1946 году, медресе Барак Хана в 1956-1961 годах и Ташкентского исламского института имени Имама Бухари, в составе Духовного управления мусульман Средней Азии и Казахстана.

Среди религиозных управлений, созданных на территории Советского Союза, особое значение имело САДУМ, расположенное в Ташкенте (ныне медресе Баракхана). Это объясняется, с одной стороны, тем, что большая часть исторических памятников ислама находится на территории Узбекистана, с другой стороны, это основано на том, что всемирно известные исламские учёные приезжали в страну в различные этапы исторического развития.

Следует отметить, что в деятельности духовного управления в 1943-1991 годах подготовка религиозных кадров считалась одним из наиболее важных и проблемных вопросов, и этому уделялось особое внимание. Эти учебные заведения, единственные в Советском Союзе, смогли подготовить работников исламской религии в сложной и противоречивой системе 1945-1991 годов, в обществе, где вопрос религиозных убеждений был ограничен.

В организации и развитии образования в медресе большой вклад внесли муфтий Эшон Бобохан ибн Абдулмаджидхан, помощник председателя Зиёвуддин Бобоханов и судья Муродходжа Солиходжаев (Тожиев, 2012), шейх Исмаил Махдум (Махдум, 2001), шейх

Юсуфхан Шакир (Шокир, 2001), шейх Мухаммад Садик Мухаммад Юсуф (Энциклопедический словарь, 2003). Ремонт здания, отведенного под медресе, подготовка учебной программы, прием студентов, подбор преподавателей и мударрисов (религиоведов, преподавателей социальных наук), финансовое обеспечение и другие вопросы решались Религиозным управлением. Финансовые расходы медресе осуществлялись за счет средств, полученных от пожертвований мусульман.

Как было сказано выше, Духовный отдел начал осуществлять официальную деятельность 20 октября 1943 года стараниями Эшона Бабахана ибн Абдулмаджидхана (Йулдошходжаев, 2015). В 1957-1982 годах им руководил З. Бобохонов (Бабаханов, 1998), в 1982-1989 годах - Ш.Бобохонов, в 1989-1993 годах - Мухаммад Садик Мухаммад Юсуф (Усмонходжаев, 2012).

Можно сказать, что в литературе, изданной в последние годы, широкой публике были представлены династия Бобохановых, лидеры САДУМ, а также деятельность ученых, служивших делу ислама в этот период. Например, вышедшая в 2015 году книга, в соавторстве с Х.Йолдошходжаевым и И.Каюмовой, освещает исторические аспекты жизни узбекских учёных, особенно религиозных деятелей, живших в советские годы и служивших в различных сферах управления (мечеть , медресе, институт) (Йулдошходжаев, 2015). Также деятельность Духовного отдела и ученых по распространению исламского просвещения постоянно исследуется в «Замонамиз уламолари», «Динимиз фидойлари» и других энциклопедиях исламоведения, а также на страницах газет «Ислам нури» и «Хидаят». Наряду с исследованием различных аспектов проблемы в научных исследованиях упоминается и деятельность Религиозного отдела в сфере образования.

В исследованиях А.Моминова и У.Гафурова отмечается, что заслуги семьи Бобохановых в организации религиозного образования в советские годы были велики (Бабаханов, 2001). В частности, авторы подчеркивают, что в деятельности З.Бобоханова большое внимание уделялось изучению хадисов в медресе, празднованию дня рождения имама Бухари, изданию религиозных книг (Muminov, Gafurov, Shigabdinov, 2010).

В условиях атеистической политики, проводимой советским правительством, образование в этих учреждениях осуществлялось своеобразно, а в отдельные годы из-за положения медресе внимание уделялось преимущественно преподаванию религиозных предметов, иногда видно, что внимание к светской тематике возросло. Изучение учебной программы предметов, преподаваемых в медресе, новые сведения по истории религиозного образования и его состояния в советские годы, в том числе изучение учебной программы медресе, какие предметы составляли основную часть предметов, какие предметы преподавалось меньше часов в результате религиозной политики, проводимой правительством, или преподаваемые предметы и учебники, как замечено, не возникли в рамках организации религиозного образования.

## Заключение

В заключение можно сказать, что деятельность Духовного управления мусульман Средней Азии и Казахстана в Узбекистане в 1943-1991 годах имела определенное значение в возрождении исламских традиций в культурно-просветительской жизни мусульман страны. Давление и напряженность советского режима оказали влияние на внутреннюю и внешнюю деятельность Духовного управления. В этом процессе одним из важных изменений в жизни мусульман можно увидеть официальное разрешение на деятельность исламских учебных заведений. Руководители религиозного управления приняли активное участие в организации просветительской деятельности религиозных учебных заведений. Это проявляется в том, что принят ряд мер по увеличению количества студентов, повышению качества образования, их обучению в зарубежных исламских университетах.

## Литература

1. Бабаханов, Ш.Э. (1998). *Неизгладимая рана. Жизнь и деятельность шейха Зиёвуддина Хана*. Маънавият.
2. Бабаханов, Ш.Э. (2001). *Шейх Зиявуддин Хан ибн Эшан Баба Хан*. Школа духовности и примера.
3. Йулдошходжаев, Х. (2015). *Ученые Узбекистана*. Мавароуннехр.
4. Махдум, И. (2001). *Ученые нашего времени*. Международный фонд Имама аль-Бухари.
5. Muminov, A., Gafurov, U., Shigabdinov, R. (2010). Islamic Education in Soviet and post Soviet Uzbekistan. *Islamic Education in the Soviet Union and its Successor States Ed. Michael Kemper, Raoul Motika and Stefan Reichmuth*. p. 223-280.
6. *Национальный архив Узбекистана*. Р-2456-фонд, Оп. 1. Д. 52. Л. 38-39; Д. 443. Л. 20-21.
7. Тожиев, А. (2012). Кто Муродходжа Салихий? *Хидоят*. вып. 7. с. 28-32.
8. Усмонхўжаев, А. (2008). *Жизнь муфтиев Бабахановых: служение возрождению Ислама в Советском Союзе*. «Медина».
9. Усмонхўжаев, А. (2012). Пример Шамсиддинхана Бобоханова. *Хидоят*. вып. 4, с. 22-24.
10. Усмонхўжаев, А. (2013). Преданные нашей религии. Ташкент: Тафаккур, с.23-166.
11. Халилова, З.Э. (2019). Состояние и историография исламского религиозного образования в Узбекистане в 1945-1991 гг.: дис. … канд. ист. наук. Ташкент, с. 18.
12. Шокир, Ю. (2001). *Ученые нашего времени*. Международный фонд Имама аль-Бухари.
13. Энциклопедический словарь. (2003). Ислам на территории бывшей Российской империи. *Вып.4, Восточная литература РАН*, с. 53-55.

Поступило: 12.03.2025
Принято: 18.06.2025

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 6 / 82-87
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 6 / 82-87 e-ISSN: 2789-6919

DOI: https://doi.org/10.36719/2789-6919/46/82-87

**Zahid Qənbərov**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0008-8287-1155
zahidislam@mail.ru

## Naxçıvanın investisiya iqlimi: regional inkişafda yeni çağırışlar

### Xülasə

Bu məqalədə Naxçıvan Muxtar Respublikasının investisiya iqlimi geniş təhlil olunur və regionun dayanıqlı inkişafı kontekstində qarşıya çıxan yeni çağırışlar araşdırılır. Geosiyasi mövqeyi, iqtisadi resursları və sosial potensialı ilə Naxçıvan Azərbaycanın regional inkişaf strategiyalarında mühüm yer tutur. Son illərdə həyata keçirilmiş infrastruktur layihələri, sənaye parklarının yaradılması, kənd təsərrüfatına və turizm sektoruna yönəlmiş dövlət dəstəyi regionun investisiya cəlbediciliyini artırsa da, bəzi struktur və institusional problemlər hələ də mövcuddur.

Məqalədə regionun investisiya axınlarına təsir edən əsas amillər – hüquqi-normativ baza, logistika imkanları, insan kapitalı, enerji resurslarına çıxış və gömrük prosedurlarının sadələşdirilməsi kimi faktorlar ətraflı təhlil edilir. Eyni zamanda, mövcud iqtisadi çağırışlar, blokada şəraiti, rəqəmsal infrastrukturun məhdudluğu, ixtisaslı kadr çatışmazlığı və innovasiya mühitinin zəifliyi qeyd olunur.

Tədqiqat nəticəsində müəyyən edilir ki, Naxçıvanda davamlı və səmərəli investisiya mühitinin formalaşdırılması üçün yalnız fiziki infrastrukturun deyil, həm də institusional və hüquqi sistemlərin təkmilləşdirilməsi vacibdir. Məqalədə həmçinin, xarici və yerli investorların cəlb olunması, sərmayələrin sahəvi diversifikasiyası və yaşıl iqtisadiyyata keçid kimi strateji istiqamətlər üzrə tövsiyələr irəli sürülür. Bu qənaətə gəlinir ki, Naxçıvanın regional inkişafında investisiya iqliminin optimallaşdırılması həlledici rol oynayacaq və bu prosesin uğuru yeni iqtisadi çağırışlara uyğunlaşma bacarığından asılı olacaqdır.

***Açar sözlər:*** *Naxçıvan iqtisadiyyatı, investisiya iqlimi, xarici və yerli investisiyalar, investisiya təşviqi, regional inkişaf, yerli resursların səmərəli istifadəsi*

**Zahid Ganbarov**
Nakhchivan State University
https://orcid.org/0009-0008-8287-1155
zahidislam@mail.ru

## Investment Climate of Nakhchivan: New Challenges in Regional Development

### Abstract

This article provides a comprehensive analysis of the investment climate of the Autonomous Republic of Nakhchivan and explores new challenges in the context of the region's sustainable development. With its geopolitical position, economic resources and social potential Nakhchivan occupies an important place in Azerbaijan's regional development strategies. Although infrastructure projects implemented in recent years, the creation of industrial parks and state support for the agriculture and tourism sectors have increased the region's investment attractiveness, some structural and institutional problems still exist.

The article provides a detailed analysis of the main factors affecting the region's investment flows - such as the legal and regulatory framework, logistics capabilities, human capital, access to energy resources, and simplification of customs procedures. At the same time, existing economic challenges - blockade conditions, limited digital infrastructure, lack of qualified personnel, and a weak innovation environment - are noted.

The study concludes that in order to form a sustainable and efficient investment environment in Nakhchivan, it is important to improve not only the physical infrastructure, but also the institutional and legal systems. The article also puts forward recommendations on strategic directions such as

 Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

attracting foreign and local investors, sectoral diversification of investments, and transition to a green economy. The author concludes that optimizing the investment climate will play a crucial role in the regional development of Nakhchivan, and the success of this process will depend on the ability to adapt to new economic challenges.

***Keywords:*** *Nakhchivan economy, investment climate, foreign and local investments, investment promotion, regional development, efficient use of local resources*

## Giriş

Qloballaşan dünyada regional inkişaf strategiyalarının uğurla həyata keçirilməsi üçün investisiya mühitinin formalaşdırılması mühüm şərtlərdən biri kimi çıxış edir. Xüsusilə geosiyasi baxımdan əhəmiyyətli, lakin coğrafi baxımdan təcrid olunmuş regionlar üçün bu məsələ daha da aktual xarakter daşıyır. Azərbaycanın mühüm inzibati ərazi vahidi olan Naxçıvan Muxtar Respublikası da bu kontekstdə diqqət mərkəzindədir (*Azərbaycan Respublikası Prezidentinin İnvestisiya Strategiyası,* 2019). Qonşu ölkələrlə məhdud və qapalı sərhədlərə malik olan Naxçıvan, strateji mövqeyinə və resurs potensialına baxmayaraq, uzun illər blokada şəraitində fəaliyyət göstərmişdir. Lakin son illərdə həyata keçirilən dövlət proqramları, sosial-iqtisadi islahatlar və infrastruktur layihələri nəticəsində regionun iqtisadi profili əhəmiyyətli dərəcədə dəyişmiş və investisiya baxımından yeni imkanlar formalaşmışdır.

İnvestisiya iqlimi, bir bölgəyə sərmayə cəlb etmək üçün əlverişli olan iqtisadi, hüquqi, sosial və siyasi mühitin məcmusu kimi qiymətləndirilir. Bu baxımdan Naxçıvanın investisiya iqliminin öyrənilməsi həm mövcud vəziyyətin qiymətləndirilməsi, həm də regional siyasətin formalaşdırılması baxımından zəruridir. Regionun enerji, sənaye, kənd təsərrüfatı və turizm sahələrində inkişaf potensialı böyükdür. Lakin bu imkanların reallaşdırılması üçün kompleks və məqsədyönlü investisiya strategiyasına ehtiyac duyulur.

Məqalənin əsas məqsədi – Naxçıvan Muxtar Respublikasında formalaşmış investisiya iqlimini müxtəlif aspektlərdən təhlil etmək, mövcud problemləri və çağırışları müəyyənləşdirmək, həmçinin bu sahədə səmərəli inkişaf üçün strateji tövsiyələr irəli sürməkdir. Bu kontekstdə, məqalədə Naxçıvanın iqtisadi-coğrafi mövqeyi, sərmayələrin strukturu, institusional mexanizmlər və investorların qarşılaşdıqları çətinliklər geniş şəkildə təhlil edilir.

Mövzunun aktuallığı həm də ondan irəli gəlir ki, ölkənin digər bölgələri ilə müqayisədə Naxçıvanın özünəməxsus inzibati statusu və idarəetmə modeli var. Bu isə regionda tətbiq olunan iqtisadi mexanizmlərin qiymətləndirilməsi və gələcək inkişaf üçün uyğun modellərin hazırlanması baxımından xüsusi önəm daşıyır. Üstəlik, 2020-ci ildən sonra regionda yaranan yeni geosiyasi reallıqlar, Zəngəzur dəhlizinin açılması perspektivləri və regionlararası nəqliyyat əlaqələrinin bərpası fonunda, Naxçıvanın strateji əhəmiyyəti daha da artır. Bu isə onu göstərir ki, burada investisiya mühitinin gücləndirilməsi təkcə regional deyil, həm də milli iqtisadiyyat üçün həlledici rol oynayacaqdır.

**Tədqiqat**

Naxçıvan Muxtar Respublikası Azərbaycanın qərbində, geosiyasi baxımdan həssas bir bölgədə yerləşir. Şimalda və şərqdə Ermənistan, qərbdə Türkiyə, cənubda isə İran İslam Respublikası ilə həmsərhəd olan region, ölkənin əsas ərazisindən təcrid olunmuş vəziyyətdədir. Bu amil uzun müddət ərzində Naxçıvanın iqtisadi inkişafını ləngidən əsas səbəblərdən biri olmuşdur. Lakin eyni zamanda bu coğrafi mövqe regiona tranzit, sərhədyanı ticarət, logistika və əməkdaşlıq baxımından da strateji əhəmiyyət qazandırır.

Naxçıvanın ərazisi 5.5 min kv.km təşkil edir və burada yaşayan əhalinin sayı 2024-cü ilin əvvəlində 470 mindən artıq olmuşdur. Əhalinin əsas hissəsi şəhərlərdə və dağətəyi rayonlarda məskunlaşmışdır ki, bu da əmək ehtiyatlarının məkan üzrə bölünməsində müəyyən üstünlüklər yaradır. Regionun təbii ehtiyatları, duz yataqları, tikinti materialları, termal su mənbələri və məhsuldar torpaqları iqtisadi fəaliyyət üçün əlverişli baza formalaşdırır. Eyni zamanda Günəş və külək enerjisi üzrə alternativ enerji potensialı da böyükdür.

Naxçıvan Muxtar Respublikasının iqtisadi inkişafında kənd təsərrüfatı, sənaye və xidmət sahələri əsas rol oynayır. Kənd təsərrüfatı sektorunda taxılçılıq, bağçılıq, heyvandarlıq və arıçılıq sahələri inkişaf edir. Sənayedə isə qida məhsullarının emalı, yüngül sənaye və tikinti materialları istehsalı ön plana çıxır. Son illər ərzində həyata keçirilmiş infrastruktur layihələri, avtomobil

yollarının yenilənməsi, hava limanının fəaliyyəti, həmçinin qaz və elektrik təminatının yaxşılaşdırılması regionun iqtisadi aktivliyini artırmışdır.

Önümüzdəki yaxın illərdə Zəngəzur dəhlizinin açılması perspektivi Naxçıvanın tranzit və ticarət imkanlarını daha da genişləndirə bilər. Bu isə regionun xarici bazarlara çıxışını asanlaşdırmaqla yanaşı, sərmayədarların marağını da artıracaq. Xüsusilə Türkiyə və Orta Asiya ölkələri ilə iqtisadi əlaqələrin genişləndirilməsi, ticarət və logistika sahəsində yeni layihələrin reallaşdırılması üçün əlverişli zəmin formalaşır.

Bütün bu amillər göstərir ki, Naxçıvan yalnız daxili bazara yönəlmiş bir region deyil, eyni zamanda beynəlxalq iqtisadi əməkdaşlığın mümkün mərkəzlərindən biri ola bilər. Bu isə mövcud potensialdan səmərəli istifadə etməklə, məqsədyönlü investisiya siyasətinin həyata keçirilməsini zəruri edir.

Naxçıvan Muxtar Respublikasında son on illiklər ərzində həyata keçirilmiş iqtisadi islahatlar və dövlət proqramları regionun investisiya cəlbediciliyini müəyyən dərəcədə artırmışdır. Sərmayədarların maraqlarının qorunması, investisiyaların təşviqi və biznes mühitinin sadələşdirilməsi istiqamətində mühüm addımlar atılmış, xüsusilə vergi və gömrük güzəştləri, torpaq münasibətləri və hüquqi təminatlar baxımından müsbət nəticələr əldə olunmuşdur. Bununla yanaşı, regionun iqtisadi qapalı şəraiti və xarici bazarlara məhdud çıxışı hələ də əhəmiyyətli çətinliklər yaradır.

Hazırda Naxçıvanda investisiya fəaliyyəti əsasən, dövlət dəstəyi ilə həyata keçirilən layihələr və məhdud sayda yerli sahibkarların təşəbbüsləri ilə məhdudlaşır. Xarici sərmayələrin regiona daxil olmasında bir sıra baryerlər mövcuddur: sərhəd əlaqələrinin məhdudluğu, daşıma və logistika xərclərinin yüksəkliyi, maliyyə və sığorta infrastrukturunun zəifliyi kimi amillər bu sahədəki əsas maneələrdəndir. Bununla yanaşı, bank sektorunun məhdud imkanları, kredit faizlərinin yüksək olması və maliyyə resurslarına çıxışın çətinliyi də investisiya mühitinə mənfi təsir göstərir.

Naxçıvanda sahibkarlığın inkişafı üçün müəyyən müsbət tendensiyalar da mövcuddur. Regionda yaradılmış sənaye parkları (Naxçıvan Sənaye Parkı), sənaye məhəllələri (Şərur Sənaye Məhəlləsi), logistika mərkəzləri, kənd təsərrüfatı üçün texnoparklar və qida emalı müəssisələri investorlar üçün əlverişli baza yaradır. Bundan əlavə, enerji təchizatında dayanıqlığın təmin edilməsi və alternativ enerji sahəsindəki dövlət təşviqləri yeni istiqamətlərə sərmayə yatırılmasını stimullaşdıra bilər.

İnvestisiya mühitinin hüquqi əsasları baxımından da müəyyən irəliləyişlər müşahidə olunur. Naxçıvan Muxtar Respublikasının qanunvericiliyi Azərbaycan Respublikasının ümumi hüquqi çərçivəsinə əsaslansa da, yerli idarəetmə orqanları bəzi sahələrdə əlavə təşviq mexanizmləri tətbiq etmək imkanına malikdir. Belə təşviqlərə torpaq icarəsi üzrə güzəştlər, vergi azadolmaları və dövlət-sahibkar əməkdaşlığı üzrə layihələr aiddir.

Lakin ümumilikdə götürdükdə, Naxçıvanda investisiya iqliminin daha da yaxşılaşdırılması üçün institusional potensialın gücləndirilməsi, şəffaflıq və hesabatlılığın artırılması, rəqəmsal xidmətlərin inkişaf etdirilməsi və investorlarla əlaqələrin sistemləşdirilməsi vacib məsələlər olaraq qalır. Həmçinin, beynəlxalq təcrübəyə uyğun olaraq investisiya risklərinin sığortalanması və hüquqi mübahisələrin alternativ həlli mexanizmlərinin formalaşdırılması da investor etimadını artıracaq mühüm alətlərdən biri kimi çıxış edə bilər.

Naxçıvan Muxtar Respublikasında həyata keçirilən iqtisadi islahatlar və infrastruktur layihələri son illərdə regionda investisiya fəaliyyətinin canlanmasına səbəb olmuşdur. Bu fəaliyyət, əsasən, yerli resurslara əsaslanan iqtisadi modellərin inkişaf etdirilməsi və dövlətin sərmayə təşviqi siyasəti fonunda reallaşdırılır. Lakin xarici və yerli investisiyaların strukturu və dinamikası göstərir ki, regionda sərmayə paylanması qeyri-bərabər və daha çox daxili mənbələr hesabına formalaşır.

Statistik məlumatlara əsasən, Naxçıvanda investisiya qoyuluşlarının əsas hissəsini dövlət büdcəsindən maliyyələşən layihələr təşkil edir (Əliyev, 2020). Bu layihələrə əsasən yol tikintisi, su-kanalizasiya sistemləri, enerji infrastrukturu, ictimai obyektlər və sosial təyinatlı obyektlərin inşası daxildir. Yerli sahibkarlar tərəfindən həyata keçirilən investisiya layihələri isə əsasən kiçik və orta biznes sektoruna, xüsusilə kənd təsərrüfatı məhsullarının emalı, qida sənayesi, tikinti materialları istehsalı və xidmət sahələrinə yönəlir.

Xarici investisiyaların həcmi, digər regionlarla müqayisədə daha azdır. Bunun əsas səbəbləri sırasında Naxçıvanın coğrafi təcrid vəziyyəti, beynəlxalq ticarət marşrutlarından uzaqlığı və gömrük-logistika imkanlarının məhdudluğu göstərilə bilər. Bununla yanaşı, xarici investorlar üçün

regionun hüquqi və institusional şəffaflığının artırılması və beynəlxalq iqtisadi əlaqələrin genişləndirilməsi vacib şərtlər olaraq qalır.

İllər üzrə dinamikaya nəzər yetirdikdə müşahidə olunur ki, Naxçıvanda 2010-2020-ci illər ərzində investisiya qoyuluşlarının ümumi həcmi artım tendensiyası göstərmişdir. 2020-ci ildən sonra isə regionda yeni iqtisadi reallıqlar, xüsusilə Zəngəzur dəhlizi ilə bağlı perspektivlər, sərmayə gözləntilərini artırmış və bu sahədə konseptual yanaşmaların formalaşmasına səbəb olmuşdur. Naxçıvanın Türkiyə ilə quru və hava yolu əlaqələrinin mövcudluğu isə xarici investisiya üçün müəyyən imkanlar yaratsa da, bu imkanların reallaşma səviyyəsi hələlik aşağıdır.

Sahələr üzrə investisiya bölgüsünə gəldikdə isə əsas istiqamətləri aşağıdakı kimi ümumiləşdirmək olar:

*İnfrastruktur və tikinti sektoru – dövlət sifarişi ilə həyata keçirilən iri layihələr;*
*Kənd təsərrüfatı – süni suvarma sistemləri, istixana təsərrüfatları, aqrar texnika parkları;*
*Sənaye – qida sənayesi, tikinti materialları və yüngül sənaye müəssisələri;*
*Alternativ enerji – Günəş və külək enerjisi sahəsində ilkin təşəbbüslər.*

Göründüyü kimi, investisiya axınlarında sahəvi konsentrasiya yüksək olsa da, innovativ texnologiyalar, informasiya texnologiyaları və startap ekosistemi demək olar ki, zəif inkişaf etmişdir. Bu isə investisiya strukturunun modernləşdirilməsi və diversifikasiyası üçün yeni yanaşmalara ehtiyac olduğunu göstərir.

Naxçıvanın investisiya iqliminin inkişafı qarşısında bir sıra yeni çağırışlar dayanır ki, bunlar həm institusional, həm texnoloji, həm də sosial xarakter daşıyır (Əliyeva, 2017). İlk növbədə, institusional səviyyədə qərarların qəbulunda şəffaflıq və çeviklik, investorlarla açıq dialoq mexanizmlərinin formalaşması və hüquqi mühitin beynəlxalq standartlara uyğunlaşdırılması zəruridir. Dövlət və özəl sektor arasında əməkdaşlığın daha səmərəli modelləri yaradılmalıdır.

Texnoloji çağırışlara gəlincə, regionda rəqəmsal infrastrukturun zəifliyi, innovasiya yönümlü layihələrin olmaması və texnologiyaya çıxış imkanlarının məhdudluğu diqqət çəkir. Bu isə startaplar və yüksək texnologiyalar sahəsində investisiyaların cəlb olunmasını çətinləşdirir.

Sosial müstəvidə isə ixtisaslı kadr çatışmazlığı, gənclərin paytaxt Bakıya köçü və əmək bazarının qeyri-tarazlığı problemləri mövcuddur. İnsan kapitalının inkişafı və yerli resursların dəyərləndirilməsi bu problemlərin həllində əsas rol oynaya bilər. Bu çağırışların aradan qaldırılması üçün kompleks yanaşmalar və uzunmüddətli inkişaf strategiyaları tələb olunur.

Naxçıvan Muxtar Respublikasında investisiya mühitinin formalaşmasında dövlətin rolu həlledici əhəmiyyətə malikdir. Həm normativ-hüquqi tənzimləmə, həm də maddi-maliyyə dəstəyi baxımından dövlətin müdaxiləsi regionda investisiya fəallığının əsas mənbəyidir. Xüsusilə yerli və xarici sərmayədarların maraqlarının qorunması, inzibati maneələrin azaldılması və təşviqedici mexanizmlərin tətbiqi bu sahədə əsas prioritetlər kimi çıxış edir.

Hazırda Naxçıvanda investisiyanın təşviqi məqsədilə bir sıra alətlər tətbiq olunur. Bunlara vergi və gömrük güzəştləri, torpaq sahələrinin güzəştli şərtlərlə icarəyə verilməsi, sənaye zonalarının yaradılması, subsidiyalar və dövlət zəmanətləri aiddir. Xüsusilə kənd təsərrüfatı və sənaye sahələrinə yönəlmiş dövlət proqramları çərçivəsində sahibkarlara texnika, gübrə, toxum və digər resursların verilməsi investisiya fəaliyyətini stimullaşdırır.

"Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişafına dair 2023-2027-ci illər üçün Dövlət Proqramı" da iqtisadiyyatın diversifikasiyası, kiçik və orta sahibkarlığın dəstəklənməsi, sahibkarlığın inkişafı və hüquqlarının qorunması kimi mühüm hədəflər müəyyənləşdirilib. Artıq Naxçıvan Muxtar Respublikası üçün xüsusi vergi güzəştləri paketi hazırlanıb. Bu paket Muxtar Respublikada qeydiyyata alınan və orada fəaliyyət göstərən sahibkarlıq subyektlərinə şamil olunması nəzərdə tutulur (Əliyeva, 2018; Əliyev, 2023). Biznes subyektlərinin vergi yükünün azaldılması, iri həcmli vergi güzəştlərinin verilməsi, real sektorun vergi dərəcələrinin sıfırlanması, 10 il müddətinə vergidən azad edilməsi təşəbbüsləri var. Bütövlükdə əsas məqsəd Naxçıvan Muxtar Respublikasının mövcud və sonradan yaranacaq vergi ödəyicilərinə vergi güzəştləri verməklə onlar üçün əlverişli biznes mühitini təmin etməkdir. Qeyd olunan güzəşt paketi hazırda hökümətdə baxılır.

Dövlətin funksional rolu həm də institusional səviyyədə özünü göstərir. Sahibkarlığın İnkişafı Fondu, İqtisadiyyat Nazirliyi yanında fəaliyyət göstərən yerli strukturlar, Naxçıvan Dövlət Universiteti və digər qurumlar vasitəsilə maarifləndirmə, təlim və konsultasiya xidmətləri həyata

keçirilir. Bu təşəbbüslər investorların məlumatlılığını artırmaqla bərabər, onların risklərini də azaldır.

Bununla belə, tətbiq olunan təşviq mexanizmlərinin daha effektiv və nəticəyönlü olması üçün şəffaflıq, bürokratik yükün azaldılması və elektron xidmətlərin genişləndirilməsi vacib şərtlər olaraq qalır (İsmayılov, 2020; Qurbanov, 2019; Quliyev, 2023). Bundan əlavə, yerli idarəetmə orqanları ilə sahibkarlar arasında qarşılıqlı etimada əsaslanan münasibətlərin qurulması, təşviqlərin təsirinin müntəzəm monitorinqi və nəticəyə əsaslanan qiymətləndirmə sisteminin tətbiqi tövsiyə olunur.

Naxçıvan Muxtar Respublikasının iqtisadi inkişaf perspektivləri və sərmayə cəlbediciliyi kontekstində bir sıra prioritet sahələr ön plana çıxır. Coğrafi mövqe, təbii resurslar, insan kapitalı və siyasi sabitlik kimi amillər, düzgün idarəetmə və məqsədyönlü təşviqlə birləşdikdə regionda dayanıqlı investisiya mühiti formalaşdırıla bilər.

Azərbaycan Respublikası Prezidentinin 2023-cü ildə təsdiq etdiyi "2023–2027-ci illər üzrə Naxçıvan Muxtar Respublikasının sosial-iqtisadi inkişafı Dövlət Proqramı" bu baxımdan yol xəritəsi rolunu oynayır. Proqramda əsas məqsəd Naxçıvanda iqtisadi artımın sürətləndirilməsi, sosial rifahın yüksəldilməsi, institusional potensialın gücləndirilməsi və regionun tranzit-logistika imkanlarının genişləndirilməsidir.

Perspektiv sahələr aşağıdakılardır:

1. *Alternativ enerji:* Günəş və külək enerjisi istehsalı üçün əlverişli təbii şərait mövcuddur. Dövlət Proqramında bu sahəyə xüsusi önəm verilir və müvafiq investisiya layihələrinin hazırlanması nəzərdə tutulur.

2. *Kənd təsərrüfatı və aqroparklar:* Suvarma infrastrukturunun yaxşılaşdırılması və texnoloji dəstək sayəsində yüksək məhsuldarlığa malik aqrar sahələr formalaşdırıla bilər. Aqro-emal müəssisələri də əlavə dəyər yaradan sahələr sırasındadır.

3. *Sənaye və logistika:* Proqramda yeni sənaye zonalarının yaradılması, Naxçıvan şəhərində və sərhədyanı bölgələrdə logistika mərkəzlərinin təşkili planlaşdırılır. Bu isə regionun ixrac potensialını artırmağa yönəlib.

4. *Turizm və sağlamlıq sektoru:* Ordubad, Şahbuz, Duzdağ və digər ərazilər müalicəvi, ekoloji və mədəni turizm üçün əlverişlidir. Dövlət Proqramı bu sahədə infrastrukturun təkmilləşdirilməsini və investisiya təşviqlərini nəzərdə tutur.

5. *İnsan kapitalı və innovasiyalar:* Təhsil və peşə hazırlığı sahəsində islahatlar, universitetlərin innovasiya mərkəzinə çevrilməsi, startap ekosisteminin inkişafı da əsas hədəflərdəndir.

Strateji tövsiyələr kimi investorlar üçün "bir pəncərə" prinsipi ilə xidmət sisteminin tətbiqi, iqtisadi zonalar üçün xüsusi vergi rejimləri və sığorta mexanizmlərinin yaradılması, Naxçıvanla Türkiyə və Orta Asiya arasında regional iqtisadi platformaların formalaşdırılması, investisiya layihələrinin maliyyə və texniki müşayiət xidmətləri ilə dəstəklənməsi və rəqəmsallaşma və e-hökumət xidmətlərinin genişləndirilməsi ilə bürokratiyanın azaldılması qeyd oluna bilər.

Yekun olaraq qeyd edilməlidir ki, Dövlət Proqramında nəzərdə tutulan tədbirlərin icrası yalnız resurs yönümlü yanaşma ilə deyil, strateji planlaşdırma və davamlı institusional islahatlarla müşayiət olunarsa, Naxçıvan regional iqtisadi mərkəzə çevrilə bilər.

## Nəticə

Naxçıvan Muxtar Respublikasının investisiya iqlimi və regional inkişaf potensialı bir sıra müsbət və eyni zamanda həll edilməli çağırışlarla müşayiət olunur. Regionun iqtisadi-coğrafi mövqeyi və zəngin təbii resursları onun investisiya cəlbediciliyinin əsas amillərindəndir. Lakin coğrafi təcrid, maliyyə məhdudiyyətləri və institusional çatışmazlıqlar investisiya mühitinin inkişafına maneə törədir.

Hazırkı vəziyyətdə dövlət tərəfindən qəbul edilmiş təşviq mexanizmləri, 2023-2027-ci illər sosial-iqtisadi inkişaf Dövlət Proqramı çərçivəsində həyata keçirilən tədbirlər Naxçıvanın investisiya iqliminin yaxşılaşdırılması istiqamətində mühüm addımlardır. Alternativ enerji, kənd təsərrüfatı, sənaye və turizm sahələrində perspektiv layihələr regionun iqtisadi inkişafına təkan verə bilər.

Gələcəkdə regionda investisiya mühitinin daha da gücləndirilməsi üçün aşağıdakı tövsiyələr xüsusi əhəmiyyət kəsb edir: İnstitusional şəffaflığın artırılması və hüquqi təminatların

möhkəmləndirilməsi; Rəqəmsallaşmanın sürətləndirilməsi və elektron xidmətlərin genişləndirilməsi; Xarici investorlar üçün "bir pəncərə" prinsipinin tətbiqi; Kadr potensialının artırılması məqsədilə təhsil və peşə hazırlığının gücləndirilməsi; Regional tranzit-logistika imkanlarının tam şəkildə reallaşdırılması. Bu tədbirlər Naxçıvanın iqtisadi inkişafını sürətləndirəcək, sərmayə axınını artıracaq və regionun dayanıqlı sosial-iqtisadi inkişafını təmin edəcəkdir.

## Ədəbiyyat

1. *Azərbaycan Respublikası Prezidentinin İnvestisiya Strategiyası.* (2019).
2. Azərbaycan Respublikası İqtisadiyyat Nazirliyi. (2023). *Azərbaycanın investisiya iqliminin təkmilləşdirilməsi üzrə illik hesabat.*
3. Azərbaycan Respublikası Prezidentinin İqtisadi Forumunun materialları (2023). *Regional inkişaf və investisiyaların yeni çağırışları.*
4. Əliyev, R. (2020). *Azərbaycanın regionlarında investisiya iqlimi: problemlər və perspektivlər.*
5. Əliyeva, N. (2017). Naxçıvanın iqtisadi potensialı və investisiya mühiti. *Azərbaycan İqtisadiyyat Jurnalı*, 3(5), s.78-89.
6. Əliyeva, G. (2018). Regional infrastrukturun investisiya cəlb etmə potensialı. *İqtisadi Təhlil və Proqnozlar Jurnalı*, 6(1), s.90-105.
7. Əliyev, F. (2023). Naxçıvanın iqtisadi inkişafında innovativ investisiya modelləri. *İqtisadiyyat və Texnologiya Jurnalı*, 11(2), s.75-90.
8. https://report.az/biznes-xeberleri/naxcivanda-sahibkarlarla-gorus-kecirilir/
9. İsmayılov, V. (2020). Naxçıvan Muxtar Respublikasında sənaye sektorunun inkişafı və investisiya perspektivləri. *İqtisadi İslahatlar Jurnalı*, 5(2), s.40-53.
10. Qurbanov, A. (2019). Naxçıvan iqtisadiyyatında yeni investisiya təşviq mexanizmləri. *İqtisadi İnkişaf Jurnalı*, 8(1), s.33-47.
11. Quliyev, S. (2023). Naxçıvanın sənaye sektorunda 2023-cü ilin investisiya trendləri. *İqtisadi Araşdırmalar Jurnalı*, 15(1), s.55-68.
12. Naxçıvan Muxtar Respublikası İqtisadiyyat Nazirliyi. (2023). *Naxçıvanın yeni investisiya təşviq mexanizmləri və tətbiq nəticələri.*
13. World Bank. (2024). *South Caucasus Economic Update: Investment Climate and Regional Growth.*

Daxil oldu: 18.03.2025
Qəbul edildi: 22.06.2025

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 6 / 88-94
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 6 / 88-94 e-ISSN: 2789-6919

DOI: https://doi.org/10.36719/2789-6919/46/88-94

**Искандар Самадов**
Каршинский Государственный Университет
докторант
https://orcid.org/0009-0002-1553-6505
iskandarsamadov9@gmail.com

# Ликвидация Хивинского ханства и образование Хорезмской Народной Советской Республики (ХНСР): анализ политико-правовых процессов

### Аннотация

В данной статье на основе исторических источников проанализирован процесс образования Хорезмской Народной Советской Республики (ХНСР) в результате политических преобразований, произошедших в Хивинском ханстве в начале XX века. Раскрыта политическая сущность движения младохивинцев, их реформаторская деятельность и содержание союзных договоров, заключённых с Советской Россией. Освещены противоречия между формальным суверенитетом ХНСР и её фактической политической зависимостью. Исследование показывает значение этих политических процессов в истории Центральной Азии на основе историко-аналитического подхода.

***Ключевые слова:*** *Хивинское ханство, Хорезмская Народная Советская Республика (ХНСР), младохивинцы, Джунаид-хан, революционное движение, политические реформы, Временное революционное правительство, союз ХНСР и РСФСР, хлопковая политика, Совет народных назиров, Всехорезмский курултай*

**İskəndər Səmədov**
Qarşi Dövlət Universiteti
doktorant
https://orcid.org/0009-0002-1553-6505
iskandarsamadov9@gmail.com

# Xivə xanlığının ləğvi və Xorəzm Xalq Sovet Respublikasının yaranması: siyasi-hüquqi proseslərin təhlili

### Xülasə

Bu məqalədə XX əsrin əvvəllərində Xivə xanlığında baş verən mühüm siyasi proseslər və onların nəticəsində Xorəzm Xalq Sovet Respublikasının (XXSR) yaradılması təhlil edilir. Fevral inqilabından sonra gənc xivəlilərin konstitusion islahatlar yolu ilə xanlıq sistemini dəyişdirmək cəhdləri və bu cəhdlərin uğursuzluqla nəticələnməsi araşdırılır. Məqalədə həmçinin Sovet Rusiyasının hərbi-siyasi müdaxiləsi ilə Xivə xanlığının devrilməsi və yeni sovet tipli respublikanın qurulması prosesi işıqlandırılır. XXSR-nin dövlət quruculuğu, RSFSR ilə imzalanan hərbi və iqtisadi müqavilələr, bu müqavilələrin respublikanın müstəqilliyinə təsiri kimi məsələlərə xüsusi diqqət yetirilmişdir. Tədqiqat XXSR-nin formal olaraq müstəqil dövlət kimi təqdim olunduğunu, lakin əslində Sovet nəzarəti altında fəaliyyət göstərdiyini göstərir.

***Açar sözlər:*** *Xivə xanlığı, Xorəzm Xalq Sovet Respublikası (XXSR), gənc xivəlilər, Cünəidxan, inqilabi hərəkat, siyasi islahatlar, Müvəqqəti İnqilab Komitəsi, RSFSR–XXSR ittifaqı, pambıq siyasəti, xalq nazirləri şurası, Bütunxorəzm qurultayı*

 Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

**Iskandar Samadov**
Karshi State University
PhD student
https://orcid.org/0009-0002-1553-6505
iskandarsamadov9@gmail.com

# The Abolition of the Khiva Khanate and the Establishment of the Khorezm People's Soviet Republic: An Analysis of Political and Legal Processes

## Abstract

This article analyzes the process of the establishment of the Khorezm People's Soviet Republic (KPSR) as a result of the political transformations in the Khiva Khanate at the beginning of the 20th century, based on historical sources. The study highlights the political nature of the young khivans' movement, their reformist activities and the content of the alliance agreements concluded with Soviet Russia. It also examines the contrast between the formal independence of the KPSR and its actual political dependence. Using a historical-analytical approach, the article explores the significance of these political developments in the broader context of Central Asian history.

***Keywords:*** *Khiva Khanate, Khorezm People's Soviet Republic (KPSR), Young Khivans, Junaid Khan, revolutionary movement, political reforms, Provisional Revolutionary Government, RSFSR–KPSR alliance, cotton policy, Council of People's Commissars, All-Khorezm Congress*

## Введение

В начале XX века революционные преобразования, произошедшие в Средней Азии, кардинально изменили и политическую судьбу Хивинского ханства. После революции 1917 года в России в регионе начался распад колониального режима, усилилось появление новых политических сил и активизировались стремления к созданию независимых государств. В Хорезме эти процессы проявились через движение младохивинцев. Они стремились реформировать ханский строй на конституционной основе, однако эти попытки были подавлены ханской властью. С помощью Советской России в 1920 году было объявлено о создании Хорезмской Народной Советской Республики (ХНСР). Несмотря на формальную независимость, новая республика фактически формировалась под контролем советской власти. Процесс образования ХНСР, её первоначальная политическая структура, а также заключённые с Советской Россией военные и экономические соглашения отражают всю сложность того исторического периода.

## Исследование

Февральская буржуазно-демократическая революция 1917 года в России, приведшая к свержению царской власти, оказала значительное влияние на социально-политическую жизнь Хивинского ханства. Это способствовало усилению политической активности, формированию представлений о реформах и распространению революционных идей на данной территории. Под влиянием революционных событий в России прогрессивные интеллектуалы Хивы — джадиды, то есть младохивинцы — подвергли резкой критике существующий деспотический ханский строй, рассматривая его как часть колониальной политики Российской империи. Объединившись вокруг идеи освобождения народа от политического, социального и духовного гнёта, они поставили перед собой цель внедрения конституционного управления, справедливой налоговой системы, современного образования и демократических реформ. После Февральской революции младохивинцы впервые открыто выступили против ханской власти. Они восприняли революционные перемены как историческую возможность для достижения независимости Хивы и проведения реформ, а также вели идеологическую борьбу против религиозного фанатизма и суеверий,

укоренившихся в обществе. Их деятельность сыграла важную роль в изменении политической атмосферы Хивы в послереволюционный период.

Во время февральской революции 1917 года в Петрограде, когда император Николай II был свергнут, Асфандияр-хан находился в Ялте. После начала революционных событий он вернулся в Ташкент, где встретился с генералом Куропаткиным, а затем вместе с военным отрядом под командованием генерала Мирбадалова вернулся в Хиву. 4 апреля 1917 года в городе Хива по инициативе младохивинцев состоялась массовая демонстрация, которая стала ярким проявлением усиливающегося политического давления в ханстве. Участники выступили с предложением создать Меджлис, ограничивающий власть хана, отстранить от должностей отдельных чиновников и внедрить политическую систему, ориентированную на интересы народа. Требования о реформах были оформлены в виде манифеста и переданы хану делегацией младохивинцев. 5 апреля Асфандияр-хан подписал манифест и официально огласил его на собрании. Учитывая свержение монархии в России и рост политической активности в Хиве, хан не смог отвергнуть требования младохивинцев.

После подписания манифеста 5 апреля 1917 года в Хивинском ханстве начались практические шаги по формированию конституционной монархии, пусть и на короткое время. Была создана структура под названием «Идораи машрута» (*орган народного представительства при дворе хана*), при дворе хана был учреждён Меджлис под председательством казикалона Бобо Охун Салимова и Совет назиров во главе с Хусаинбеком Матмурадовым. Первоначально в состав Меджлиса входили 30 человек, но по предложению Бобо Охуна Салимова он был расширен за счёт представителей туркмен, казахов и каракалпаков до 49 человек. Важные государственные должности заняли младохивинцы. Однако ханская власть воспринимала происходящее лишь как временный компромисс, и последующие события показали, что хан не был искренне привержен реформам.

В результате политических репрессий и подавления реформ доверие младохивинцев к хану было окончательно утрачено. Они были вынуждены перейти к открытому противостоянию с существующим деспотическим режимом. Однако для борьбы против ханской власти у них не было достаточных политических и военных ресурсов. Поэтому младохивинцы обратились за помощью к советским организациям, действовавшим в Туркестане и Амударьинском отделе, с просьбой содействовать проведению революционных преобразований в Хиве. Это обращение было с одобрением воспринято большевиками, которые уже планировали ликвидировать Хивинское ханство и создать на его месте новую республику на основе советской власти — Хорезмскую Народную Советскую Республику.

После Октябрьской революции 1917 года, когда большевики пришли к власти в России и в Туркестане была установлена советская власть, политическая ситуация между Хивинским ханством и Советской Россией резко обострилась. 5 января 1918 года полковник Зайцев вывел все размещённые в Хиве русские войска, чтобы направить их на борьбу против советской власти в Туркестане (История Узбекистана, 2019). Этот шаг лишил Асфандияр-хана его главной военной опоры. В сложившейся ситуации на политическую арену вышел Джунаид-хан — глава вооружённого юмудского племени. Осознав, что не в состоянии справиться с внутренним политическим кризисом, Асфандияр-хан 22 января 1918 года вызвал Джунаид-хана в столицу и назначил его командующим вооружёнными силами. С этого момента, хотя ханство формально управлялось от имени Асфандияр-хана, фактическая политическая власть перешла в руки Джунаид-хана. 30 сентября 1918 года Джунаид-хан совершил государственный переворот и сверг Асфандияр-хана. 1 октября, через своих сторонников, он организовал убийство Асфандияр-хана в его дворце. 3 октября на ханский трон был посажен брат Асфандияр-хана — Саид Абдулла, который вскоре превратился в марионеточного правителя в руках Джунаид-хана.

В 1918-1920 годах Хивинское ханство находилось под прямым военно-политическим давлением со стороны руководства Советской России и Туркестана. Ещё во время завоевательной политики Российской империи территория Тюрткуля, расположенная на

правом берегу Амударьи, была отторгнута от Хивинского ханства и включена в состав Туркестанского генерал-губернаторства. Впоследствии судьба этого региона стала одним из острых вопросов в отношениях между Хивинским ханством и советским руководством. Хивинский хан направил обращение в адрес советских властей с требованием восстановить контроль над Тюрткюлем и прилегающими землями. В течение двух лет, пока Хивинское ханство существовало как формально независимое государство (с января 1918 года по январь 1920 года), Джунаид-хан фактически осуществлял руководство страной. Он жестоко подавлял любые выступления против своей власти. 25 ноября 1918 года войска Джунаид-хана атаковали Тюрткюль, однако, столкнувшись с сопротивлением советских вооружённых сил, понесли поражение, и наступление завершилось неудачей.

Советская Россия стремилась воспользоваться внутренними политическими противоречиями в Хивинском ханстве. В ноябре 1919 года был создан революционный комитет (ревком), в который вошли большевики, младохивинцы и представители туркменских племён, соперничавших с Джунаид-ханом. Их целью было свержение ханской власти и установление новой системы управления. Правительство РСФСР представило этот процесс как «помощь восставшему народу» и инициировало прямое военное вмешательство через Туркестанскую комиссию. В советской историографии подчёркивается, что до входа Красной армии в Хиву председатель Амударьинского ревкома обратился к населению Хорезма с дружеским воззванием. Однако исторические источники свидетельствуют, что это воззвание было опубликовано лишь 7 февраля 1920 года — уже после свержения хана. А 8 февраля оно было напечатано на страницах газеты «Известия Туркестанского ЦИК» как обращение революционного комитета младохивинцев к рабочим и крестьянам РСФСР.

В декабре 1919 года советские войска вторглись на территорию Хивы с двух направлений: северный отряд под командованием Н.Шайдакова и южный отряд под руководством Н.Щербакова. Местные повстанческие силы, включая младохивинцев и коммунистов, поддержали их наступление. В январе 1920 года советские войска заняли территории Куня-Ургенча, Порсу, Ямингкалы, Ильялы и Ташауза, а 1 февраля вошли в Хиву. На следующий день, 2 февраля, Саид Абдуллахан отрёкся от престола, и вся власть перешла к Временному революционному комитету.

Временный революционный комитет собирался не менее двух раз в неделю, рассматривая и обсуждая наиболее важные вопросы. В течение двух месяцев этот комитет официально исполнял функции как законодательной, так и исполнительной власти. Однако на практике руководители правительства занимались лишь снабжением войск, полностью утратив политическую самостоятельность.

В период деятельности Временного революционного комитета были приняты такие декреты, как «О конфискации имущества хана», «О регулировании вакуфных земель», «О ликвидации ростовщических операций» и «О введении судебных пошлин и оплате труда судей». В результате этих мер имущество хана Хивы и его чиновников было конфисковано и передано в распоряжение государства. В этот же период в Хорезме были инициированы экономические и культурные преобразования. По линии РСФСР был выделен кредит в размере 40 миллионов сумов, начат выпуск национальной валюты, строительство четырёх мостов, очистка ирригационных каналов, а также издание газеты «Инқилоб куюши» («Солнце революции»), что отражает первые шаги власти в сфере экономических и духовных реформ.

В указанный период Временное революционное правительство не только инициировало экономическое и культурное строительство, но и предприняло важные шаги по формированию политической системы. В частности, началась подготовка к созыву I Всехорезмского курултая народных представителей. В процессе подготовки курултая особое значение имела деятельность Г. И. Бройдо — руководителя специальной миссии, прибывшей 25 марта 1920 года в Хиву от имени РСФСР и Туркестанской республики для поздравления

Временного революционного правительства, а впоследствии — полномочного представителя РСФСР в Хорезмской Народной Советской Республике.

Младохивинские джадиды стремились построить демократическую республику на месте свергнутого ханского режима в Хорезме. Важным историческим событием в формировании основ нового государства стал I Всехорезмский съезд народных представителей, состоявшийся в Хиве 26–30 апреля 1920 года. На съезде было объявлено о ликвидации Хивинского ханства (Хамдамов, 1960), восстановлено древнее название страны — Хорезм, а новое государство получило название Хорезмская Народная Советская Республика (ХНСР). Одновременно съезд утвердил первую конституцию ХНСР, а также государственный герб и флаг.

На съезде была сформирована молодая республиканская власть — Хорезмский Народный Совет Назиров, состоявший из 15 человек (Гордиенко, 1959). Процесс избрания делегатов на I Всехорезмский курултай проходил в относительно открытой и демократичной обстановке. Представители были избраны из различных слоёв населения, социальных групп и политических течений, что обеспечило многонациональный и политически разнообразный состав правительства ХНСР. В новом составе правительства было 15 назиров: 9 узбеков, 5 туркмен и 1 татарин. Этот факт свидетельствует о соблюдении принципа национального представительства в структуре власти.

Поскольку в первом правительстве Хорезмской Народной Советской Республики (ХНСР) основную роль играли джадиды, его нередко называли «правительством младохивинцев». Несмотря на то, что младохивинцы пришли к власти при поддержке Красной армии и большевиков, они решительно стремились ликвидировать пережитки ханского режима, утвердить демократический строй и построить независимое хорезмское государство. Именно поэтому официальные круги Советской России — в том числе представители Туркестанской комиссии и Туркестанского фронта — выступили против стремления младохивинцев к самостоятельной политике, пытаясь ограничить их деятельность и направить политико-экономические процессы в стране в соответствии со своими интересами.

13 сентября 1920 года в Москве был подписан двусторонний договор между Хорезмской Народной Советской Республикой (ХНСР) и Российской Советской Федеративной Социалистической Республикой (РСФСР). В состав этих документов вошли политический союзный договор, состоявший из 24 статей, экономическое соглашение из 15 статей, а также отдельное военно-политическое соглашение. Согласно договору, РСФСР официально признала независимость и неприкосновенность ХНСР. Все банки, заводы, фабрики, торговые предприятия и прочее имущество, построенное русскими капиталистами на территории Хивинского ханства в период Российской империи, были зафиксированы как собственность ХНСР. Также граница, существовавшая на 13 сентября 1920 года, была признана государственной, и предусматривалась установка пограничных знаков на соответствующих участках.

На основании статьи 17 договора было составлено военно-политическое соглашение, согласно которому Хорезмская Красная Армия подлежала формированию под эгидой РСФСР (История Хорезма, 1997). Кроме того, отдельные статьи регулировали права граждан ХНСР и РСФСР на проживание, передвижение, владение имуществом и гражданский статус на территории друг друга. Настоящий договор был утверждён на сессии Центрального Исполнительного Комитета РСФСР 29 сентября 1920 года и Советом назиров ХНСР 26 октября 1920 года.

Данный договор, включавший принципы равенства и дружбы в военной и политической сферах, формально способствовал укреплению авторитета РСФСР среди народов Востока, однако на практике превратился в инструмент ограничения суверенитета ХНСР. Согласно положениям экономического соглашения, «на основе взаимных обязательств сторон о поддержке друг друга», Хорезмская Республика была обязана передавать РСФСР все

излишки сырья, превышающие её внутренние потребности (Кушжонов, Полвонов, 2007). В первую очередь речь шла о хлопковом сырье и производимых из него изделиях, а также о мехах, коврах, кожаных изделиях, шерсти, семенах и других ценностях, подлежавших передаче в распоряжение России.

В результате ХНСР была лишена права на ведение свободной торговли с другими государствами, а её экономическая деятельность оказалась жёстко привязанной к интересам России (Маткаримов, 1993). На основе этих юридических договорённостей Советская Россия укрепила своё военное присутствие на территории Хорезма, разместив значительное количество частей Красной армии, и начала активно вмешиваться во внутреннюю политику республики.

**Заключение**

В результате политических событий, произошедших в начале XX века в Хивинском ханстве, была ликвидирована традиционная ханская система управления, на смену которой пришла республика, внешне независимая, но фактически находившаяся под контролем советской власти. Под влиянием революционных изменений в России на политическую арену вышли младохивинцы, стремившиеся реформировать ханский строй путём конституционных преобразований. Однако их реформаторская деятельность была воспринята ханом и его окружением как политическая угроза и была подавлена с применением военной силы и репрессий: лидеры движения были арестованы или сосланы. Несмотря на это, при военно-политической поддержке Советской России ханская власть была свергнута, и в 1920 году была провозглашена Хорезмская Народная Советская Республика (Машарипов, 2010; Раджабов, 2024). Формирование республиканских структур, принятие конституции, утверждение государственных символов и создание правительства на основе принципа национального представительства ознаменовали начало нового этапа государственности в регионе. Хотя в заключённых с РСФСР договорах Хорезмская Народная Советская Республика была официально признана равноправным и независимым государством, на практике её юридический суверенитет подвергался серьёзным ограничениям. Экономические ресурсы Хорезма, в частности хлопок и другое сырьё, были направлены на удовлетворение потребностей России, а постоянное размещение частей Красной Армии мешало реализации политического суверенитета. Таким образом, движение, начавшееся с идеи построения демократической республики, в конечном итоге привело к формированию режима, соответствующего советской модели — формально независимого во внешней политике, но находящегося под давлением во внутренней.

## Литература

1. 50 лет Хорезмской народной советской революции. (1970). *Материалы объединённой научной сессии*. 3-4 декабря.
2. Гордиенко, А.А. (1959). *Создание народно-советского государства и права и их революционно-преобразующая роль в Хорезме и Бухаре.* Издательство САГУ.
3. *История Узбекистана (1917-1991 годы).* (2019). В двух книгах. Книга первая: 1917-1939 годы. Отв. ред.: Р.Абдуллаев, М.Рахимов, К.Раджабов. Издательство «Узбекистон».
4. *История Узбекистана.* (2023). Том XI: История Хорезма. Издательство «Узбекистон».
5. *История Хорезма.* (1997). Том II. Отв. ред. М. Матниязов. Издательство «Хорезм».
6. *История Хорезмской Народной Советской Республики (1920-1924 гг.).* (1976). Сборник документов. Фан.
7. Кушжонов, О., Полвонов, Н. (2007). *Социально-политические процессы и движения в Хорезме (вторая половина XIX – первая четверть XX века).* Abu matbuot-konsalt.
8. Маткаримов, М. (1993). *Хорезмская Республика: государственное устройство, народные комиссары и экономика.* Хорезм.
9. Машарипов, О. (2010). *Хоразмнома. Книга IV: Хорезмская Народная Республика.* Хорезм.

10. Непесов, Г. (1962). *Из истории Хорезмской революции (1920–1924 гг.).* Государственное издательство Узбекской ССР.
11. Полвонов, Н. (2011). *История социальных движений и политических партий в Хорезме (1900–1924 гг.).* Академнашр.
12. Раджабов, К. (2024). *Узбекистан в XX веке. Том первый (1900–1939 гг.).* Фан.
13. Хамдамов, Х. (1960). *Свержение Хивинского ханства и образование Хорезмской Народной Советской Республики.* Уздавнашр.

Поступило: 07.03.2025
Принято: 11.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/95-102

**Vüsal Hüseynov**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0008-8362-3639
vusalhuseynov@ndu.edu.az

# Elmi araşdırma məqalələrində riayət olunmalı əsas prinsiplər

## Xülasə

Elmi tədqiqatlar hər hansı bir problemin ortaya çıxarılması və onun ümumbəşəri elmi metodlarla araşdırılması, təhlil edilməsi və qiymətləndirilməsidir. Hər hansı bir elm sahəsində elmi tədqiqat həyata keçirmək tədqiqatçıların müəyyən qayda və prinsiplərə riayət etmələrini tələb edir. Tədqiqatın mövzusunun necə müəyyən olunması, o sahəyə aid ədəbiyyat icmalının necə yerinə yetirilməsi, tədqiqatın dizaynı (metodologiya), dataların necə toplanması, analizi, şərh edilməsi və tədqiqat nəticələrinin hesabat şəklində təqdim olunmasının qayda və prinsiplərinin öyrənilməsi xüsusən tədiqiqatçılar üçün faydalıdır.

Tədqiqat işlərinin elmi çərçivədə yerinə yetirilməməsi, eyni zamanda elmi araşdırma məqalələrinin nüfuzlu beynəlxalq jurnalların standartlarına uyğun gəlməməsi bu mövzudakı mərhəllə və prinsiplərin öyrənilməsini tələb edir. Müşahidələrimizdə qarşılaşdığımız əsas problemlər də məhz elmi tədqiqat mövzularının adlarınının düzgün seçilməməsi və ya beynəlxalq səviyyədə diqqətçəkici və aktual olmaması eyni zamanda, elmi araşdırmanın təməl prinsiplərinə əməl edilməməsi ilə bağlıdır. Elmi tədqiqatların ümumi strukturu və bu prosesdə izlənilən addımların mahiyyətindən bəhs edən bu məqalə xüsusən gənc tədqiqatçılara öz araşdırmalarını yerinə yetirməzdən əvvəl və araşdırma prosesi boyunca önəmli yolgöstərici məlumatlardan bəhs edir.

***Açar sözlər:*** *elmi tədqiqat, elmi məqalə, tədqiqat metodları, elmi tədqiqat prinsipləri*

**Vusal Huseynov**
Nakhchivan State University
https://orcid.org/0009-0008-8362-3639
vusalhuseynov@ndu.edu.az

# Main Principles that should be Followed in Scientific Research Articles

## Abstract

Scientific research is the identification of a problem and its investigation, analysis and evaluation using universal scientific methods. Conducting scientific research in any field of science requires researchers to adhere to certain rules and principles. Studying the rules and principles that how to determine a research topic, conducting a literature review in related field, how to choose research design (methodology), how to do data collection, analysis, interpretation and reporting research results are especially useful for young researchers.

The failure to conduct research within a scientific framework, as well as the failure of scientific research articles to meet the standards of reputable international journals, requires the study of the stages and principles in this regard. The main problems we encountered in our observations are precisely the incorrect selection of the names of scientific research topics or their lack of remarkable and relevance at an international level, as well as the failure to adhere to the basic principles of scientific research. This article, which discusses the general structure of scientific research and the essence of the steps followed in this process, provides important guiding information, especially for young researchers, before and throughout the research process.

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

***Keywords:*** *scientific research, scientific article, research methods, scientific research principles*

## Giriş

Elmi araşdırma (tədqiqat) məqalələri elmi biliklərin istehsalı və yayılmasında tədqiqatçılar tərəfindən ən çox istifadə edilən elmi ünsiyyət vasitələridir. Elm adamları elmi biliklərin istehsalında elmi üsul və üsullardan istifadə edirlər. Bu prosesə tədqiqat aparmaq üçün müəyyən addımlar daxildir. Tədqiqat addımları bir-birindən ayrılmasa da bəzən addımlar arasında yenidən qiymətləndirmə tələb edən interaktiv bir prosesdir. Elmi tədqiqat proseslərində növünə görə (kəmiyyət və ya keyfiyyət) bəzi fərqlər olsa da, onlar əsasən, aşağıdakı ümumi addımlardan ibarətdir (Neuman, 2006).

1. Araşdırma probleminin adlandırılması (seçilməsi);
2. Ədəbiyyat icmalı;
3. Araşdırmanın dizayn edilməsi;
4. Dataların (işlənməmiş xam məlumatlar) toplanması;
5. Dataların analiz edilməsi;
6. Analiz nəticələrinin (findings) şərhi;
7. Araşdırma hesabatının yazılması və paylaşılması.

Tədqiqatçının maraq dairəsinə uyğun olaraq üzərində dayandığı tədqiqat işi mövzu və başlığın seçilməsi ilə başlayır. Tədqiqat sualı ilə məhdudlaşan bu proses problemin həllində istifadə olunan elmi metodun özünü müəyyən edir (Neuman, 2006; Karasar, 2012; Punch, 2005). Elmi metod isə etibarlı dataların (məlumatların) əldə edilməsi, onların şərh edilməsi və ümumiləşdirilməsi üzrə addımları təşkil edən bir sıra standart üsullardır. Elmi metodun dörd əsas xüsusiyyəti aşağıda verilmişdir (Bhattacherjee, 2012)

- ✓ Məntiqlidir: elmi nəticələr mülahizələrin məntiqi prinsiplərinə əsaslanmalıdır.
- ✓ Doğrulana biləndir: çıxarılan nəticələr müşahidə olunan sübutlara uyğun olmalıdır.
- ✓ Təkrarlana biləndir: digər elm adamları elmi araşdırmanı müstəqil surətdə genişləndirə bilməli, və ya təkrarlaya bilməlidir və həmin tədqiqatla eyni (əmsal) olmasa da oxşar nəticələr əldə edə bilməlidirlər.
- ✓ Nəzərdən keçirilə biləndir: istifadə olunan prosedurlar və əldə edilmiş nəticələr digər elm adamları tərəfindən edilən tənqidi təhlilə əsaslanmalıdır.

Tədqiqat aparılarkən tədqiqatın məqsədindən asılı olaraq müəyyən nəticələrə nail olmaq üçün aşağıdakı üç yanaşmadan istifadə olunur (Adams, Raeside, Khan, 2014; Bhattacherjee, 2012).

1. Kəşfiyyat xarakterli araşdırma (Exploratory resarch): yeni tədqiqat sahələrində faktların, davranışların və problemlərin məzmununu, prosesini və mahiyyətini anlamaq, həmin sahə haqqında ilkin məlumat əldə etmək, nəzəriyyələr yaratmaq və sınaqdan keçirmək və ilkin fikirlər yaratmaq üçün aparılır.

2. Təsviri araşdırma (Descriptive research): faktları adlandırmağı qarşısına məqsəd qoyan bu proses ətraflı elmi müşahidə və araşdırma tələb edir. Tədqiqat mövcud vəziyyəti ortaya çıxarsa da, əvvəl və sonrakı müqayisələr aparmaq kimi imkanlar təqdim edir. Ona görə də mövcud məlumatların analizi həm də tənqidi qiymətləndirmə etməyə də imkan verir.

3. İzahedici araşdırma (Explanatory research): müşahidələr nəticəsində əldə edilən datalar (məlumatlar) hadisələrin, problemlərin və davranışların izahını verir. Bunu edərkən harada, nə vaxt, niyə və necə kimi suallarıma da cavab axtarılır.

Tədqiqat üçün hansı metoddan istifadə olunmasından asılı olmayaraq, bütün prosesləri akademik dürüstlüklə həyata keçirmək son dərəcə vacibdir.

Tədqiqat prosesləri ilə bağlı yeddi addım aşağıda izah olunur (Adams, Raeside, Khan, 2014; Bhattacherjee, 2012; Karasar, 2012; Neuman, 2006).

1. *Tədqiqat probleminin müəyyən edilməsi*: tədqiqatın əsasını təşkil edən problemlə bağlı cavab axtardığımız sualı (və ya sualları) və hipotez (və ya hipotezləri) yaratdığımız prosesi ifadə edir. Burada tədqiqatçı araşdırmanın səbəbləri ilə bağlı izahat verir. Problemə təsir edəcəyi düşünülən

dəyişənlər (asılı, müstəqil) arasındakı əlaqələr müəyyən edilərək tədqiqatın məqsədi aydınlaşdırılmağa çalışır. Problemin başa düşülən şəkildə adlandırılması, bir abzasda sadə cümlə şəklində və ya sual formalarında verilə bilər. Hansı istifadə olunursa olunsun, önəmli olan odur ki, araşdırılan iş mütəxəssisi olduğunuz və maraqlandığınız bir sahəyə aid olsun. Tədqiq edilə bilən (informasiya mənbələrinə və tədqiqat səriştələrinə malik olmaq, datalara əlçatanlıq, vaxt və xərc yetərliliyi və s. araşdırma etməyə dəyən (tədqiqatçı və cəmiyyət üçün) bir problem olmasıdır.

**Tədqiqat**

Tədqiqata başlamazdan əvvəl tədqiqatçı nəyi təhlil (tədqiq) edəcəyi barədə təsəvvürə malik olmalı, nə haqqında məlumat toplayacağını bilməli və onu adlandırmalıdır. Bu adlandırma tədqiqatın mövzusunu təşkil edir (Robson, 2003). Tədqiq olunacaq mövzu tamamilə tədqiqatçının elmi marağından və məqsədindən asılıdır. Tədqiqat mövzusu tədqiqatçının şəxsi təcrübələrindən, digər tədqiqatçıların əvvəlki araşdırmalarından, KİV-lərdən, nəzəriyyələrdən, inanclardan və dəyərlərdən təsirlənərək seçilə bilər. Eyni zamanda öz elmi fəaliyyət sahəsi ilə əlaqəli hər hansı problemin həll edilməsi məqsədilə də tədqiqat mövzusu seçmək mümkündür. Əslində effektli və təqdirəlayiq elmi məqalənin mövzusunun məhz ümumbəşər problem(lər)inin həllinə töhfə verən keyfiyyətdə olmağı onun nüfuzlu benəlxalq elmi jurnallarda nəşri üçün üstünlük təşkil edir. Tədqiqatçılar bu müxtəlif mənbələrdən öz mövzularını seçərkən, digər tədqiqatçıların vacib bildikləri və etibar etdikləri məsələlər, aktual sosial problemlər, mövcud maliyyə və kadr resursları kimi müxtəlif amilləri nəzərə alırlar (Bouchrika, 2025).

Tədqiqat mövzusunu seçərkən, tədqiqatın praktiki cəhətdən tətbiq oluna biləcəyinə diqqət yetirilməlidir. Tədqiqat mövzusu yalnız maraqlı olduğuna görə deyil, həm də müxtəlif cəhətlərdən tədqiq oluna bilən olmasına görə seçilməlidir. Məsələn; “sahibkarların problemləri və həlli yolları” adlı bir tədqiqat mövzusu maraqlı ola bilər, lakin dataların toplanması baxımından bir çox çətinlikləri ehtiva etdiyi üçün bu tədqiqatın tətbiq olunma səviyyəsi kifayət qədər aşağıdır. Tədqiqat mövzusu seçərkən diqqət yetirilməli olan digər məqam mövzunun genişliyidir. Tədqiqat mövzusu tədqiqat probleminə çevrildiyi üçün daraldılacaq, lakin mövzu çox genişdirsə, uyğun tədqiqat problemi hazırlamaq çox çətin olacaq. Məsələn, “məşğulluq” və ya “narkotik maddə asılılığı” tədqiqat mövzusu ola bilməyəcək qədər geniş ifadələrdir. Buna görə də tədqiqat mövzusunu daraltmaq üçün maraq göstərilən mövzusunun kimlərlə bağlı olduğu, hansı yer və ya coğrafi əraziyə, hansı zamana, hansı mədəniyyətə, hansı tədqiqat ana kütləsinə (population) aid olduğu bildirilə bilər. Məsələn, “qadınların özəl sektorda məşğulluğu”, “məşğulluq şəraitinin iş məmnunluğuna təsiri”, “gənclər arasında narkotik maddə asılılığı”, “məişət zorakılığının narkotik maddə asılılığına təsiri” kimi ifadələr tədqiqat mövzularına daha uyğundur. Tədqiqat mövzuları cinsiyyətə, yerləşdiyi yerə (coğrafi rayon, kənd-şəhər və s.), yaşa (uşaq-gənc-orta yaşlı-qoca və s.), zamana (2000-ci ildən sonra, 2020-2025-ci illər arası və s.), sosial təbəqələrə (ixtisassız işçi, ixtisaslı işçi, dövlət qulluqçusu, məmur və s.) görə daraldıla bilər. Eyni zamanda tədqiqat mövzusunun orijinal və aydın olmasına diqqət etməliyik. Lakin unutmamalıyıq ki, tədqiqat mövzusu olaraq müəyyən etdiyimiz ifadə hələ elmi cəhətdən sınaqdan keçirilməyə hazır deyil, bu sadəcə bizim üçün tədqiqat prosesi boyunca önəmli yol göstəricidir (Theofanidis, Fountouki, 2019).

Tədqiqat probleminin ifadəsi tədqiqatın növünə və istifadə olunacaq metoda görə dəyişir. Səbəb əlaqəsini izah etməyə yönəlmiş kəmiyyət tədqiqatlarında tədqiqat problemi hipotez(lər)in sual cümləsinə çevrilməsi ilə ifadə edilir. Keyfiyyət tədqiqatlarında isə tədqiqat problemi sual cümləsi kimi də ifadə edilir, lakin problem tədqiqat prosesinin sonrakı mərhələlərində dəyişdirilə bilən elastik şəkildə qurulur. Keyfiyyət tədqiqatları ümumiyyətlə kəşfiyyat xarakterli və hipotez ortaya çıxarmağa istiqamətlənmiş tədqiqatlardır. Buna görə də, tədqiqat problemləri tədqiqatçıya müəyyən bir mövzunun dərindən başa düşülməsi üçün mümkün qədər çox elastiklik və sərbəstlik təklif edən şəkildə yaradılır. Keyfiyyət tədqiqatlarında tədqiqat problemi öyrəniləcək mövzunu adlandırır və tədqiqatçının bu mövzunun hansı aspekti ilə maraqlandığını ifadə edir (Corbin, Strauss, 2008).

2. *Ədəbiyyat icmalı*: ədəbiyyat icmalı müəyyən mövzu üzrə əvvəlki tədqiqatlardan əldə edilmiş məlumatların tədqiqi, onun mühüm məqamlarının nəzərdən keçirilməsi və xülasələşdirilməsidir. Tədqiqat problemini müəyyən etməzdən əvvəl tədqiqatçı ilkin ədəbiyyata baxış keçirir. Buna ön

ədəbiyyat icmalı deyilir. Tədqiqat problemini müəyyən etdikdən sonra isə müvafiq ədəbiyyatlar ətraflı araşdırılır, tədqiqat problemi yenidən nəzərdən keçirilir və müvafiq ədəbiyyatla əlaqələndirilir. Müvafiq ədəbiyyatı nəzərdən keçirmək tədqiqat mövzusunun əvvəllər edilib-edilmədiyini və əgər varsa, nə edildiyini anlamaq üçün son dərəcə vacibdir. Bu məqam cavabını bilməli olduğumuz digər suallara cavab verməyə imkan verir. Məsələn, mövzu ilə bağlı mütəxəssislərin kimlər olduğunu, nəzəri baxış bucaqlarını (yanaşmaları), istifadə edilən ortaq araşdırma üsullarını, tədqiqatların tapıntıları (findings), araşdırma suallarını, mövzu ilə bağlı müzakirələri və məlumat boşluqlarının nə olduğunu öyrənməyin yeganə yolu mövzu ilə bağlı nəşrləri oxumaqdır. Yaxşı hazırlanmış ədəbiyyat araşdırması əvvəllər cavablandırılmış tədqiqat suallarının təkrarlanmasının qarşısını alır. Bundan əlavə, araşdırmanın məntiqi şəkildə problemə uyğun gələn nəzəri infrastrukturun yaradılmasına imkan verir. Tədqiqatın nəzəri cəhətdən düzgün əsaslandırılması üçün ədəbiyyat icmalının problemlə əlaqəli nəzəriyyə haqqında məlumatları əks etdirməsi önəmli elementdir. Eyni zamanda, ədəbiyyat icmal edilərək ətraflı təhlili aparılmış mövzunun kəşf edilməmiş cəhətləri, mövzunun innovativ şəkildə tədqiq olunması və aktual xarakterdə olması üçün tədqiqatçıya ilham mənbəyi və ya yol göstərici olacaqdır (Chigbu, Atiku, Du Plessis, 2023).

Yaxşı ədəbiyyat icmalı:

- Hazırlanan tədqiqat problemi ilə bilavasitə əlaqəli olmalı və bu problem ətrafında təşkilatlanmalıdır;
- Tədqiqat problemi ilə bağlı bütün müvafiq tədqiqatları əhatə etməli və aidiyyəti olmayan tədqiqatları ehtiva etməməlidir,
- Mənbələr akademik olmayan jurnal, qəzetlərdən deyil, akademik (elmi) nəşrlərdən ibarət olmalıdır;
- Müxtəlif növ mənbələrdən istifadə oluna bilər, lakin mənbələrin əksəriyyətinin internet mənbələri olmamasına diqqət edilməlidir;
- Sadəcə sadalamaq və ümumiləşdirməkdən ibarət olmamalı, ədəbiyyatdakı rəy və analiz nəticələrinin güclü və zəif tərəflərini göstərərək qiymətləndirə bilməlidir;
- Mövzu ilə bağlı bilinən və bilinməyənlərin nələr olduğunu ümumiləşdirən (xülasə halına gətirən) sintez yarada bilməlidir;
- Müvafiq ədəbiyyatda mübahisəli sahələri (konsensus olmayan )göstərə bilməlidir;
- Oxunan mətnlər çox sitat gətirmədən ümumiləşdirilməli və tədqiqatçının öz sözləri ilə şərh edilməlidir;
- Mövzu ilə bağlı əlavə araşdırma tələb edən vacib suallar yarada bilməlidir;
- Eyni zamanda aparılacaq tədqiqatın tədqiqat mövzusu üzrə mövcud bilikləri zənginləşdirəcəyini nümayiş etdirməsi lazımdır.

Tədqiqat mövzusu ilə əlaqədar kifayət qədər icmal edilmədikdə tədqiqatçı bir çox önəmli nəzəri və praktiki biliklərdən məhrum qala bilər və edəcəyi tədqiqatın qiymətləndirilməsi zamanı mənfi təəssurat bağışlaya bilər.

3. *Tədqiqatın dizaynı*: indiyə qədər araşdırılan addımlar nəzərə alınaraq, tədqiqat suallarına cavab tapmağı təmin edəcək ən uyğun üsul müəyyən edilir. Bu vəziyyət tədqiqatın kəmiyyət, keyfiyyət və ya onların birlikdə istifadə edilməsi üçün uyğun olan müxtəlif strategiyaları ehtiva edir. Metodla bağlı verilən bu qərar nümunə kütlənin (sampling) seçiminin dizaynına da təsir edir. Metodlar ən yaxşı dataları toplamaq üçün planlaşdırıldığı halda, məlumat növlərindəki fərqlər ölçmə prosesinin fərqli planlaşdırılmasına səbəb olur. Ölçmə prosesində konseptuallaşdırma bizə mücərrəd nəzəri strukturların anlayışlar (konseptlər) vasitəsilə konkretləşdirilərək necə ölçüləcəyini müəyyən etməyə imkan verir. Bu prosesdə tədqiqat metodu kəmiyyətdirsə, anket sorğuları, ölçmə şkalaları və testlər keyfiyyət tədqiqatı olarsa müşahidə, müsahibə və sənədlərin təhlili üsullarına qərar verilir və nümunə kütləni seçmə strategiyası müəyyən edilir. Tədqiq ediləcək tədqiqat sualları, test ediləcək hipotezlər, istifadə olunacaq nəzəriyyələr, metod, nümunə kütləni seçmə strategiyası dataların toplanmasına başlamazdan əvvəl alınacaq əks əlaqələrlə (testlər kimi) ilə kritik bir mərhələni təşkil edir. Bundan əlavə, bu mərhələdə lazimi etik icazələr tamamlanmalıdır.

Tədqiqat metodu tədqiqatın məqsədinə və suallarına cavab verəcək ən yaxşı metodun seçilməsi prinsipinə əsaslanır. Bu nöqtədə, tədqiqatın tətbiqi praktikaları üçün, pozitivist prinsiplərə əsaslanan, xətti tədqiqat yolunu izləyən və dəyişənləri ölçən kəmiyyət tədqiqatları şərhedici və tənqidi yanaşma ilə qeyri-xətti tədqiqat yolunu izləyən metodu ifadə edən keyfiyyət tədqiqatı (qualitative research) və hər iki metodun birlikdə istifadə edildiyi qarışıq tipli (mixed type) yanaşmalar mövcuddur (Neuman, 2006; Punch, 2006; Adams, Raeside, Khan, 2014; Bhattacherjee, 2012). Kəmiyyət və keyfiyyət tədqiqat yanaşmaları arasındakı əsas fərqlər cədvəl 1-də göstərilmişdir.

**Cədvəl 1**: Kəmiyyət və keyfiyyət tədqiqatları arasındakı fərqlər

| Keyfiyyət tədqiqatları | Kəmiyyət tədqiqatları |
|---|---|
| Tədqiqata başlayarkən tədqiqatçı tərəfindən yaradılan hipotezi test edir. | Datalar tədqiq olunduqca onların mənası müəyyən olunur və aşkar edilir. |
| Konsepsiyalar müxtəlif dəyişənlər şəklindədir. | Konsepsiyalar mövzular, motivlər, ümumiləşdirmələr və taksonomiyalar şəklindədir. |
| Kriteriayalar datalar toplanmaya başlamazdan əvvəl sistematik şəkildə yaradılır və standartlaşdırılır. | Kriteriyalar xüsusi olaraq yaradılır və çox vaxt yalnız bir şəraitə və ya tədqiqatçıya xasdır. |
| Datalar sənədlərdən, müşahidələrdən və transkripsiya edilmiş söhbətlərdən ibarət sözlər və təsvirlər şəklindədir. | Datalar dəqiq (mütləq) ölçmələrdən əldə edilən rəqəmlər şəklindədir. |
| Nəzəriyyə əsasən səbəb xarakter daşıyır və deduktivdir. | Nəzəriyyə səbəb xarakterli ola bilər və ya olmaya bilər və adətən induktivdir. |
| Prosedurlar standartdır və təkrarlamağa tez tez rastlanır. | Tədqiqat prosedurları spesifikdir və təkrarlanma nadirdir. |
| Təhlil statistikadan, cədvəllərdən və ya diaqramlardan istifadə etməklə və onların göstərdiklərinin hipotezlərlə necə əlaqəli olduğunu müzakirə etməklə davam etdirilir. | Təhlil sübutlardan mövzular və ya ümumiləşdirmələr çıxarmaqla və dataları bir biri ilə uyğun gələn, başa düşülən mənzərə yaradacaq şəkildə təşkil etməklə davam etdirilir. |

(Neuman, 2006)

Tədqiqat prosesləri hər iki tədqiqat növü (keyfiyyət və kəmiyyət) üçün ümumi addımlarla verilsə də, aralarındakı fərqləri nəzərə almaq lazımdır. Bununla belə, ümumi çərçivənin cızıldığını unutmaq olmaz.

4. *Dataların toplanması*: datalar tədqiqatın nümunə kütləsinə uyğun olaraq kəmiyyət və keyfiyyət yanaşmaları ilə toplanır. Tədqiqatçı dataların mənbəyinə (insanlar, sənədlər və s.) uyğun olaraq müvafiq üsullardan istifadə edərək lazımi məlumatları toplayır. Tədqiqat sualları və datalar arasındakı əlaqəyə uyğun olaraq təyin olunan ölçmə üsulu ilə proses tamamlanır. Etibarlı və həqiqi olan ölçmə üsulunun istifadəsi hər iki yanaşma üçün vacibdir (Taherdoost, 2021).

5. *Dataların təhlili*: sübutlara əsaslanaraq nəticə çıxaracağımız bu proses hər iki yanaşma üçün dataların diqqətlə araşdırılmasını tələb edir. Datanın miqdarı və keyfiyyəti vacib olsa da, düzgün analiz vasitəsi və üsulu bizi real və dəqiq nəticələrə aparacaqdır. Tədqiqatçı dataları necə təhlil etməyi bilməlidir və bunu əvvəldən planlaşdırmalıdır.

6. *Dataları şərh etmək*: toplanmış datalar tədqiqat suallarına cavab vermək və hipotezləri qəbul etmək və ya rədd etmək üçün şərh olunur. Bu addım tədqiqatın elmi metodlarla toplanan etibarlı datalarla, obyektiv qiymətləndirmə və şərhlərlə hər mərhələsinin uyğunluğunun və faydalı bir araşdırma işi olduğunun göstərilməsi baxımından əhəmiyyətlidir. Hansı data təhlili metodundan

a) Milli strategiyalar və dövlət təşəbbüsləri. “Azərbaycan Respublikasının Turizm Strategiyası 2023-2026” (Azərbaycan Respublikasının Turizm Strategiyası 2023-2026, 2021) sənədində insan kapitalının inkişafı əsas prioritetlərdən biri kimi göstərilir. Strategiyada regionlarda turizm təhsili, peşəkar kadr hazırlığı və xidmət keyfiyyətinin artırılması xüsusi vurğulanır.

b) Təlim və sertifikatlaşdırma proqramları. Dövlət Turizm Agentliyi və digər qurumlar tərəfindən təşkil olunan təlimlər, xüsusilə regionlarda fəaliyyət göstərən turizm obyektləri üçün əhəmiyyətlidir (Azərbaycan Respublikası Sosial-İqtisadi İnkişaf Strategiyası, 2021). Bu proqramlar vasitəsilə yerli əhali turizm sahəsində peşəkar biliklər əldə edir və məşğulluq imkanları artır.

c) Regionlarda İR potensialının gücləndirilməsi. Quba, Şəki, Lənkəran kimi regionlarda turizm potensialı yüksəkdir. Bu bölgələrdə yerli kadrların hazırlanması üçün dövlət və özəl sektor əməkdaşlığı çərçivəsində layihələr həyata keçirilir. Məsələn, Suqovuşan Turizm Kompleksi layihəsi həm infrastruktur, həm də insan kapitalı baxımından əhəmiyyətlidir.

Beynəlxalq təcrübə və müqayisəli yanaşma: a) CAREC 2030 turizm strategiyası. Bu regional təşəbbüs çərçivəsində iştirakçı ölkələr arasında İR sahəsində təcrübə mübadiləsi, təlim proqramları və ortaq standartların tətbiqi təşviq olunur; b) Avropa İttifaqı ölkələri. Aİ ölkələrində İR strategiyaları gender bərabərliyi, inklüzivlik və rəqəmsal bacarıqların artırılması üzərində qurulub (European Training Foundation, 2022; European Commission, 2022). Məsələn, İspaniyada turizm işçiləri üçün onlayn təlim platformaları geniş yayılıb; c) BƏƏ və Sinqapur nümunələri. Bu ölkələr texnologiya əsaslı İR idarəetməsində liderdir. Otel və hava limanı işçiləri üçün süni intellektlə dəstəklənən performans qiymətləndirmə sistemləri tətbiq olunur (International Labour Organization, 2023; UNWTO, 2024; WTTC, 2024). Bu yanaşma xidmət keyfiyyətini və müştəri məmnuniyyətini artırır.

## Nəticə

Tədqiqat göstərir ki, turizm sektorunda insan resurslarının idarə edilməsi müasir dövrün çağırışlarına uyğun şəkildə yenidən qurulmalıdır. Pandemiyadan sonrakı dövrdə yaranan qeyri-müəyyənlik, texnoloji yeniliklərin sürətli tətbiqi və əmək bazarındakı nəsil dəyişiklikləri İR strategiyalarının çevik, inklüziv və texnologiya əsaslı olmasını zəruri edir. Ənənəvi idarəetmə modelləri artıq kifayət etmir və müəssisələr işçilərin rifahı, psixoloji dayanıqlılığı və peşəkar inkişafına yönəlmiş yanaşmalar tətbiq etməlidirlər. Azərbaycanın turizm sektorunda bu transformasiya dövlət strategiyaları, regional təşəbbüslər və beynəlxalq əməkdaşlıq vasitəsilə həyata keçirilir. “Azərbaycan Respublikasının Turizm Strategiyası 2023-2026” sənədində insan kapitalının inkişafı prioritet istiqamət kimi müəyyən olunmuşdur. Bu yanaşma həm xidmət keyfiyyətinin yüksəldilməsinə, həm də sektorun dayanıqlı inkişafına töhfə verir.

## Ədəbiyyat

1. *Azərbaycan Respublikasının Turizm Strategiyası 2023-2026.* (2021).
2. *Azərbaycan Respublikası Sosial-İqtisadi İnkişaf Strategiyası 2022-2026*. (2021).
3. Bayramov, T. (2022). *Turizmin inkişafında dövlətin rolu və İR idarəetməsi.*
4. *CAREC Tourism Strategy 2030.* (n.d.).
5. European Training Foundation. (2022). *Skills Development in Tourism*.
6. European Commission. (2022). *Skills and Competencies in the Tourism Sector.*
7. Google Scholar. (2021). *Generation Z and The Future of Work in Tourism.*
8. International Labour Organization. (2023). *Skills for Tourism: A Global Outlook.*
9. OECD. (2021). *Tourism Employment After COVID-19.*
10. Solnet, D., Baum, T., Robinson, R. (2016). *Innovation in human resource manacement*.
11. UNWTO. (2024). *Tourism and Human Capital: Building Resilience.*
12. WTTC. (2024). *Travel and Tourism Economic Impact Report.*

Daxil oldu: 12.03.2025
Qəbul edildi: 18.06.25

*Elmi Tədqiqat* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 5 Sayı: 6 / 131-135
*Scientific Research* International Scientific Journal. 2025 / Volume: 5 Issue: 6 / 131-135 e-ISSN: 2789-6919

**TƏBİƏT ELMLƏRİ**
**NATURAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2789-6919/46/131-135

**Bəsti Cəfərova**
Gəncə Dövlət Universiteti
https://orcid.org/0009-0007-4314-007X
mehdiyeva_69@mail.ru

# Məişət və istehsal sularının keyfiyyətini analiz etmək üçün istifadə olunan proqramların müqayisəli analizi

**Xülasə**

Bu məqalədə suyun həyat və sənaye üçün əhəmiyyəti, onun keyfiyyətinin analizi və idarə olunmasının zəruriliyi izah olunur. Məişət və istehsal suları üçün vacib fiziki, kimyəvi və mikrobioloji göstəricilər təqdim edilir. Suyun keyfiyyətini təyin edən proqram təminatları laboratoriya analiz sistemləri, məlumat idarəetmə və simulyasiya proqramları müqayisəli şəkildə təhlil olunur. Eyni zamanda, Azərbaycanda "Azərsu" ASC və Meliorasiya və Su Təsərrüfatı ASC tərəfindən tətbiq olunan AzərsuGIS, MİS və SCADA kimi müasir idarəetmə sistemləri nümunə kimi göstərilir. Məqalə su ehtiyatlarının səmərəli, şəffaf və texnoloji əsaslarla idarəsinin vacibliyini vurğulayır. Su həyatın davamlılığı üçün ən vacib resurslardan biridir. Məişət və istehsal sahələrində istifadə olunan suyun keyfiyyəti insan sağlamlığı, ekosistemlərin qorunması və sənaye proseslərinin səmərəliliyi üçün böyük əhəmiyyət kəsb edir. Buna görə də, suların keyfiyyət göstəricilərinin müntəzəm və dəqiq analiz edilməsi zəruridir.

***Açar sözlər:*** *su keyfiyyəti, su analizi, ekoloji monitorinq, Hach WIMS, QUAL2K, SWAT*

**Basti Jafarova**
Ganja State University
https://orcid.org/0009-0007-4314-007X
mehdiyeva_69@mail.ru

# Comparative Analysis of Programs Used to Analyze the Quality of Domestic and Industrial Water

**Abstract**

This article explains the importance of water for life and industry, the necessity of analyzing and managing its quality. Important physical, chemical and microbiological indicators for domestic and production waters are presented. Software solutions that determine water quality – laboratory analysis systems, data management and simulation programs – are analyzed comparatively. At the same time, modern management systems such as AzersuGIS, MIS and SCADA, implemented by "Azersu" OJSC and Melioration and Water Economy OJSC in Azerbaijan, are shown as examples. The article emphasizes the importance of efficient, transparent and technological management of water resources.

***Keywords:*** *water quality, water analysis, environmental monitoring, Hach WIMS, QUAL2K, SWAT*

## Giriş

Su həyatın davamlılığı üçün ən vacib resurslardan biridir. Məişət və istehsal sahələrində istifadə olunan suyun keyfiyyəti insan sağlamlığı, ekosistemlərin qorunması və sənaye proseslərinin səmərəliliyi üçün böyük əhəmiyyət kəsb edir. Buna görə də, suların keyfiyyət göstəricilərinin müntəzəm və dəqiq analiz edilməsi zəruridir.

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

Məişət suları əsasən, içməyə və digər ev işlərinə istifadə olunur, buna görə onların keyfiyyəti sağlamlıq standartlarına cavab verməlidir. İçməli suyun tərkibində zərərli mikroorqanizmlərin, ağır metalların və digər zəhərli maddələrin olmaması vacibdir. Eyni zamanda, sudakı pH, bulanıqlıq, rəng və dad kimi fiziki göstəricilər də insanın istifadəsi üçün uyğunluq səviyyəsini müəyyən edir. Məişət sularının keyfiyyətinin pozulması nəticəsində müxtəlif xəstəliklər o cümlədən, bağırsaq infeksiyaları, xərçəng və digər sağlamlıq problemləri yarana bilər.

**Tədqiqat**

İstehsal suları isə sənaye proseslərində, texnoloji ehtiyaclarda və tullantıların idarə olunmasında istifadə edilir və onların tərkibində spesifik kimyəvi və fiziki parametrlər vacib rol oynayır. Məsələn, istilik dəyişdiriciləri üçün istifadə olunan suyun minerallaşma səviyyəsi aşağı olmalıdır ki, borularda ləkələr yaranmasın. Kimya sənayesində suyun kimyəvi tərkibi məhsulun keyfiyyətinə təsir edə bilər. İstehsal tullantıları isə ətraf mühitə mənfi təsirin qarşısını almaq üçün ciddi şəkildə analiz edilməli və emal olunmalıdır. Buna görə də, istehsal sularının keyfiyyət göstəricilərinin davamlı monitorinqi sənayenin ekoloji və iqtisadi dayanıqlılığı üçün əvəzolunmazdır.

Məişət və istehsal (sənaye) sularının keyfiyyətini analiz etmək üçün istifadə olunan proqram təminatları, suyun kimyəvi, fiziki və mikrobioloji xüsusiyyətlərini ölçmək və izləmək üçün mühüm rol oynayır. Bu proqramlar suyun keyfiyyətinə nəzarət, hesabatların hazırlanması, risklərin qiymətləndirilməsi və normativ uyğunluğun təmin edilməsi məqsədilə istifadə olunur.

Suyun keyfiyyətini analiz etmək üçün istifadə olunan proqramlar əsasən aşağıdakı kateqoriyalara bölünür (Chapman, 1996).

1. Laboratoriya analiz proqramları. Bu proqramlar su nümunələrindən əldə olunan məlumatları avtomatik və ya yarı avtomatik şəkildə emal etmək üçün hazırlanmışdır. Onlar suyun kimyəvi tərkibini, bioloji göstəricilərini və fiziki parametrlərini ölçən laboratoriya avadanlıqları ilə inteqrasiya olunur.

- Hach WIMS (Water Information Management System). Su keyfiyyəti məlumatlarının toplanması, saxlanması və idarə olunması üçün geniş istifadə olunan proqramdır. Laboratoriya və sahə testlərinin nəticələrini bir araya gətirir və nəticələrin təhlilini asanlaşdırır.
- Thermo Scientific AquaChem. Su və torpaq nümunələrinin kimyəvi analizini aparmaq üçün istifadə olunur. Geniş kimyəvi parametrlərin işlənməsi və müxtəlif formatlarda hesabatların hazırlanması mümkündür.

2. Məlumat idarəetmə və analiz proqramları. Bu proqramlar laboratoriyadan, sahədən və ya digər mənbələrdən toplanan böyük həcmli məlumatların idarə olunması, təhlil edilməsi və vizual təqdimatı üçün nəzərdə tutulmuşdur.

- WaterTrax. Bulud əsaslı platformadır və su keyfiyyəti məlumatlarının uzaqdan idarəsini təmin edir. Məlumatların toplanması, emalı və real vaxtda izlənməsi üçün istifadə olunur.
- Aquarius: Su mühafizəsi sahəsində geniş istifadə olunan, müxtəlif mənbələrdən məlumat toplamağa imkan verən və statistik analizlər təqdim edən proqramdır.

3. Simulyasiya və proqnozlaşdırma proqramları. Bu proqramlar su hövzələrinin, çayların və göllərin su keyfiyyətinin vaxt üzrə dəyişməsini proqnozlaşdırmaq üçün istifadə olunur. Onlar ekoloji risklərin qiymətləndirilməsi və idarəetmə qərarlarının verilməsi üçün mühüm rol oynayır.

- QUAL2K. Açıq mənbə kodlu proqramdır və çaylarda su keyfiyyətinin modelləşdirilməsi üçün geniş istifadə olunur. İstifadəçilərə kimyəvi və bioloji parametrlərin dinamik dəyişməsini təhlil etməyə imkan verir.
- SWAT (Soil and Water Assessment Tool). Su hövzələrinin hidrologiyası və su keyfiyyəti üçün kompleks simulyasiya alətidir. Kənd təsərrüfatı təsirlərini, torpaq eroziyasını və kimyəvi maddələrin hərəkətini modelləşdirir.

Aşağıda bu cür proqramların müqayisəli təhlili təqdim olunur (Chapman, 1996).

| Proqram Adı | İstifadə Sahəsi | Əsas Funksiyalar | Üstünlükləri | Çatışmazlıqları |
|---|---|---|---|---|
| **Hach Wa Intelligence Syst (WIMS)** | Məişət sənaye | Su analizləri (pH, x TOC, COD, BOD və hesabat, trend izləmə | Yüksək dəqiq normativ uyğun üçün hesabatlar | Qiymət yüksək təlim tələb edir |

| | | | | |
|---|---|---|---|---|
| **Aquachem Thermo Fisher** | Sənaye | Kimyəvi analizlər ü laboratoriya məlu idarəsi | ISO standartla uyğun, laborato ilə inteqrasiya | Qrafik interf nisbətən mürəkkəb |
| **LabWare LI (Laboratory Information Management System)** | Məişət sənaye | Nümunə izləmə, nə analizləri, hesabatlaşdır | Yüksək səviy fərdiləşdirmə, g istifadə sahəsi | Quraşdırılması idarəsi çətindir |
| **Water Qua Analysis Simulation Program (WASF** | Sənaye, tədqiqat | Hidrokimyəvi modelləşdirmə, sistemləri simulyasiyası | Elmi tədqiqa üçün uyğundur | Realtime monitor yoxdur |
| **Enablon Wa Management Software** | Məişət sənaye | Risk analizləri, istifadəsinin idar davamlılıq hesabatları | Korporativ idarəetmə ü uyğundur | Kiçik müəssisələr ü yüklü ola bilər |
| **Aquareport Aqualabo)** | Məişət | Avtomatlaşdırılmış analizatorları inteqrasiya | Real-time məlun istifadəçi dostu | Funksionallıq məhduddur (yalnız b parametrlər) |

Su keyfiyyətinin analizi və idarə olunması üçün proqram təminatının seçimi, istifadə sahəsinin spesifik tələblərinə əsaslanmalıdır. Aşağıda müxtəlif istifadə sahələrinə uyğun tövsiyə olunan proqramlar təqdim olunur (Environmental Protection Agency, 2021).

| **İstifadə Növü** | **Tövsiyə Olunan Proqramlar** | **Qısa İzah və Xüsusiyyətlər** |
|---|---|---|
| **Kiçik şəhər və kənd su təchizatı** | Aquareport, Hach WIMS | Kiçik və orta ölçülü su təchizatı sistemlərinin idarəsi üçün uyğundur. Sadə istifadəçi interfeysi və əsas su keyfiyyəti parametrlərinin monitorinqi mövcuddur. |
| **Sənaye müəssisələri və istehsal sahələri** | LabWare LIMS, AquaChem | Kompleks laboratoriya məlumatlarının idarə olunması və sənaye standartlarına uyğun analiz imkanı verir. Müxtəlif kimyəvi parametrlərin dəqiq ölçülməsi üçün uyğundur. |
| **Tədqiqat və ekoloji monitorinq** | WASP | Ekoloji risklərin və su hövzələrinin ekoloji modelləşdirilməsi üçün hazırlanmışdır. Ətraf mühitin davamlı monitorinqi üçün faydalıdır. |
| **Korporativ su idarəetməsi** | Enablon | Korporativ səviyyədə suyun istifadəsi, istehlakı və keyfiyyətinin idarə olunması üçün inteqrasiya olunmuş həll təqdim edir. Risklərin idarə olunması və hesabatların hazırlanması funksiyaları ilə zəngindir. |

Bu sahədə dövlət qurumları, xüsusilə "Azərsu" ASC və Azərbaycan Meliorasiya və Su Təsərrüfatı ASC, müasir texnologiyaları tətbiq edərək suyun keyfiyyətinə nəzarət və idarəetmə sahəsində mühüm addımlar atıblar.

"Azərsu" ASC, suyun keyfiyyətini izləmək və idarə etmək üçün bir neçə müasir sistemdən istifadə edir:

- *SCADA sistemi:* Bu sistem vasitəsilə hidrotexniki qurğuların və digər avadanlıqların idarə edilməsi və suyun paylanması prosesləri mərkəzləşdirilmiş şəkildə həyata keçirilir. Məsələn, Ceyranbatan Ultrasüzgəcli Sutəmizləyici Qurğular Kompleksində suyun təmizlənməsi və nəqli tam avtomatlaşdırılıb və onlayn rejimdə idarə olunur.
- *AzersuGIS və MİS proqramları:* bu proqramlar su şəbəkələrinin xəritələnməsi və müştəri məlumatlarının idarə edilməsi üçün istifadə olunur.

1. Azərbaycan Meliorasiya və Su Təsərrüfatı ASC, su ehtiyatlarından səmərəli istifadə və su təsərrüfatının idarə olunmasını təkmilləşdirmək məqsədilə iki əsas dövlət proqramı hazırlayıb (http://mst.gov.az).

- "Azərbaycan Respublikasında Azərbaycan Meliorasiya və Su Təsərrüfatı ASC-nin inkişafına dair 2020-2030-cu illər üzrə" Dövlət Proqramı. Bu proqram su təsərrüfatının inkişafını və idarəetməsini nəzərdə tutur.
- "Suvarma suyundan səmərəli istifadə edilməsinə və su itkilərinə qarşı ilkin mübarizə tədbirləri haqqında" Dövlət Proqramı. Bu proqram suvarma sistemlərinin səmərəliliyini artırmaq və su itkilərinin qarşısını almaq məqsədini güdür.

Azərbaycan Dövlət Su Ehtiyatları Agentliyi tərəfindən suyun keyfiyyətinə onlayn nəzarət edəcək bir platforma üzərində işlər davam edir. Bu sistem vasitəsilə əvvəlcədən quraşdırılmış onlayn cihazlar vasitəsilə suyun keyfiyyət parametrləri mobil telefon və digər qurğulardan istənilən vaxt izlənilə biləcək. Bu həm operativ reaksiya verməyə, həm də gələcəkdə təhlillərin elektron bazasının yaradılmasına imkan verəcək.

## Nəticə

Azərbaycanda içməli və kanalizasiya xidmətlərinin keyfiyyətini artırmaq və idarəetməni müasir texnologiyalarla təkmilləşdirmək məqsədilə "Azərsu" ASC tərəfindən tətbiq olunan AzərsuGIS və MİS (Müştəri İnformasiya Sistemi) proqramları mühüm əhəmiyyət kəsb edir. Bu sistemlər su təchizatı və kanalizasiya xidmətlərinin səmərəli idarə olunmasına, abonentlərlə əlaqələrin optimallaşdırılmasına və xidmətlərin şəffaflığının artırılmasına xidmət edir.

AzərsuGIS coğrafi məlumatlar əsasında su və kanalizasiya infrastrukturunun rəqəmsal xəritələnməsini təmin edən bir sistemdir. Bu sistemin əsas xüsusiyyətləri aşağıdakılardır:

- *İnfrastruktur məlumatlarının toplanması və vizuallaşdırılması.* 18500 km su, 8300 km tullantı və yağış su xətləri, 12 minədək qurğu və kompleks, 487 min bina və tikili ilə bağlı məlumatlar sistemə daxil edilib.
- *İnteqrasiya və əlaqələndirmə.* AzərsuGIS, MİS, SCADA, elektron kargüzarlıq və digər sistemlərlə inteqrasiya olunaraq məlumatların vahid platformada toplanmasını təmin edir.
- *Qəza və təmir proseslərinin idarə edilməsi.* Qəza baş verdikdə dərhal müvafiq məlumatlar sistemə daxil edilir və aidiyyəti qurumlara yönləndirilir.
- *Beynəlxalq tanınma.* AzərsuGIS layihəsi Bentley Beynəlxalq Layihə Müsabiqəsinin və Beynəlxalq Coğrafi İnformasiya Sistemləri Forumunun qalibi olub.

MİS – Müştəri İnformasiya Sistemi proqramı, abonentlərlə əlaqələrin idarə olunmasını və xidmətlərin səmərəliliyini artırmaq məqsədilə tətbiq olunan bir sistemdir. Bu sistemin əsas xüsusiyyətləri aşağıdakılardır:

- *Real vaxt rejimində məlumatların işlənməsi.* Sayğac göstəriciləri onlayn rejimdə oxunaraq abonentlərə dərhal faktura təqdim edilir. Satış-ödəniş və borc məlumatları real vaxt rejimində yenilənir.
- *Müraciətlərin idarə edilməsi.* Qaynar xətt mərkəzindən daxil olan müraciətlər sistemə daxil edilir və aidiyyəti qurumlara yönləndirilir. Elektron xidmətlər üzərindən daxil olan müraciətlər də sistemə daxil edilir və dərhal yönləndirilir.

- *İcra proseslərinin izlənməsi*. İcra prosesində iştirak edən struktur vahidləri və şöbələrin fəaliyyəti sistem üzərindən izlənilir və nəzarət olunur.
- *Şəffaflıq və hesabatlılıq*. Sistem vasitəsilə xidmətlərin şəffaflığı artırılır və hesabatlılıq təmin edilir.

2. AzərsuGIS və MİS proqramları arasında məlumat mübadiləsi və inteqrasiya təmin edilir. AzərsuGIS vasitəsilə infrastruktur məlumatları toplanır və vizuallaşdırılır, MİS vasitəsilə isə abonent məlumatları və xidmət göstəriciləri idarə olunur. Bu inteqrasiya nəticəsində xidmətlərin səmərəliliyi artırılır və operativ qərarların qəbul edilməsi asanlaşır (http://mst.gov.az).

"Azərsu" ASC tərəfindən tətbiq olunan AzərsuGIS və MİS proqramları, su təchizatı və kanalizasiya xidmətlərinin müasir texnologiyalarla idarə olunmasını təmin edir. Bu sistemlər vasitəsilə xidmətlərin səmərəliliyi artırılır, şəffaflıq təmin edilir və abonentlərlə əlaqələr optimallaşdırılır. Gələcəkdə bu sistemlərin daha da təkmilləşdirilməsi və yeni texnologiyaların tətbiqi ilə xidmətlərin keyfiyyətinin daha da yüksəldilməsi nəzərdə tutulur.

## Ədəbiyyat

1. Bartram, J., Ballance, R. (1996). *Water Quality Monitoring: A Practical Guide to the Design and Implementation of Freshwater Quality Studies and Monitoring Programmes.*
2. Chapman, D. (1996). *Water Quality Assessments: A Guide to the Use of Biota, Sediments and Water in Environmental Monitoring (2nd Edition).* Cambridge University Press.
3. Guidelines for Drinking-Water Quality. (2017). *4th Edition incorporating the 1st Addendum*.
4. *Environmental Protection Agency*. (2021). Water Quality Standards Handbook. U.S. EPA Office of Water.
5. FAO. (2020). *Climate-Smart Agriculture in Azerbaijan: Country Profile*. Food and Agriculture Organization of the United Nations.
6. http://mst.gov.az
7. İmanov, F. Ə., Məmmədov, V. A., Abdullayev, İ. M. *Hidrologiya.*
8. İmanov, F. Ə., Ələkbərov, A. B. (2017). *Azərbaycanın su ehtiyatlarının müasir dəyişmələri və inteqrasiyalı idarə edilməsi.*
9. Ministry of Agriculture of Azerbaijan. (2020). *Agricultural Development Strategy 2020 2025*. Government of Azerbaijan.
10. *Poka eshche ne slishkom pozdno*. (2000). Doklad Natsional'nyi Komitsii. Soedinènnykh Shtatov Ameriki po prepodavaniyu matematiki i estestvennykh nauk v XX veke.
11. UNCCD. (2021). *Land Degradation Neutrality: Achieving SDG Target 15.3*. Bonn: United Nations Convention to Combat Desertification.
12. World Bank. (2020). *Azerbaijan: Country Land Governance Assessment Report*. World Bank.

Daxil oldu: 04.03.2025
Qəbul edildi: 25.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/136-141

**Rəsmiyyə Kərimova**
Azərbaycan Dövlət Aqrar Universiteti
https://orcid.org/0009-0009-4232-404X
kerimova.resmiyye.@ list.ru
**Nərminə İsayeva**
Azərbaycan Dövlət Aqrar Universiteti
https://orcid.org/0009-0002-4659-1953
isayeva-91.@ bk.ru

# Gülxətmi bitkisinin bioloji xüsusiyyəti və dərman əhəmiyyəti

## Xülasə

Malvaceae fəsiləsindən olan gülxətmi bitkisinin dərman əhəmiyyəti çoxdan məlumdur. Araşdırmalar göstərir ki, gülxətmi bitkisi qədim dövrlərdən dərman məqsədi ilə istifadə edilmişdir. Hələ o dövrlərdə Teofrast və Dioskorid bitki haqqında öz yazılarında bitkinin müsbət keyfiyyətlərini aşkarlayaraq qeydlər etmişlər. Teofrast və Dioskorid bitkiyə yunanca "althaia" hatmi adını vermişlər. Elə o dövrlərdə Hippokrat, Plini, Qalen, Avesenna kimi tarixi şəxsiyyətlər bitkinin müalicəvi xüsusiyyətlərini aşkarlayaraq, yüksək keyfiyyətlərə malik dərman bitkisi olduğunu göstərirdilər. Teofrast hatmi bitkisindən öskürək, sümük sınıqlarında, dəri zədələnmələrində, Qalen isə şişlərin müalicəsində istifadə edərək belə nəticəyə gəlmişlər ki, bitkinin çiçəkləri – kök, yarpaq və toxuma nisbətən zəif təsir göstərir (Qurbanov, 2009).

Azərbaycan ərazisində də gülxətmi bitkisi geniş yayılmışdır və el arasında bəlğəmotu, altey, hatmi kimi tanınmaqdadır. Bitkinin 12 növündən 5 növü Azərbaycanda yayılmışdır. Gülxətmi cinsinə aid olan növlər çoxillik ot bitkiləridir, kök sistemləri yaxşı inkişaf edir. Azərbaycan florasında dərman gülxətmi aran dağətəyində əsasən, bir çox rayonlarda orta dağ qurşaqlarına qədər çayların ətrafında nəmli çəmənliklərin və kolluqların bitdiyi ərazilərdə yayılmışdır. Dağətəyi və aran rayonlarında bu bitki sulu yerlərdə, arxların kənarlarında rast gəlinir. Apardığımız müşahidələr göstərir ki, dərman gülxətminin yayılmış olduğu rayonlar torpaq və iqlim şəraitinə görə fərqlənir. Dərman gülxətmi Azərbaycan ərazisində əsas etibarı ilə təbii olaraq münbit torpaqlarda bitir. Bitki tək-tək və ya qruplar halında yayılmışdır. Gülxətmi bitkisı yarımsəhra bitki örtüyü tipinə aid edilir. Açıq sahələrdə, bəzən kol və ya yarımkol formalı otlar ilə bir yerdə yayılmış, küləyə, quraqlığa və s. kimi ekoloji faktorlara yaxşı uyğunlaşmışdır. Bitkinin yayıldığı ərazidən və iqlim şəraitindən asılı olaraq gülxətminin kökündə olan seliyin miqdarı dəyişir. Həmçinin, kökün tərkibində saxaroza, alma turşusu, efir yağı, qətranabənzər maddələr, steroidlər, büzüşdürücü maddələr, betain, piylər, vitamin C, bundan əlavə K, Ca, Mq, Fe, Mn, Cu, Co və s. kimi duzlarla bərabər flaviniodli qlikozidlər, kumarin, fenol turşusu müəyyən edilir.

Müasir elmi tibbdə gülxətmi bitkisi dərman məqsədi ilə geniş tətbiq edilir. İlk növbədə gülxətmidən hazırlanan preparatlardan bəlğəmgətirici, öskürək əleyhinə vasitə kimi istifadə edilir. Bitkinin kökündən hazırlanmış məlhəmin yüksək sakitləşdirici xüsusiyyəti olduğundan tənəffüs yollarının sinir uclarının qıcıqlanmasını aradan qaldırır. Gülxətminin bakteriosid və iltihab əlehinə təsir göstərməsi də sübut edilmişdir. Yarpaqların tərkibindəki polisaxaridlər antioksidant və şişlərə qarşı təsirlidir. Gülxətminin tünd rəngli çiçəkləri daha yüksək antioksidant xüsusiyyətə malikdir. Kosmetologiya sahəsində də bitkidən alınan ekstraktlardan dərinin nəmləndirmək, quruluğu aradan götürmək, sakitləşdirici və yumşaldıcı kimi vasitələrin alınmasında istifadə edilir. Qızartı və dəri qıcıqlanmalarında, səpgilərə, dərinin bərpa prosesinə ətraf mühitin mənfi təsirlərindən qoruma kimi yüksək xüsusiyyətlərə malikdir. Dərman gülxətmidən alınan ekstrakt saç follikullarına (soğanaqlara) təsir edərək onları qıcıqlandırır, uzanmasını sürətləndirir. Bitkiyə olan tələbat gündən-günə artdığından, fiterapevtlərin və mütəxəssislərin diqqət mərkəzindədir və artırılması zərurəti meydana çıxır. Dərman gülxətminin yabanı halda bitdiyi əraziləri tədqiq etmək, bioloji və ekoloji xüsusiyyətlərini öyrənmək, yeni sahələrdə becərmək müasir tibb üçün vacib şərtlərdən biridir.


Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

***Açar sözlər:*** *gülxətmi, fito müalicə, bəlğəmotu, xalq təbabəti, antioksidant, selik, efir yağı*

**Rasmiyya Karimova**
Azerbaijan State Agrarian University
https://orcid.org/0009-0009-4232-404X
kerimova.resmiyye.@ list.ru
**Narmina İsayeva**
Azerbaijan State Agrarian University
https://orcid.org/0009-0002-4659-1953
isayeva-91@ list.ru

## Biological Properties and Medicinal Value of Alcea Rosea

### Abstract

The medicinal value of the alcea rosea plant in folk medicine has been known for a long time. Studies show that the alcea rosea has been used for medicinal purposes since ancient times. Theophrastus and Dioscorides noted the positive qualities of the plant in their writings. Studies show that Theophrastus and Dioscorides gave the plant the Greek name "althaia" – hatmi. Historical personalities such as Hippocrates, Pliny, Galen, Avesenna discovered the healing properties of the plant and noted that it is a medicinal plant with high qualities. Theophrastus used alcea rosea plant for cough, bone fractures, and skin damage, while Galen used it to treat tumors and came to the conclusion that the flowers of the plant - root, leaf, and tissue - have a relatively weak effect. Althea Rosea plant is also widespread in the territory of Azerbaijan and is known among the people as bulghamot, altey, hatmi. 5 out of 12 species of the plant are common in Azerbaijan. Species belonging to the alcea rosea genus are perennial herbs and their root systems develop well. In the flora of Azerbaijan, the medicinally important alcea rosea plant is distributed in the lowlands and foothills, mainly around the rivers, in the areas where moist meadows and bushes grow, up to the middle mountain belts of many regions. This plant grows in wet places and on the edges of ditches in the foothills and lowlands. Our observations show that the regions where the medicinal alcea rosea is distributed differ according to the soil and climatic conditions. Medicinal alcea rosea grows in the territory of Azerbaijan mainly on naturally fertile soils. The plant is spread singly or in groups. Alcea rosea belongs to the type of semi-desert vegetation.

Sometimes spread together with bush or semi-bush-shaped grasses, resistant to wind, drought, etc. such as well adapted to environmental factors in open areas. Depending on the area and the climatic conditions where the plant is spread the amount of sap in the root of the flower varies. The root also contains sucrose, malic acid, essential oil, resin-like substances, steroids, astringent substances, betaine, fats, vitamin C, in addition to K, Ca, Mg, Fe, Mn, Cu, Co, etc. flavinoid glycosides, coumarin, phenolic acid are determined along with salts. Althea Rosea is widely used for medicinal purposes in modern scientific medicine. First of all, preparations made from alcea rosea are used as expectorants and antitussives. Since the ointment made from the root of the plant has a high sedative property, it eliminates the irritation of the nerve endings of the respiratory tract. Bacteriocidal and anti-inflammatory effects of alcea rosea have also been proven. The polysaccharides contained in the leaves are effective as antioxidants and against tumors. The dark colored flowers of alcea rosea have higher antioxidant properties. In the field of cosmetology, plant extracts are used to moisturize the skin, remove dryness, soothe and soften the skin. In the field of cosmetology, plant extracts are used to moisturize the skin, remove dryness, soothe and soften the skin. It has high properties such as redness and skin irritations, rashes, skin regeneration process, and protection from the negative effects of the environment. The extract from the medicinal alcea rosea affects the hair follicles (bulbs), irritates them, and accelerates their growth. Since the demand for the plant is increasing day by day, it is the focus of attention of physiotherapists and specialists and needs to be increased. Researching the areas where medicinal alcea rosea grows wild, studying

its biological and ecological characteristics, cultivating it in new areas is one of the important conditions for modern medicine.

***Keywords:*** *alcea rosea, phytotherapy, mugwort, folk medicine, antioxidant, mucus, essential oil*

## Giriş

Dərman gülxətmi (*Althae officinalis L.*) əməköməcilər (*Malvaceae*) fəsiləsinə mənsubdur. Çoxillik bitki olaraq tanınır. Bitkinin gövdəsi 1,5 m hündürlüyə qədər böyüyür. Gövdəsinin üzəri xırda, məxməri yumşaq tüklərlə örtülüdür. Kök sistemi qısa, ətli, yoğun və qol-budaqlı quruluşdadır. Ümumilikdə bitki yarpaqları ilə birlikdə boz-yaşıl rəngdədir. Yarpaqları bütün növlərində saplaqlıdır, gövdənin üzərində növbəli düzülmüşdür. Bitkinin üzərində olan yarpaqlar 2 quruluşda olur. Gövdənin yuxarı hissəsində olan yarpaqlar yumurta şəkillidir, kənarları bütövdür, aşağı və orta hissəsindəki yarpaqlar isə ürəkşəkilli, kənarları dişlidir. Çiçəklər yarpaqların qoltuğunda və budaqların üzərində xırda çiçək qrupu halında yerləşmişdir. Kasa yarpaqları iki qatlıdır.

Xaricə doğru olan kasa yarpaqları uzunsov formada, 8-9 ədəddir. Daxildəki kasa yarpaqları isə nisbətən enli, uc tərəfindən 5 bölümlü yarpaqcıqlardan ibarətdir. Ləçəkləri açıq-çəhrayı rəngdə, 5 ədəddir. Erkəkcikləri qırmızımtıl – bənövşəyi rəngdədir. Toxumları kasa yarpaqlarının içində dairəvi şəkildə yığılıb həlqə forması almışdır.

Dərman gülxətminin yayılmış olduğu rayonların torpaq və iqlim şəraiti də bir-birindən fərqlənir. Azərbaycanda əsas etibarı ilə təbii olaraq münbit torpaqlarda bitir. Tək-tək və ya qruplar halında daha çox rast gəlinir. Bitki daha çox işıq, günəş şüaları düşən ərazilərdə yaxşı inkişaf edir. Gün düşməyən ərazilərdə nadir halda bitir, çox zəif, alçaqboylu və zərif qol-budaqlı olur. Gülxətmi bitkisi rütubətə qarşı həssasdır, quraqlıq sahələrdə bitkinin boyu çox qısa olur, yetişərək ətrafa tökülən toxumların cücərməsi isə çox aşağı olur. (Demidova, Lanin, 2013).



1. Kimyəvi tərkib baxımından gülxətmi toxumlarının tərkibində flavinoid, efir və piyli yağlar, C vitamini, karotin, steroid və antosianlarla zəngindir. Köklərinin tərkibində 11 % selik, pentoza, heksoza, nişasta 38%, saxaroza, yağ turşuları vardır (İsmayılov, 2018).
2. Dərman gülxətminin yarpaqlarında 35 % selik maddəsi, qlükoza, arabinoza, nişasta, pektin və s. mövcuddur. Bioloji aktiv maddələrin miqdarı 8 % -ə çatır, 14 %-ə qədər su, 7 % kül maddə,

0,5 % üzvü turşular, 0,5 %mineral maddədən ibarətdir. Bitkinin kökündə insan orqanizmi üçün əvəzedilməz olan amin turşuları 0,8 % -2 %, asparaqin 4 % betain mövcuddur. 5-11 % -ə qədər polisaxaridlərdən tritsin, 78 % isə şəkər toplanır (Mustafayeva, İbadullayeva, Ələkbərov, İsmayılova, Qasımova, Qasımova, 2015).

Azərbaycanda bu bitkinin kökündən geniş istifadə edilir. Bu çox dəri xəstəliklərini müalicə edərkən bitkinin həm çiçəklərindən, həm də yarpaqlarından istifadə böyük nəticə verir. Bitkinin yarpaqları, çiçəkləri və kökü əsasən ikinci il toplanaraq qurudulur, istifadə edilir. Qurudulmuş çiçəklərinin tərkibində 0,2 -0,3 % efir ağı, selikli maddələr, karotin və askorbin turşuları var (Qurbanov, 2009).

Gülxətminin tərkibindəki laksatiflər bağırsaq problemlərinin aradan qalxmasında yardımçı olur. Sidikqovucu xüsusiyyətə malik olmasına görə ondan hazırlanmış çay orqanizmdə olan toksinləri bədəndən xaric edir. Bitkinin orqanlarından hazırlanan yaşıl kütlə əzilərək bir miqdar sirkəyə qatılır və vitiliqo xəstəliyinin müalicəsində istifadə edilir (Qasımov,1991).

Dərman gülxətmi adlı yüksək əhəmiyyətə malik olan bu bitkinin bioloji xüsusiyyətlərini – hündürlüyünü, gövdəsinin, budaqlanmasının, meyvələrinin miqdarını, yayılma arealını araşdırmaq məqsədi ilə biz Göygöl, Gəncə, Hacıkənd zonasında yazın ilk aylarından tədqiqat işlərinə başladıq.

**Tədqiqat**

Gülxətmi bitkisinin inkişafını izləmək üçün kafedramızın əməkdaşları ilə çöl tədqiqatına gedən zaman əvvəlcə müəyyən etdiyimiz ərazilərə baxış keçirdik. Bitkinin bir miqdar qurumuş toxumlarını topladıq. Toxumların kasa yarpaqlarının içərisində dairəvi yığılmış şəkildə, həlqə formasında yerləşdiyini müşahidə etdik. Tam yetişmiş toxumlar xırda və yüngül olduğundan küləklə asan yayılır. Yerə düşdükdən sonra toxumların üzəri bir müddətdən sonra torpaqla örtülür, əlverişli şərait yarandıqda toxumlar cücərərək inkişaf edir (Məclumov, 2015). “Qanuni” tökülmüş toxumların hamısı cücərərək inkişaf etmir, bir miqdarı həşəratlar tərəfindən bir qismi yaz aylarında yağan yağışlar hesabına çürüyür və cücərmə qabiliyyətini itirir. Qalan sağlam toxumlar aprel ayının ilk on günlüyündən cücərməyə başlayır. Bitkinin inkişafını izləmək məqsədi ilə yazın əvvəlindən mütəmadi olaraq həmin ərazilərdə müşahidələrimizi ardıcıl apararaq, hər 3 ərazidə toxumun inkişafını izlədik. İnkişaf edən sağlam toxumlarda öncə kökün inkişafını daha sonra isə ləpə yarpaqlarının inkişafı arasındakı fərqləri müqayisə etdik.

**Cədvəl 1.**
**Gülxətmi bitkisinn müxtəlif ərazilərdə inkişaf fazaları .**

| İnkişaf fazalarının müddəti (ay) |
|---|



| Gülxətmi üzərində müşahidə aparılan rayonlar | **Cücərmə** | **Gövdənin inkişafı** | **Qönç ələmə** | **Çiçəkləmə** | **Toxumun yetişməsi** | **Bitkinin solması** |
|---|---|---|---|---|---|---|
| Gəncə | IV | VI | VI | VII | VII-VIII | XI |
| Göygöl | V | VI | VI | VII | VIII-X | XI |
| Hacıkənd | IV-sonu V –axırı | VIII | VII | VII | VIII-X | XI-XII |

Göstərilən ərazilərdə toxumun cücərməsi üçün tələb olunan temperatur 9-12$^{O}$ C olur. Cədvəldən göründüyü kimi, dərman gülxətminin toxumları təbii halda ən tez Gəncədə ən gec isə Hacıkənddə cücərir. Bir həftə ərzində cücərən kök 11 sm -ə qədər böyüyür, yan köklərinin sayı isə 5-7 ədədə çatır (Qasımov, 1980). Göygöl və Hacıkənd zonasında isə cücərən toxumların uzunluğu 7-8 sm, yan köklərin miqdarı isə 1-3 ədəd olaraq müşahidə edilir. Mayın ortalarında bitkinin gövdəsi inkişaf etməyə başlayır. Kök boynundan bir gövdə zoğu inkişaf edir. İkinci zoğda da yan budaqlar və çiçək qrupu əmələ gələn zaman kök boynundan yeni üçüncü zoğ böyüməyə başlayır və s. Apardığımız müşahidələr göstərir ki, dərman gülxətminin cücərməsi əvvəlcə çox sürətlə gedir. İlk 3-7 gündə bir yarpaq formalaşır. Mayın sonları və iyun aylarında böyümə nisbətən yavaşıyır, yəni 10-11 günə böyüyür. Aprel ayında cücərməyə başlayan toxum inkişaf edərək may ayının sonlarında üzərində 10-12 yarpaq olan cavan bitkiyə çevrilir. Mayın sonundan bitkinin gövdəsinin inkişafı daha nəzərə çarpacaq halda müşahidə edilir. Diqqətlə baxdıqda gövdənin yarpaqlarının qoltuqlarında tumurcuqların əmələ gəldiyini gördük. Tumurcuqdan isə yan budaqlar və çiçək qrupu əmələ gəlir. Artıq iyun ayının ilk on günlüyündən gülxətminin kollandığını qeydə aldıq (Samylina, Sorokin, 2010).

**Cədvəl 2**.
**Müxtəlif şəraitdə bitən gülxətminin hündürlüyü, budaqlarının sayı.**

| Dərman gülxətminin inkişafını müşahidə etdiyimiz ərazilər | Bitkinin vəziyyəti | | | |
|---|---|---|---|---|
| | hündürlüyü sm- lə | zoğların sayı | cavan budaqların sayı | bitkinin kolun diametri |
| Gəncə | 95 | 7 | 23 | 75 |
| Göygöl | 135 | 11 | 34 | 70 |
| Hacıkənd | 110 | 8 | 22 | 85 |

## Nəticə

Apardığımız müşahidələr müxtəlif rayonlarda bitən dərman gülxətmi kollarının inkişaf və məhsuldarlıq baxımından fərqli olduğunu göstərdi (Sokolov, 2000). Dərman gülxətminin inkişaf fazaları (*Althaea afficinalis L* ) digər kənd təsərrüfatı bitkiləri kimi becərildiyi ərazidən asılı olaraq

dəyişir. Bitkinin hündürlüyü ən çox Göygöldə, ən az Gəncə də müşahidə edilir. Həmçinin yazın əvvəlindən bitkinin inkişaf fazalarının izlənilməsini apararaq müşahidələrimizi cədvəl şəklində qeyd etdik. Dərman gülxətminin bioloji və ekoloji xüsusiyyətlərinin öyrənilməsi aşağıdakı nəticələri əldə etməyə imkan verir.

1. Dərman gülxətmisi qiymətli dərman bitkisi kimi Azərbaycanda təbii halda geniş sahələrdə yayılmışdır.
2. Bu bitki Gəncə, Göygöl, Hacıkənd və başqa rayonlarda təbii şəraitdə bitir.
3. Dərman gülxətmini Azərbaycanın bütün rayonlarında becərmək mümkündür. Bitkinin çiçəkləri və kökünün yüksək dərman əhəmiyyəti ondan müxtəlif preparatların hazırlanmasına quru, qatı və ekstrakt şəklində istifadəsinə yol açır (Nosov, 2001). Buna görə də dərman gülxətminin yabanı halda bitdiyi və yayıldığı əraziləri müəyyən etmək, araşdırmaq, bitkini yeni sahələrdə becərmək məqsədəuyğundur.
4. Dekorativ, boyaq, bal və çiçək tozu verən bitkidir.

## Ədəbiyyat


1. Demidova, M.A., Lanin, A.A. (2013). Antioksidantnaya aktivnost otkharkivayushchego sbora i otdel'nykh ego komponentov. *Verkhnevolzhskii Meditsinskii zhurnal*. 11, s.18-21.
2. Əliyev, F.Y., Hüseynov, R.İ., Qurbanov, Q.B., Tağıyev, R.M. (2016). *Dərman bitkiləri*.
3. İsmayılov, A. (2018). *Bitki çayları və dərman bitkiləri.*
4. Qurbanov, E . (2009). *Dərman bitkiləri*.
5. Qasımov, M.Ə. (1980). Gülxətmi. *"Elm və həyat"*. № 12. s.30-31.
6. Qasımov, M. Ə. (1991). Gülətirli gülxətmi. *Kənd həyatı*.
7. Qasımov, M., Məmmədov, T. (2014). *Fitoterapiya.*
8. Məclumov, F. (2015). *Dərman bitkiləri və onların istifadə qaydaları*.
9. Mustafayeva, İ.R., İbadullayeva, S.C., Ələkbərov, R.Ə., İsmayılova, A.N., Qasımova, N.Z., Qasımova, Ş.S. (2015). *Farmakoqnoziya botanikanın əsasları ilə*.
10. Nosov, A.M. (2001). Lekarstvennye rasteniya. *EHKSMO.* c.167-175.
11. Samylina, I.A., Sorokin, A.A., Pyatigorskaya, N.V. (2010). *Altei lekarstvennyi*.
12. Sokolov, S.Y. (2000). *Fitoterapiya i formokologiya.*


Daxil oldu: 15.03.2025
Qəbul edildi: 16.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/142-145

**Konul Mammadova**
Agro Research Center
PhD student
https://orcid.org/0009-0008-3831-0289
hesenlikonul95@gmail.com

# The Role of Agroforestry in Enhancing Climate Resilience of Rural Landscapes in Azerbaijan


## Abstract

Climate change poses increasing challenges for agricultural sustainability and rural livelihoods in Azerbaijan. While conventional adaptation strategies focus primarily on crop selection, irrigation management and land use policies, agroforestry offers a promising yet underexplored solution to enhance climate resilience. This paper investigates the potential of agroforestry systems as a nature-based approach to mitigate the adverse effects of climate variability, including drought, soil degradation, and biodiversity loss. Drawing on international case studies and regional data, the paper assesses the applicability of agroforestry practices such as windbreaks, silvopasture, and alley cropping in the context of Azerbaijan's semi-arid zones. By integrating trees into agricultural landscapes, agroforestry can improve soil moisture retention, increase carbon sequestration and diversify income for rural communities. The research highlights policy gaps and proposes practical recommendations for incorporating agroforestry into national climate adaptation strategies. The findings suggest that agroforestry can be a key component in building sustainable and climate-resilient rural environments in Azerbaijan.


***Keywords:*** *agroforestry, climate change, sustainable agriculture, Azerbaijan, land degradation*

**Könül Məmmədova**
Aqrar Tədqiqatlar Mərkəzi
doktorant
https://orcid.org/0009-0008-3831-0289
hesenlikonul95@gmail.com

# Azərbaycanda kənd landşaftlarının iqlimə davamlılığının artırılmasında aqromeşə təsərrüfatının rolu


## Xülasə

İqlim dəyişikliyi Azərbaycanda kənd təsərrüfatının davamlılığı və kənd yaşayış vasitələri üçün artan problemlər yaradır. Ənənəvi uyğunlaşma strategiyaları ilk növbədə məhsul seçimi, suvarma idarəçiliyi və torpaqdan istifadə siyasətlərinə diqqət yetirsə də, aqromeşəçilik iqlimə davamlılığı artırmaq üçün perspektivli, lakin hələ də öyrənilməmiş bir həll təklif edir. Bu sənəd iqlim dəyişkənliyinin, o cümlədən quraqlıq, torpağın deqradasiyası və biomüxtəlifliyin itirilməsinin mənfi təsirlərini yumşaltmaq üçün təbiətə əsaslanan yanaşma kimi aqromeşəçilik sistemlərinin potensialını araşdırır. Beynəlxalq nümunə araşdırmalarına və regional məlumatlara əsaslanaraq, məqalə Azərbaycanın yarı quraq zonaları kontekstində küləkdən qorunma, silvootlaq və xiyaban əkinləri kimi aqromeşəçilik təcrübələrinin tətbiqini qiymətləndirir. Ağacları kənd təsərrüfatı landşaftlarına inteqrasiya etməklə, aqromeşəçilik torpağın rütubətinin saxlanmasını yaxşılaşdıra, karbon sekestrini artıra və kənd icmalarının gəlirlərini şaxələndirə bilər. Tədqiqat siyasət boşluqlarını vurğulayır və aqromeşəçiliyin milli iqlimə uyğunlaşma strategiyalarına daxil edilməsi üçün praktiki tövsiyələr təklif edir. Nəticələr göstərir ki, aqromeşəçilik Azərbaycanda davamlı və iqlimə davamlı kənd mühitlərinin yaradılmasında əsas komponent ola bilər.


***Açar sözlər:*** *aqromeşəçilik, iqlim dəyişikliyi, davamlı kənd təsərrüfatı, Azərbaycan, torpaqların deqradasiyası*

 Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

## Introduction

Agriculture remains a vital sector for Azerbaijan, contributing significantly to employment, food security, and rural development (Fao, 2020). However, the increasing impacts of climate change - manifested through rising temperatures, erratic precipitation patterns, frequent droughts, and land degradation-pose serious threats to agricultural productivity and the stability of rural livelihoods (IPCC, 2021). In response, researchers and policymakers have been exploring diverse adaptation strategies to mitigate these adverse effects. Among these, agroforestry has gained global attention as a nature-based solution that combines agricultural and forestry practices for enhanced ecological and economic benefits (Garrity, 2004; Mbow, Smith, Skole, Duguma, Bustamante, 2014). Agroforestry is defined as the intentional integration of trees and shrubs into crop and livestock systems to create more diverse, productive, and sustainable land-use systems (Nair, 1993). These practices have been shown to enhance biodiversity, regulate microclimates, improve water retention, reduce soil erosion, and sequester carbon (Jose, 2009).

Given the country's varying agro-ecological zones-from semi-arid lowlands to mountainous terrains-Azerbaijan presents a unique opportunity to assess the feasibility and benefits of agroforestry practices (Huseynov, Mammadova, Aslanov, 2021). Yet, little academic and policy-oriented research has been conducted to explore how such systems could be adapted to the local context. This study aims to fill this gap by evaluating the role of agroforestry in enhancing climate resilience in Azerbaijan's rural landscapes. The paper examines different agroforestry models, identifies the environmental and socio-economic benefits, and discusses potential barriers and policy interventions needed to promote these practices.

**Research**

Climate Change and Agricultural Vulnerability in Azerbaijan. Azerbaijan's geographic and climatic diversity makes it particularly vulnerable to the adverse effects of climate change. The country comprises nine of the world's eleven climate zones, ranging from dry semi-deserts in the lowlands to humid subtropical areas along the Caspian Sea coast and alpine climates in the Greater Caucasus Mountains (MENR, 2021). This variability has historically supported diverse agricultural systems. However, changing climate patterns are now threatening the sustainability of these systems. According to national climate assessments, average annual temperatures in Azerbaijan have increased by approximately 1.3°C since the mid-20th century, with projections suggesting further rises of 2–4°C by the end of the 21st century under various emissions scenarios (IPCC, 2021). Rainfall patterns have become increasingly erratic, with certain regions experiencing frequent droughts, while others face sudden flooding events. These shifts are already disrupting planting and harvesting cycles, particularly in key agricultural regions such as the Kur-Araz Lowland, Ganja-Gazakh zone, and the Mil-Karabakh plain (World Bank, 2020).

One of the most pressing challenges is the increasing frequency and intensity of droughts. In 2020 and 2021, extended dry spells led to severe water shortages, reducing wheat yields by up to 40% in some areas (FAO, 2020). Groundwater reserves and irrigation infrastructure, already under strain from overuse and inefficiencies, are becoming insufficient to meet growing agricultural demands. At the same time, land degradation—accelerated by both climate factors and unsustainable farming practices—is contributing to the loss of fertile soils, especially in arid and semi-arid areas of central and southern Azerbaijan (UNCCD, 2021).

Agroforestry as a Climate Adaptation Strategy: Global Perspectives and Lessons Learned

Globally, agroforestry has been successfully implemented in a variety of climates and socio-economic contexts. In Sub-Saharan Africa, farmer-managed natural regeneration (FMNR) has restored millions of hectares of degraded land, particularly in Niger and Ethiopia, leading to increased crop yields and improved food security (Garrity, 2004). As Azerbaijan seeks sustainable and climate-resilient agricultural models, these global lessons offer valuable guidance for designing and implementing agroforestry systems that suit the country's environmental and socio-economic realities.

Opportunities and Challenges for Agroforestry in Azerbaijan. Azerbaijan's diverse climatic zones and longstanding traditions in both agriculture and tree cultivation provide a solid foundation for the integration of agroforestry practices. Regions such as the Guba-Khachmaz, Shaki-Zaqatala, and Lankaran economic zones possess favorable conditions—moderate rainfall, fertile soils, and

existing orchard-based agriculture—that can be adapted into agroforestry systems. Additionally, semi-arid areas like Shirvan and the Kur-Araz lowlands, which face land degradation and drought risks, could benefit from agroforestry's capacity to restore soil health and reduce erosion (Ministry of Agriculture of Azerbaijan, 2020). Furthermore, agroforestry aligns well with Azerbaijan's broader environmental and climate goals. The country is committed to land degradation neutrality under the UNCCD and has pledged to reduce greenhouse gas emissions under its Nationally Determined Contributions (NDCs) to the Paris Agreement (MENR, 2021) Agroforestry systems contribute directly to these objectives by sequestering carbon, reducing pressure on forests, and supporting sustainable land management.

Infrastructural and financial constraints also pose barriers. Establishing agroforestry systems requires initial investment and patience, as trees take several years to mature. Smallholder farmers often lack access to affordable credit, seedlings, or reliable extension services that could support this transition (Guliyev, Aliyeva, Mammadov, 2019). To overcome these challenges, Azerbaijan can draw from successful experiences in other countries and invest in pilot projects, farmer training, and research programs focused on locally adapted agroforestry models. Collaboration between government agencies, universities, and international organizations could help create a supportive environment for innovation and long-term sustainability in the agricultural sector.

Recommendations for Integrating Agroforestry into National Adaptation Strategies. To effectively harness the benefits of agroforestry in the face of climate change, Azerbaijan must adopt a strategic and multi-level approach.

1. Develop a National Agroforestry Strategy. There is an urgent need for a dedicated policy framework that outlines the vision, goals, and implementation mechanisms for agroforestry. This strategy should define suitable agroforestry models for different ecological zones in Azerbaijan, establish targets for adoption, and integrate the approach within broader agricultural and environmental plans (FAO, 2017).

2. Strengthen Institutional and Technical Capacity. Capacity building is vital for scaling up agroforestry practices. Training programs should be developed for extension workers, agronomists, and local authorities to enhance their knowledge of agroforestry principles, species selection, land design, and long-term maintenance (Reij, Tappan, Smale, 2009).

3. Provide Financial and Technical Incentives. Establishing agroforestry systems requires initial investments that may be beyond the capacity of smallholder farmers. The government should consider providing subsidies, microloans, or tax breaks for farmers who adopt sustainable land use practices, including agroforestry. Additionally, support should be provided for nurseries that produce climate-resilient and locally adapted tree species (Jose, 2009).

4. Incorporate Agroforestry into Climate and Land Use Planning. Agroforestry should be fully integrated into Azerbaijan's Nationally Determined Contributions (NDCs), National Adaptation Plans (NAPs), and Land Degradation Neutrality (LDN) commitments. This alignment would not only strengthen the country's climate resilience but also attract international climate finance and technical assistance (Guliyev, Mammadova, 2018)

5. Promote Research and Data Collection. Local research is essential to identify the most effective and economically viable agroforestry systems for different regions. Universities and research centers should be supported to conduct studies on carbon sequestration, soil health, water retention, and yield improvement under various agroforestry models. Data gathered from these studies can guide evidence-based policymaking and extension services.

## Conclusion

Climate change presents a serious threat to the sustainability of agricultural systems in Azerbaijan. Rising temperatures, increased frequency of droughts, and land degradation have already begun to impact productivity, rural livelihoods, and food security. In this context, agroforestry offers a promising nature-based solution that aligns environmental restoration with economic resilience. This paper has explored the concept of agroforestry and its potential benefits in the context of Azerbaijan. Agroforestry systems enhance climate adaptation by stabilizing soils, increasing carbon sequestration, and supporting biodiversity. At the same time, they provide socio-economic advantages such as diversified income sources, improved crop yields, and better livestock

health. As Azerbaijan navigates a future of climate uncertainty, agroforestry stands as a viable and forward-looking approach. Its success, however, will depend on coordinated action among policymakers, scientists, farmers, and development partners.

## References

1. FAO. (2017). *Agroforestry for Landscape Restoration: Exploring the Potential of Agroforestry to Enhance the Sustainability and Resilience of Degraded Landscapes*. FAO.
2. FAO. (2020). *Climate-Smart Agriculture in Azerbaijan: Country Profile*. Food and Agriculture Organization of the United Nations.
3. FAO. (2022). *Agroforestry and Climate-Smart Agriculture in Eastern Europe and Central Asia*. FAO.
4. Garrity, D.P. (2004). Agroforestry and the achievement of the Millennium Development Goals. *Agroforestry Systems*, 61(1), 5–17. https://doi.org/10.1023/B:AGFO.0000028986.37502.7c
5. Guliyev, I., Mammadova, L. (2018). Vulnerability of livestock systems to climate change in Azerbaijan. *Agricultural Policy Review*, 7(2), 41-52.
6. Guliyev, S., Aliyeva, N., Mammadov, T. (2019). Agroforestry awareness and barriers in Azerbaijan. *Journal of Rural Sustainability*, 11(2), 22-33.
7. Huseynov, T., Mammadova, S., Aslanov, A. (2021). Agricultural resilience and ecosystem services in Azerbaijan. *Journal of Environmental Management*, 287, 112345. https://doi.org/10.1016/j.jenvman.2021.112345
8. IPCC (2021). *Sixth Assessment Report: Climate Change 2021 – The Physical Science Basis*. Intergovernmental Panel on Climate Change. https://www.ipcc.ch/report/ar6/wg1/
9. Jose, S. (2009). Agroforestry for ecosystem services and environmental benefits: An overview. *Agroforestry Systems*, 76(1), 1–10. https://doi.org/10.1007/s10457-009-9229-7
10. Mbow, C., Smith, P., Skole, D., Duguma, L., Bustamante, M. (2014). Achieving mitigation and adaptation through agroforestry. *Current Opinion in Environmental Sustainability*, 6, 61-67. https://doi.org/10.1016/j.cosust.2013.09.002
11. MENR – Ministry of Ecology and Natural Resources. (2021). *Nationally Determined Contributions (NDC) Update – Azerbaijan*. MENR.
12. Ministry of Agriculture of Azerbaijan. (2020). *Agricultural Development Strategy 2020–2025*. Government of Azerbaijan.
13. Nair, P.K.R. (1993). *An Introduction to Agroforestry*. Dordrecht: Kluwer Academic Publishers.
14. Reij, C., Tappan, G., Smale, M. (2009). Agroenvironmental transformation in the Sahel: Another kind of “green revolution”. *IFPRI Discussion Paper 00914*. Washington, D.C.: International Food Policy Research Institute (IFPRI).
15. UNCCD. (2021). *Land Degradation Neutrality: Achieving SDG Target 15.3*. Bonn: United Nations Convention to Combat Desertification.
16. World Bank. (2020). *Azerbaijan: Country Land Governance Assessment Report*. World Bank.

Received: 07.03.2025
Approved: 18.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/146-152

**Cavad Əliyev**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
doktorant
https://orcid.org/0009-0006-8505-9256
aliyev.javad@outlook.com

# Neft-mədən avadanlıqlarında AQPÇ-nin qarşısının alınmasında kimyəvi üsulların tətbiqi və onların effektivliyinin qiymətləndirilməsi

## Xülasə

Təqdim edilən məqalə parafinli neft quyularının qaldırıcı borularında və digər nəql xətlərində ağır karbohidrogenlərin çökməsinin qarşısını almaq üçün laboratoriya sınaqlarından uğurla çıxmış KTD-1 reagentinin elmi araşdırmalarının nəticələrinə həsr edilmişdir. Məqalənin əsas aktuallığı parafinli neft quyularının istismarı zamanı yaranan asfalten, qatran, parafin çöküntülərinə (AQPÇ) qarşı texnoloji mübarizə üsuludur. Parafin çöküntülərinin neftdən ayrılmasında əsas amil temperaturdur. Parafin çökütülərinin kristallaşma temperaturu, neftin tərkibindən asılı olaraq 45-55 °C arasında dəyişir. Ağır karbohidrogenlərin qaldırıcı borularda və digər nəql xətlərində çökməsi, laydan yer səthinə və oradan da qəbul məntəqəsinə istiqamətlənən mayenin (neftin) hərəkətinə əks hidravlik müqavimət yaradır. Bu isə AQP-nin çökməsi ilə nəticələnir. Bu məqsədlə KTD-1 reagentiı işlənib hazırlanmışdır. Bu texnologiya asfalten, qətran, parafin və digər ağır karbohidrogenli yataqlarda tətbiq oluna bilər. Laboratoriya şəraitində “soyuq barmaqcıqlar” metodu ilə təyin olunmuşdur ki, bir ton çıxarılan neftə 200 qram hesabı ilə əlavə edildikdə ağır karbohidrogen çöküntülərini 72.5 %-ə qədər azaltmaq mümkündür. Bu reagent ağır karbohidrogenli neftlərin reoloji xüsusiyyətlərinə müsbət təsir göstərməklə, quyunun süzgəc hissəsində, qaldırıcı boruların müxtəlif dərinliklərində, eləcə də quyuağzı atqı xətlərindən başlayaraq neftin qəbuletmə məntəqəsinə qədər olan yerüstü və yeraltı komunikasiyalarda çökən AQPÇ-nin aradan qaldırılmasını təmin edir. Nəticədə quyunun ritmik işləməsi bərpa edilir, layın neftverimi artır. Bu isə öz növbəsində quyularda təmirlərarası müddəti 2,5 dəfə artıra bilər ki, bu da iqtisadi cəhətdən çox əlverişlidir.

***Açar sözlər:*** *parafin, asfalten, qatran, reagent, çöküntü, quyudibi zona, özlülük, depressator*

**Javad Aliyev**
Azerbaijan State Oil and Industry University
PhD student
https://orcid.org/0009-0006-8505-9256
aliyev.javad@outlook.com

# Application of Chemical Methods in the Prevention of ATPS in Oilfield Equipment and Evaluation of Their Effectiveness

## Abstract

The presented article is devoted to the results of scientific research on the KTD-1 reagent, which successfully passed laboratory tests to prevent the deposition of heavy hydrocarbons in the risers of paraffin oil wells and other transport lines. The main relevance of the article is the technological method of combating asphaltene-paraffin deposits (ATPS) formed during the operation of paraffin oil wells.

The main relevance of the article is the technological method of combating asphaltene-paraffin deposits (ATPS) formed during the operation of paraffin oil wells. The main factor in the separation of paraffin deposits from oil is temperature. The crystallization temperature of paraffin deposits varies between 45-55 °C, depending on the composition of the oil. The precipitation of heavy hydrocarbons in risers and other transport lines creates a reverse hydraulic resistance to the

 Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

movement of liquid (oil) from the formation to the surface and from there to the receiving point. This results in the precipitation of ATPS. For this purpose, the KTD-1 reagent has been developed. This technology can be applied in asphaltene, tar, paraffin and other heavy hydrocarbon deposits. It was determined in laboratory conditions by the "cold fingers" method that when added at the rate of 200 grams per ton of extracted oil, it is possible to reduce heavy hydrocarbon sediments by up to 72.5%. This reagent has a positive effect on the rheological properties of heavy hydrocarbon oils, ensuring the elimination of ATPS deposited in the filter section of the well, at different depths of the risers, as well as in surface and underground communications starting from the wellhead discharge lines to the oil reception point. As a result, the rhythmic operation of the well is restored, and the oil yield of the formation increases. This, in turn, can increase the repair interval in wells by 2.5 times, which is very economically advantageous.

***Keywords:*** *paraffin, asphaltene, tar, reagent, sediment, bottomhole zone, viscosity, depressant*

## Giriş

Məlumdur ki, neftli layın temperaturundan və onun gündəlik məhsuldarlığından asılı olaraq parafin çöküntüləri quyunun süzgəc hissəsində, qaldırıcı boruların müxtəlif dərinliklərində, eləcə də quyuağzı atqı xətlərindən başlayaraq neftin qəbuletmə məntəqəsinə qədər olan yerüstü və yeraltı avadanlıqlarda çökür.

Ağır karbohidrogenlərin qaldırıcı borularda və digər nəql xətlərində çökməsi, laydan yer səthinə və oradan da qəbul məntəqəsinə istiqamətlənən neft hərəkətinə əks hidravlik müqavimət yaradır ki, nəticədə quyunun ritmik işləməsi pozulur, layın verimi tədricən azalır, bəzən isə istismarın tamam dayanmasına gətirir ki, nəticədə təmir üçün lazım olan əlavə xərclərə və neft itkisinə səbəb olur.

Quyuların istismarı zamanı yaranan asfalten, qatran, parafin çöküntülərinə (AQPÇ) yüksək molekullu karbohidrogenlərin mürəkkəb qarışıqlarından ibarətdir. Bunların əsasını karbon sayı 35-dən yuxarı olan parafin (n-alkanlar, i-alkanlar, tsikloalkanlar və uzun alkillər zəncirlərinə malik alkilaromatiklər), asfaltenlər, qatranlar, yağlar və qeyri-üzvi birləşmələr təşkil edir. Temperaturun tədricən aşağı düşməsi ilə yaranan AQPÇ-nin aradan qaldırılması neft itkisi ilə bərabər, həm də iqtisadi cəhətdən xərclərin artmasına da səbəb olur. AQPÇ xam neftin ən ağır fraksiyalarıdır. Bu fraksiyalardan biri olan asfalten molekulları mürəkkəb struktura və yüksək molekullu kütləyə malikdir. Asfaltenlər əsasən karbon, hidrogen, azot, oksigen və kükürddən həmçinin, vanadium və nikel kimi az miqdarda müəyyən edilmiş komponentlərin qarışığıdır və çox aşağı konsentrasiyalarda belə öz-özünə birləşirlər, bu da onları xam neftin ən çətin komponentlərindən biri edir. Digər bütün karbon və hidrogen atomları alkan zəncirlərində və tsikloalkanalarda yerləşir və halqa qrupları ilə əlaqəlidir (Mitroshin, 2021).

AQPÇ-nin əmələ gəlməsinin intensivliyinə quyudibi təzyiqin azalması və bununla əlaqədar olaraq qaz-maye sistemindəki balansın pozulması, neft axınının quyuda yuxarıya doğru hərəkəti zamanı temperaturun tədricən düşməsi, intensiv qazsızlaşdırma, qarışığın hər bir fazasının tərkibindəki dəyişikliklər və fazaların həcmləri arasındakı nisbətin dəyişməsi, neftdəki metal səthlərə yüksək adgeziya ilə qatran komponentlərinin mövcudluğundan irəli gələn adsorbsiya prosesləri kimi amillər təsir edir. Buna görə də çöküntülərin mövcudluğu və təbiəti sabit deyildir (Adeyanju, 2013).

**Tədqiqat**

Məlum olduğu kimi, neft hasilatında AQPÇ ilə mübarizə iki istiqamətdə aparılır: çöküntülərin əmələ gəlməsinin qarşısının alınması və artıq əmələ gəlmiş çöküntülərin aradan qaldırılması. Əmələ gəlmiş çöküntülərə qarşı mübarizə əsasən aşağıdakı üsullarla həyata keçirilmişdir (Awan, Al-Khaledi, 2014).

-qaldırıcı boruların və ştanqların, quyunun boruarxası fəzasına qızdırılmış neft və yaxud suyun vurulması yolu ilə təmizlənməsi;

-quyuağzı avadanlığın və qaldırıcı boruların yuxarı hissəsinin səyyar buxar generatoru vasitəsilə təmizlənməsi;

-atqı xəttlərinin səyyar buxar generatoru vasitəsilə təmizlənməsi;

-qaldırıcı borularının və atqı xəttlərinin həlledicilərlə təmizlənməsi;

-kimyəvi reagentlərin tətbiqi. Bu üsullar müəyyən səmərəlilik göstərsə də aşağıda izah olunan bir sıra mənfi cəhətləri və tətbiq sahələri ilə məhdudlaşır Həlledicilərdən istifadə zamanı, xüsusilə onların həllediciliк xüsusiyyətlərindən asılı olaraq, parafin çöküntülərinə qarşı mübarizədə yüksək effektivlik əldə edilə bilər. Lakin bu metod böyük həcmdə həlledici sərfini tələb edir, çünki həlledicinin təsiri birdəfəlik olur və hər bir quyunun təmizlənməsi üçün təxminən 6–18 m³ həlledici tələb olunur. Quyuların mütəmadi olaraq təmizlənməsi və parafinlə çirklənmiş quyu fondunun genişliyi nəzərə alındıqda, ümumi həlledici tələbatının miqyası aydın olur. Belə böyük həcmdə həlledicinin istehsalı, daşınması, yerləşdirilməsi və saxlanması isə bu üsulun geniş miqyasda tətbiqini çətinləşdirir (Markin, Nizamov, Sukhoverkhov, 2011).

Parafindən təmizləmə prosesi həmçinin qaldırıcı boruların və ştanqların, eləcə də quyunun boruarxası fəzasına qızdırılmış neft və ya suyun vurulması ilə də həyata keçirilə bilər. Bu metod üçün bir vurucu aqreqat, bir avtosistern və iki səyyar buxar generatoru tələb olunur. Proses zamanı 3-8 m³ həcmində neft və ya su quyu ağzında 80-90 ºC temperaturadək qızdırılaraq, quyunun iş rejimini pozmadan boruarxası fəzaya ötürülür (Adeyanju, 2013).

Aparılmış praktiki və nəzəri tədqiqatlar göstərir ki, bu şəkildə 80-90 ºC-yə qədər qızdırılmış mayenin istilik ötürmə dərinliyi, yəni təsir məsafəsi 300-500 metr aralığını keçmir. Bu məhdudluğun əsas səbəbi səmərəsiz istilik itkiləri və qızdırıcı ilə qızdırılan axınlar arasında qısa məsafədə baş verən intensiv istilik mübadiləsidir bu, əks istiqamətli istilik ötürmə sistemlərinin tipik xüsusiyyətidir.

Qeyd etmək lazımdır ki, quyu ağzında səyyar buxar generatoru vasitəsilə qaldırılmış ştanq və boruların parafindən təmizlənməsi ekoloji standartlara ziddir. Bu proses üçün xüsusi texnoloji prosedurların mövcud olmaması səbəbindən parafinin toplanması təmin edilmir və nəticədə ətraf mühitin çirklənməsi qaçınılmaz olur.

Bu üsullardan ən səmərəlisi kimyəvi tərkiblərin qarışığından ibarət müxtəlif tipli kompozisiyaların tətbiqidir. Kimyəvi üsul başqaları ilə müqayisədə ucuz başa gələn, tətbiqin texnologiyası isə çox sadə və təhlükəsizdir.

Quyuların və nəqliyyat boru kəmərlərinin içində hər hansı bir potensial çökməni proqnozlaşdırmaq, iqtisadi baxımdan fasiləsiz neft axınının təchizatı üçün vacibdir. Son illərdə AQPÇ-nin yaranması və çökmə miqdarını proqnozlaşdırmaq üçün bir neçə fərqli model təklif edilmişdir. Neft sənayesində AQPÇ ilə mübarizə aparmaq üçün ən çox istifadə olunan və fəal şəkildə tətbiq edilən bir neçə metod mövcuddur. Bu problemin həllinin ən yaxşı metodlarından biri iqtisadi, texniki və ekoloji baxımdan çöküntülərin qarşısını almaq üçün kimyəvi üsulun tətbiqidir. Kimyəvi reagentlərin tətbiqi AQPÇ-nin əmələ gəlməsinin və əmələ gəlmiş mürəkkəbləşmələrin qarşısını almaq üçün ən mütərəqqi üsuldur. Lakin müxtəlif kimyəvi maddələr fərqli termobarik şərtlərdə fərqli növ xam neftlərə müxtəlif təsir göstərir ki, bu da onların emalını çətinləşdirir (Carcia, 2021). Quyuların istismarı zamanı neftin fiziki-kimyəvi xassələri dəyişdikcə, inhibitorun effektivliyi əhəmiyyətli dərəcədə azalır. Bunun üçün AQPÇ-nin qarşısını almaqla bağlı müxtəlif növ xam neftlərə uyğun kimyəvi maddələrin növü və seçimi ilə bağlı çoxsaylı tədqiqatlar aparılmışdır.

Respublikada neftin hasilatı, nəqli və hazırlanmasının texnoloji proseslərində törənən əngəlliklərə qarşı mübarizədə kimyəvi reagentlərin tətbiqi aktualdır. Quyularda bu çöküntülərlə əlaqədar yaranan mürəkkəbləşmələr araşdırılmış və bu qənaətə gəlinmişdir ki, neftqazçıxartma idarələrində (NQÇİ) AQP çöküntüləri ilə əlaqədar çoxlu vəsait sərf olunur ki, bu da neftin maya dəyərinin artmasına və təmirarası müddətin azalmasına səbəb olur.

Neft-mədən avadanlıqlarında AQP çöküntüləri ilə əlaqədar ortaya çıxan əngəlliklərə qarşı yeni kimyəvi reagentlərin tapılması, nümunələrin toplanması və bunların ağır karbohidrogen çöküntülərinə qarşı tətbiqinin ilkin laboratoriya tədqiqatlarının keçirilməsi (ağır karbohidrogenli neft nümunələri “soyuq barmaqcıq” qurğusunda kəmiyyətcə və donma temperaturu keyfiyyətcə yoxlanılır) vacibdir (Gurbanov, 2023; Metiyev, 2016).

Reagentlərin AQP çökməsinə qarşı effektivliyinin qiymətləndirilməsi üçün “soyuq barmaqcıq” üsulu geniş şəkildə istifadə olunur (Lutoshkin, 2005). Bu yanaşma mədən şəraitinə daha uyğun hesab edilir və reagentlərin parafin çökməsinə qarşı təsirini həm keyfiyyət, həm də kəmiyyət baxımından dəyərləndirməyə imkan verir. Metod effektiv parafin çökmə inhibitorunun müəyyən

edilməsinə və onun tətbiq texnologiyasının hazırlanmasına şərait yaradır. Həmçinin, bu üsul reagentin sərfi ilə əldə olunan səmərəlilik arasında qarşılıqlı əlaqənin qurulmasına imkan verir

Parafinli neftlər reoloji xüsusiyyətlərinə görə qeyri-müvazinətli xassəyə malikdirlər. Hal-hazırda parafinli neftlərin hasilatı, nəqli zamanı quyuda və nəql borularında çökən AQPÇ-nin qarşısının alınması məqsədilə donma temperaturunu aşağı salan depressor xassəli reagentlərin geniş çeşidlərindən istifadə edilir (Matiev, Agazade, Keldibaeva, 2018). Difenilaminlə modifikasiya olunmuş etilenin vinilasetatla birgə sopolimerindən ibarət reagent AQPÇ-yə qarşı mübarizə üsulu kimi məlumdur (Ismayilov, 2020). Aromatik karbohidrogenin dizel yanacağı ilə qarışığından aşqarın həlledicisi kimi istifadə edilir. Çatışmayan cəhəti tətbiqinin məhdudluğudur. Səbəb müxtəlif neftlər üçün tərkibi keyfiyyətcə fərqlənən və ya eyni tərkibdə, lakin monomer manqaları müxtəlif cür növlənən birgə polimerdən istifadə olunmasıdır (Matiyev, Agazade, Akhmedov, 2016).

Parafinli neft məhsulları üçün EAN markalı depressor aşqarı da məlumdur (Ismayilov, 2020). Məlum polimer aşqara etilenin akrilonitril və etilenin terpolimerlərinin akrilonitrillə birgə polimeri, monomer qrupdan vinilasetat, akrilakrilatlar, alkilvinil efirləri, vinilxlorid, akril turşusu daxildir. EAN 18 depressoru kimi kütləcə 18 % akrilonitril saxlayan etilen-akrilonitril birgə polimerindən istifadə olunur. Depressor aşqarının həll olması üçün neft məhsulu 50 $^{o}$C-yə qədər qızdırılır. Depressor aşqarının çatışmayan cəhəti tətbiq spektrinin məhdud olmasıdır. Bundan başqa, depressatorun daxil edilməsi üçün xeyli miqdarda yanacağın qızdırılması iqtisadi cəhətdən məqsədəuyğun sayılmır

(White, Pierce, 2018).

Yuxarıda adları sadalanan reagentlərin tətbiqində mövcud olan çatışmamazlıqların aradan qaldırılması məqsədilə səmərəlilyinə görə onlardan daha üstün hesab edilən və şərti adı KTD-1 olan reagent işlənilib hazırlanmışdır. 20-30% depressator xassəsinə malik komponent kimi “Champion Technologies” şirkətinin istehsalı olan qeyri-ionogen xassəli Flexoil CW 288 reagenti və qalan hissəni üzvi həlledici qismində stabil qaz kondensatı (SQK, TU 51-05751745-09-97) təşkil edir.

KTD-1 olan reagentinin AQPÇ-ə qarşı effektivliyi N.Nərimanov NQÇİ-dən götürülmüş və tərkibində parafinin miqdarı 19.8 % təşkil edən neft nümunələrində aparılmışdır. Laboratoriya tədqiqatlarının nəticələri müqayisəli şəkildə cədvəl 1-də verilmişdir.

Cədvəl 1

| Reagentin markası | Reagentin sərfi, q/t neft | Çöküntünün azalması,% |
|---|---|---|
| KTD-1 | 50 | 26,7 |
| | 100 | 35,5 |
| | 150 | 60,0 |
| | 200 | 75,0 |
| | 250 | 73,0 |
| | 300 | 71,5 |
| KTD-2 | 50 | 13,0 |
| | 100 | 20,0 |
| | 150 | 32,6 |
| | 200 | 45,0 |
| | 250 | 53,0 |
| | 300 | 48,0 |
| KTD-3 | 50 | 12,7 |
| | 100 | 30,0 |
| | 150 | 38,4 |
| | 200 | 45,0 |
| | 250 | 48,0 |
| | 300 | 41,5 |
| KTD-4 | 50 | 10,0 |
| | 100 | 42,0 |
| | 150 | 45,0 |
| | 200 | 38,0 |

| | | |
|---|---|---|
| | 250 | 30,0 |
| | 300 | 30,0 |
| СНПХ-2005 | 50 | 12,0 |
| | 100 | 23,0 |
| | 150 | 30,0 |
| | 200 | 45,0 |
| | 250 | 28,4 |
| | 300 | 22,5 |

Sözügedən reagentin optimal dozası hasil olunan hər ton neft üçün 200-300 q aralığında təşkil edir. Tədqiqatlar zamanı nəzərə çarpacaq nəticələri əldə etmək üçün əvvəlcə yüksək miqdarda reagent sərfindən istifadə edilmişdir.

Cədvəl 1-dən göründüyü kimi KTD1-4 markalı reagentlər 50-300q\t sərflərdə AQPÇ-nə qarşı, məlum СНПХ-2005 reagenti ilə müqayisədə xeyli üstünlüyə malkdirlər. Ən yüksək təsir effekti KTD-1 regenti göstərmişdir. Belə ki, bu reagentin təsir effekti 200q\t sərfində 75% təşkil edir. Qeyd etmək lazımdır ki, bu göstərici parafinli neftlər üçün yüksək nəticə sayıla bılər (Syroezhko, Begak, 2004).

Sonrakı tədqiqat mərhələsində KTD-1 reagentinin kinematik özlülüyünün temperaturdan asılılığı öyrənilmişdir. Tədqiqatlar Stabinger Viscometer -SVM-3000 cihazında tədqiq olunmüşdur.




**Şəkil 1.** Kinematik özlülüyün temperaturdan asılılığı qrafiki

Şəkil 1-də reagent əlavə edilmiş və edilməmiş neft nümunələrinin kinematik özlülüklərinin temperaturdan asılı olaraq dəyişməsi göstərilmişdir. Şəkil 1-dən görünür ki, effektiv özlülüyün temperaturdan asılılığı zamanı sürüşmə sürətinin sabit qiymətində araffin re artdıqca özlülük azalır. Neft nümunələrinin effektiv özlülüyünün temperaturdan asılılıq əyrilərindəki qırılma, neftdə bərk üzvi maddə strukturunun formalaşmasının başlanmasını göstərir. Əldə edilən tədqiqat nəticələri göstərir ki, neftə kimyəvi kompozisiyaların əlavə edilməsi neftin parafinlə doyma temperaturunun azalmasına səbəb olur. Tədqiqatların tam nəticələri cədvəl 2-də verilmişdir (Carcia, 2001).

Reagentlərin neftlərin parafinlə doyma temperaturunun təsirinin nəticələri (Cədvəl 2)

| Reagentin markası | Neftin parafinlə doyma |
|---|---|

| | Temperaturu, $^0$C |
|---|---|
| reagentsiz | 40,7 |
| KTD-1 | 31,2 |
| KTD-2 | 32,5 |
| СНПХ-2005 | 35,8 |
| KTD-4 | 32,3 |

Aparılan təcrübələrin nəticələri belə düşünməyə əsas verir ki, tədqiq olunan reagent həm də depressant xassəsi göstərir və parafin kristallarının səthində solvat təbəqəsi əmələ gətirməsi səbəbindən bərk parafin molekullarının birləşməsinə maneə yaratmaqla, parafin kristallarının əmələ gəlməsi və böyüməsinin kinetikasını ləngidir (Dobbs, 1999). Reagentin formalaşmış üzvi strukturlara təsirini müəyyənləşdirmək üçün rotasion viskozimetrdə sürüşmə gərginliyinin sürüşmə sürətindən asılılığı tədqiq edilərək şəkil 2-də verilmişdir.




**Şəkil 2**. Sürüşmə gərginliyinin sürüşmə sürətindən asılılığı qrafiki

Şəkil 2-dən göründüyü kimi KTD-1 reagenti sürüşmə sürətinin yüksək qiymətlərində neftdəki parafin kristallarının yaratdığı strukturu dağıdaraq neftin axıcılığını yaxşılaşdırır (Mitroshin, 2021).

Tərkibində AQP olan neftlərin hasilatının texnoloji proseslərində temperaturun tədricən düşməsi ilə neftin hərəkətliliyində nəzərə çarpacaq dərəcədə qatılaşma müşayiət olunur. Neftin hərəkətinin reoloji parametrləri verilmiş temperaturda toxunan sürüşmə gərginliyinin və müəyyən bir temperaturda kəsilmə həddi gərginliyi, neftdə əmələ gələn strukturların dağılmasının ilkin şərtlərini təyin etməklə, onun axın qabiliyyətini də xarakterizə edir (Metiyev, Alsafarova, Emel, 2023).

Neftə qeyri-ionogen xassəli səthi aktiv maddələrin əlavə edilməsi ilə reagentin peptizasiya qabiliyyətinə görə xam neftlə müqayisədə neftdə əmələ gələn strukturların əhəmiyyətli şəkildə azalması müşahidə edilmişdir. Aparılan təcrübələrin nəticələri göstərir ki, KTD-1 reagent əlavə edildikdə, 45-50$^o$C-də neftdə praktik olaraq bir yerə yığılaraq kristallaşmış strukturlar əmələ gəlmir.

## Nəticə

- AQPÇ-yə qarşı yeni KTD-1 reagenti işlənilib hazırlanmışdır.
- Reagentin tətbiqi zamanı optimal miqdar 200 qr/ton təyin edilmişdir.
- KTD-1 reagenti təmirlərarası müddəti 2,5 dəfə artırdığına görə iqtisadi cəhətdən çox əlverişlidir.
- Bu reagent ağır karbohidrogenli neftlərin reoloji xüsusiyyətlərinə müsbət təsir göstər.

## Ədəbiyyat

1. Adeyanju, A.O. (2013). Experimental Study of Wax Deposition in a Single Phase Sub-cooled Oil Pipelines. *SPE Nigeria Annual International Conference and Exhibition. Society of Petroleum Engineers, 5–7 August*, pp. 157–169.
2. Alsafarova, M.E., Samadov, A.M., Matiyev K I., Ganbarova, J. G. (2024). Development of a new reagent for the prevention of asphaltene-resin-paraffin deposits. *Scientific Petroleum*, №1, pp. 50–53.
3. Awan, M.A., Al-Khaledi, S.M. (2014). Chemical treatments practices and philosophies in oilfields. *SPE International Oilfield Corrosion Conference and Exhibition.*
4. Carcia, M. (2001). *Paraffin Depozition in oil Production.*
5. Dobbs, J.B. (1999). A unique method in paraffin control in production operation. *Paper presented at the 1999 SPE Rocky Mountain Regional Meeting.*
6. Gurbanov, A.Q., Hajikerimova, L.Q., Akperova, A.F. (2023). New inhibitor against asphaltene-resin-paraffin deposits and salts. *Scientific Petroleum,* № 2, pp. 41–47.
7. Ismayilov, F.S. (2020). *Depressor aşqarı.*
8. Lutoshkin, G.S. ( 2005). *Sbor i podgotovka nefti, gaza i vody.*
9. Manafov, M.R., Kelbaliev, G.I. (2020). Analysis of the modern state of researches on deposition of asphalt-resin substances, paraffin and modeling methods. *Azerbaijan Chemical Journal,* № 2, pp. 8–14.
10. Markin, A.N., Nizamov, R.E., Sukhoverkhov, S.V. (2011). *Neftepromyslovaya khimiya: prakticheskoe rukovodstvo.*
11. Matiyev, K.I., Agazade, A.D., Alsafarova, M.E., Akhmedov, F.M. (2018). Pour-Point Depressant for High Pour-Point Paraffinic Oils. *SOCAR Proceedings,* №3, pp. 32–37.
12. Matiev, K.I., Agazade, S.S., Keldibaeva. (2016). Composition for removing asphalt-resin-paraffin deposits. *SOCAR Proceedings*, №4, pp. 64–68.
13. Metiyev, K.I., Samadov, A.M., Alsafarova, M.E., Hasanov, Kh.I., Nurullayev, V.K. (2024). Prevention of asphaltene-resin-paraffin deposits in the process of oil transportation. *SOCAR Proceedings*, №2, pp. 101–105.
14. Metiyev, K.I., Alsafarova, M.E., Emel, N.I. (2023). Methods for combating asphalt resin and paraffin deposits in the oil industry. *Scientific Petroleum*, №2, pp. 35–40.
15. Mitroshin, A.V. (2021). Determination of the Minimum Measures in the Well to Prevent the Formation of Asphalt-Resin-Paraffin Deposits. *Perm Journal of Petroleum and Mining Engineering*, vol. 21, № 2, pp. 94–100.
16. Syroezhko, A.M., Begak, O.Yu., Fedorov, V.V. (2004). Vzaimosvyaz' strukturno-gruppovogo sostava gudronov i bitumov iz neftey razlichnoy prirody s ikh ekspluatatsionnymi parametrami. *Zhurnal prikladnoy khimii*, № 4, pp. 661–669.
17. Vozka, P., Straka, P., Maxa, D. (2015). Effect of asphaltenes on structure of paraffin particles in crude oil. *Paliva*, Vol. 7, №2, pp. 42–47.
18. White, M., Pierce, K., Acharya, T.A. (2018). Review of Wax-Formation Mitigation. *Technologies in the Petroleum Industry*, vol. 33, pp. 476–485.

Daxil oldu: 21.03.2025
Qəbul edildi: 24.06.2025

**RİYAZİYYAT VƏ MEXANİKA**
**MATHEMATICS AND MECHANICS**

DOI: https://doi.org/10.36719/2789-6919/46/153-157

**Lalə Qocayeva**
Gəncə Dövlət Universiteti
riyaziyyat üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0006-5698-1639
lalaqocayeva1@gmail.com

# Müasir təlim texnologiyalarının riyaziyyat dərslərində tətbiqi

## Xülasə

Məqalədə müasir təlim texnologiyalarının riyaziyyat dərslərində tətbiqinin əhəmiyyəti və üstünlükləri araşdırılmışdır. 21-ci əsr informasiya texnologiyalarının və rəqəmsal dünyanın inkişaf dövrüdür. Təhsil sistemi də bu inkişafdan geridə qala bilməz. Ənənəvi təlim metodlarının müasir dövrün tələblərinə cavab verməməsi, şagirdlərin marağını və aktivliyini azaltması təhsil sahəsində yeniliklərin tətbiqini zəruri edir. Riyaziyyat isə təfəkkür və məntiqin əsas təməlidir və bu fənnin tədrisində texnologiyaların tətbiqi şagirdlərin həm dərsi daha yaxşı qavramasına, həm də riyazi düşüncə qabiliyyətinin inkişafına müsbət təsir göstərir.

Texnologiyaların istifadəsi dərslərin daha interaktiv, vizual və şagird- yönümlü keçirilməsinə imkan yaradır. Müəllimlər üçün praktik tövsiyələr və istifadə edilə bilən rəqəmsal resurslar təqdim olunmuş, adaptiv öyrənmə və avtomatlaşdırılmış qiymətləndirmə metodlarının tətbiqi izah edilmişdir. Nəticədə, bu texnologiyalar riyaziyyat tədrisinin keyfiyyətini artırmaq və şagirdlərin motivasiyasını yüksəltmək üçün effektiv vasitə kimi dəyərləndirilmişdir.

***Açar sözlər:*** *elektron təhsil, riyaziyyat, rəqəmsal resurslar, innovasiya, İKT, təlim, texnologiya*

**Lala Gojayeva**
Ganja State University
PhD in Mathematics
https://orcid.org/0009-0006-5698-1639
lalaqocayeva1@gmail.com

# Application of Modern Training Technologies in Mathematics Lessons

## Abstract

The article examines the importance and advantages of using modern learning technologies in mathematics lessons. The 21st century is a period of development of information technologies and the digital world. The education system cannot lag behind this development. The failure of traditional teaching methods to meet the requirements of the modern era and the reduction of students' interest and activity necessitate the application of innovations in the field of education. Mathematics is the main basis of thinking and logic, and the application of technologies in teaching this subject has a positive effect on both students' better understanding of the lesson and the development of mathematical thinking skills.

The use of technologies allows for more interactive, visual and student-centered lessons. Practical recommendations and usable digital resources for teachers are presented, and the application of adaptive learning and automated assessment methods is explained. As a result, these technologies are evaluated as effective tools for improving the quality of mathematics teaching and increasing student motivation.

***Keywords:*** *e-learning, mathematics, digital resources, innovation, ICT, training, technology*

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

## Giriş

21-ci əsr informasiya texnologiyalarının və rəqəmsal dünyanın inkişaf dövrüdür. Təhsil sistemi də bu inkişafdan geridə qala bilməz. Ənənəvi təlim metodlarının müasir dövrün tələblərinə cavab verməməsi, şagirdlərin marağını və aktivliyini azaltması təhsil sahəsində yeniliklərin tətbiqini zəruri edir. Riyaziyyat isə təfəkkür və məntiqin əsas təməlidir və bu fənnin tədrisində texnologiyaların tətbiqi şagirdlərin həm dərsi daha yaxşı qavramasına, həm də riyazi düşüncə qabiliyyətinin inkişafına müsbət təsir göstərir.

Müasir təhsil yanaşmaları interaktiv metodlar üzərində qurulur. Fərqli bilik səviyyəsinə və anlama bacarığına malik şagirdlərin eyni sinifdə aktiv şəkildə iştirak etməsi, onların müstəqil idrak fəaliyyətlərinin gücləndirilməsi və şagirdlərin fərdi şəxsiyyət kimi qiymətləndirilməsi bu təlimin əsas xüsusiyyətlərindəndir. Tədris prosesində xüsusilə, riyaziyyat dərslərində məntiqi düşüncəyə üstünlük verilməsi həmçinin, əqli nəticə çıxarma qabiliyyətinin inkişaf etdirilməsi interaktiv təlimə xasdır.

Müasir təlim texnologiyalarının riyaziyyat dərslərində tətbiqi mövzusu həm pedaqoji, həm də texnoloji baxımdan olduqca aktualdır. Bu yanaşma şagirdlərin dərsi daha yaxşı mənimsəməsi, motivasiyanın artırılması və riyaziyyata marağın inkişaf etdirilməsi məqsədilə tətbiq olunur.

Riyaziyyat tədrisi hər zaman məntiqi düşüncə, problem həlletmə və analitik bacarıqların formalaşmasında mühüm rol oynayıb. Lakin bu fənnin abstrakt və kompleks xarakteri səbəbindən bir çox şagirdlər üçün anlaşılması çətin olur və bu onların dərsə marağını azalda bilir. Ənənəvi təlim metodlarının bu kimi problemləri tam şəkildə aradan qaldıra bilməməsi fonunda, müasir təlim texnologiyalarının tətbiqi aktuallıq qazanır (Quliyev, 2009).

Bununla yanaşı, pandemiya dövründə təhsilin onlayn formata keçməsi texnologiyaların vacibliyini daha da artırdı. Bu vəziyyət göstərdi ki, müəllimlərin və şagirdlərin texnoloji bacarıqlara yiyələnməsi, rəqəmsal platformalarla işləmək vərdişlərinin formalaşdırılması artıq lüks deyil, zərurətdir. Postpandemiya dövründə belə texnologiya əsaslı təlim modelləri təhsilin ayrılmaz hissəsinə çevrilmişdir.

Eyni zamanda, təhsildə fərdi yanaşma, adaptiv təlim, interaktivlik və əyləncəli öyrənmə prinsiplərinin həyata keçirilməsi üçün müasir texnologiyalar geniş imkanlar yaradır. Bu, şagirdlərin dərsə fəal şəkildə cəlb olunmasını, onların öz biliklərini praktik olaraq tətbiq etməsini və kritik düşünmə bacarıqlarının inkişafını dəstəkləyir.

Qloballaşan dünyada təhsilin keyfiyyət göstəricilərinin artırılması üçün ölkəmizdə də müasir texnologiyaların tədris prosesinə inteqrasiyası gündəmdədir. Dövlət səviyyəsində rəqəmsal təhsilin inkişafı ilə bağlı müxtəlif proqram və layihələrin həyata keçirilməsi bu sahənin aktuallığını bir daha təsdiqləyir.

Riyaziyyat dərslərində interaktiv üsulların tətbiqi, tədris zamanı qarşıya çıxan bir çox maneələrin aradan qaldırılmasına imkan yaradır. Bu metodun başlıca xüsusiyyəti ondan ibarətdir ki, o, şagirdlərin zehni fəallığını və sərbəst çalışma bacarıqlarını əsas götürür. Şəxsi inkişaf bu təlim modelində ön planda yer alır. Qeyd olunan texnologiyalar təlimin əsas məqsədi kimi deyil, əksinə, şagirdləri düşünməyə sövq edən və aktiv öyrənməni təmin edən vasitə kimi çıxış edir (Həmidov, 1996; Həmidov, 1990).

**Tədqiqat**

Müasir təlim texnologiyaları dedikdə şagirdlərin öyrənmə prosesini asanlaşdırmaq, dərsi daha interaktiv və maraqlı etmək məqsədilə tətbiq olunan elektron, rəqəmsal və texnoloji vasitələr başa düşülür. Bu texnologiyalar vasitəsilə müəllimlər dərsi daha canlı və vizual şəkildə təqdim edə bilir, bu isə şagirdlərin yaddaşında uzun müddət qalır.

Əsas müasir təlim texnologiyalarına aşağıdakılar daxildir (Nəzərov, 2012).

- İnformasiya-kommunikasiya texnologiyaları (İKT);
- Multimedia resursları (video, animasiya, simulyasiya);
- İnteraktiv lövhələr və planşetlər;
- Elektron tədris platformaları;
- Adaptiv öyrənmə sistemləri.

Rəqəmsal texnologiyaların təhsildə istifadəsi ilə bağlı bütün uğurlar kommunikasiya sistemlərinin qurulması, informasiya axınının idarə olunması, məlumat və bilik ehtiyatlarının yaradılıb dəstəklənməsi hamısı bir məqsədə yönəlməlidir. İnformasiya-kommunikasiya texnologiyalarının təhsil sahəsində tətbiqinə dair elmi-metodoloji bazanın formalaşdırılması müasir dövrdə qarşıda duran əsas vəzifələrdən biri isə kompüterlərin təhsil prosesinə səmərəli, düzgün və sağlam şəkildə inteqrasiyasıdır. Kompüter əsaslı təlim isə öz növbəsində, informasiya texnologiyalarının prinsiplərinə söykənən və rəqəmsal vasitələrlə həyata keçirilən öyrənmə formasıdır. Kompüter texnologiyalarına əsaslanan tədrisin klassik təlim üsullarından əsas fərqi, kompüterin daim yenilənən və çevik öyrənmə aləti kimi istifadəsidir. Elektron təhsil infrastrukturu müxtəlif rəqəmsal texnologiyaların birləşməsini təmin edir. Bu sistemə kompüter şəbəkələri, portativ cihazlar, interaktiv lövhələr, planşetlər, smartfonlar, internet və digər oxşar vasitələr daxildir. Kompüter yalnız elektron dərslik funksiyasını yerinə yetirmir. O, dərs materiallarını, testləri, məlumat bazalarını, elmi ədəbiyyatları, fənlər üzrə məlumat toplusunu və tapşırıq dəftərlərini özündə birləşdirən kompleks bir resursdur. Rəqəmsal texnologiyalar həm təlimin effektivliyini artırmağa, həm də öyrənmə prosesini sürətləndirməyə kömək edir. Eyni zamanda, bu texnologiyalar komanda şəklində işləmək və qarşılıqlı əməkdaşlıq üçün əlverişli bir şərait yaradır (Məmmədova, 2017).

Tələbələr kompüterdən istifadə etməklə ümumi tapşırıqları icra edə, eyni zamanda müəllimlərin dəstəyindən yararlana bilirlər. Avropa ölkələrində uzun müddətdir ki, informasiya texnologiyaları təhsilin keyfiyyətinin yüksəldilməsində səmərəli bir vasitə kimi qiymətləndirilir. Müasir texnologiyalardan düzgün şəkildə istifadə edildikdə bu, ibtidai, orta o cümlədən ali təhsil pillələrində tədrisin səviyyəsini artırmağa, həmçinin, intellektual cəmiyyətin daha sürətlə formalaşmasına təkan verə bilər. Hərçənd ki, müxtəlif ölkələrin təhsil modelləri bir-birindən fərqlənir, istifadə olunan texnoloji vasitələr də bu fərqliliyə uyğun dəyişir.

Müasir təhsil sistemində idraki inkişafın meyarlarını nəzərə almaq həmçinin, bu inkişaf üçün uyğun imkanlar yaratmaq əsas prioritet kimi qəbul edilir. Təlim prosesi birbaşa olaraq inkişafı təşviq edən bir fəaliyyət növü kimi təşkili önəmli məqsədlərdən birinə çevrilmişdir. Eyni zamanda, təhsilin yüksək səviyyədə təşkili və onun rəqabətədavamlı olması vacib şərtlər kimi ön planda dayanmalıdır. Keyfiyyət anlayışı yalnız verilən biliklə məhdudlaşmır, burada şagirdlərin təlim prosesində əldə etdikləri dəyərlər və bacarıqlar, yəni kompetensiyalar da əhəmiyyətli yer tutur. Bu kompetensiyalar şagirdin zehni fəaliyyəti, emosional vəziyyəti və psixomotor bacarıqları ilə bağlı olub onun kompleks şəxsiyyət kimi formalaşma səviyyəsini əks etdirir. Belə dəyərlər, sadəcə öyrənilən və hələ tam bacarıq səviyyəsinə çatmamış bilik və vərdişlərdən fərqlənir (Hacıyev, 2017).

Riyazi əməliyyatlar, funksiyalar və tənliklərin öyrədilməsində kompüter əsaslı proqramlar (məsələn, GeoGebra, Desmos) istifadə olunur. Bu proqramlar vasitəsilə funksiyaların, qrafiklərin, həndəsi fiqurların və digər riyazi anlayışların animasiya və üçölçülü modellər şəklində təqdimatı şagirdlərdə vizual təfəkkürü inkişaf etdirir. Bu isə anlayışın dərinləşməsinə və yadda qalmasına kömək edir. Məsələn, ənənəvi şəkildə bir dairənin sahəsi sadəcə formul kimi təqdim edilirsə, animasiya vasitəsilə onun necə yaranması vizual olaraq göstərilir və bu şagirdlərin mövzunu daha yaxşı qavramasına səbəb olur (Ağayev, 2006).

Ənənəvi lövhə üzərində çəkilən fiqurlar şagirdlərin məkan təsəvvürünün inkişafına kifayət etməyə bilər. Lakin 3D modellər və artırılmış reallıq texnologiyaları vasitəsilə üçölçülü fiqurların vizual təqdimatı şagirdlərdə daha güclü məkan anlayışı formalaşdırır.

Onlayn test sistemləri dərs sonrası qiymətləndirmənin sürətli və obyektiv aparılmasını təmin edir. Müəllimlər əlavə vaxt sərf etmədən şagirdlərin bilik səviyyəsini qiymətləndirə və dərhal nəticələrə baxa bilirlər. Bu, həm də şagirdlərin öz səhvlərini vaxtında görüb düzəltməsinə şərait yaradır. Beləliklə, dərs prosesində fasiləsiz geribildirim sistemi yaranır.

Adaptiv təlim sistemləri şagirdin bilik səviyyəsinə və öyrənmə sürətinə uyğun material təqdim edir. Bu yanaşma zəif və güclü şagirdlər üçün fərdi tədris imkanları yaradır və nəticələrin yüksəlməsinə səbəb olur.

Texnologiya ilə zənginləşdirilmiş dərslər monotonluğu aradan qaldırır və dərsin interaktivliyini artırır. Müxtəlif oyunlaşdırılmış testlər, video dərslər, simulyasiyalar şagirdlərin diqqətini cəlb edir və dərsə qarşı müsbət münasibət formalaşdırır. Bu da nəticədə motivasiyanın artmasına və öyrənmə prosesinin məhsuldarlığının yüksəlməsinə gətirib çıxarır. Şagirdlər təhsili sadəcə məcburiyyət kimi deyil, maraqlı və əyləncəli proses kimi qəbul etməyə başlayır (Tahirov, Namazov, Əfəndi, Qasımov, Abdullayeva, 2017).

Hər bir şagirdin öyrənmə sürəti, qabiliyyəti və zəif cəhətləri fərqlidir. Müasir təlim texnologiyaları adaptiv tədris proqramları vasitəsilə şagirdin fərdi ehtiyaclarına uyğun dərs materialı təqdim edir. Beləliklə, zəif şagirdlər əlavə dəstək alarkən, güclü şagirdlərə daha çətin və dərindən öyrənmə imkanı yaradılır. Bu, təhsil prosesinin inklüzivliyini artırır və hər bir şagirdin potensialının maksimum realizə olunmasına şərait yaradır.

Texnologiyaların tətbiqi dərsin planlaşdırılması və həyata keçirilməsi prosesini asanlaşdırır. Müəllimlər elektron platformalar vasitəsilə dərs materiallarını əvvəlcədən hazırlaya və onlayn paylaşa bilir. Şagirdlər isə video və digər multimedia vasitələri ilə mövzuları istənilən vaxt təkrar edə bilirlər. Bu, yaddaşda mövzuların daha uzun müddət qalmasına səbəb olur və dərsin ümumi keyfiyyətini yüksəldir (Adıgözəlov, 2018).

## Nəticə

İnteraktiv lövhələr, virtual siniflər və onlayn təlim platformaları müəllim və şagird arasında canlı ünsiyyətə, birgə tapşırıqların həllinə, sualların dərhal cavablandırılmasına imkan yaradır. Şagirdlər bir-biri ilə komandada işləyə, layihələr hazırlaya və öz biliklərini qarşılıqlı şəkildə bölüşə bilirlər. Bu isə sosial bacarıqların inkişafına və komandada işləmə vərdişlərinin formalaşmasına kömək edir. Riyaziyyat kimi kompleks və təməl fənlərdə mövzuların təkrar olunması vacibdir. Müasir texnologiyalar şagirdlərə dərsləri istədikləri vaxt və ritmdə təkrar etmək imkanı verir. Elektron dərsliklər, video izahlar, interaktiv tapşırıqlar şagirdlərin dərs materialını daha dərindən mənimsəməsinə şərait yaradır. Bu, evdə əlavə məşğələ üçün çox önəmlidir (Adıgözəlov, 2009).

İnternet və müxtəlif təlim platformaları vasitəsilə müəllimlər və şagirdlər dünyanın istənilən nöqtəsində olan zəngin tədris materiallarına, dərs planlarına və əlavələrə çıxış əldə edir. Bu da tədrisin beynəlxalq standartlara uyğunlaşmasını təmin edir və yerli təhsil imkanlarını genişləndirir.

Riyaziyyat dərslərində texnologiyaların tətbiqi şagirdlərin texnoloji savadlılığını artırır. Bu gün dünyada texnoloji bacarıqlar gələcəyin ən vacib resurslarından biridir. Müasir təlim texnologiyaları ilə işləmək şagirdləri gələcəkdə müasir iş mühitinə hazırlayır və onların rəqabət qabiliyyətini yüksəldir.

Məqalənin aktuallığı. Müasir təlim texnologiyalarının riyaziyyat dərslərində tətbiqi həm pedaqoji, həm texnoloji, həm də sosial baxımdan çox aktual və zəruri bir mövzudur. Bu istiqamətdə aparılan araşdırmalar tədrisin effektivliyinin artırılmasına, innovativ metodların geniş tətbiqinə və riyaziyyat fənninə olan marağın yüksəldilməsinə xidmət edir.

Məqalənin elmi yeniliyi. Bu məqalə mövcud tədris təcrübəsində texnologiyaların istifadəsi ilə bağlı araşdırmaların nəzəri və praktik birləşməsini təmin edir. Riyaziyyat dərslərində təlim texnologiyalarının funksional tətbiqi, bu sahədə pedaqoji yeniliklərin araşdırılması və onların şagird nailiyyətlərinə təsiri kimi məsələlərin sistemli şəkildə təhlil edilməsi məqalənin elmi yeniliyini və aktuallığını artırır.

Məqalənin praktik əhəmiyyəti. Müasir təlim texnologiyalarının riyaziyyat dərslərində tətbiqi təlim prosesində yaranan bəzi çətinlikləri aradan qaldırmağa imkan verir.

## Ədəbiyyat

1. Adıgözəlov, A.S. (2018). *Məktəbdə riyaziyyat təliminin nəzəri əsasları.*
2. Adıgözəlov, A.S. (2009). *Orta məktəb riyaziyyatın tədrisi metodikası.*
3. Ağayev, Ə. (2006). *Təlim prosesi: Ənənəvi və müasirlik.*
4. *Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası*. (2013).

5. *Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu*. (2009).
6. Həmidov, S.S. (1996). *Pedaqoji fakültədə həndəsənin tədrisinə dair*.
7. Həmidov, S.S. (1990). *Pedaqoji fakültədə riyaziyyatın tədrisi metodikası*.
8. Hacıyev, Ş. (2017). *Riyaziyyatın tədrisi metodikası.*
9. Quliyev, Ə.A. (2009). *Riyaziyyatın tədrisində ümumiləşdirmə.*
10. Məmmədova, S.K. (2017). *Riyaziyyatın ibtidai kursu tədrisinin ümumi metodikası üzrə dərs vəsaiti*.
11. Nəzərov, A. (2012). *Müasir təlim texnologiyaları*.
12. Tahirov, B.Ö., Namazov, F.M., Əfəndi, S.N., Qasımov, E.A., Abdullayeva, Q.Z. (2017). *Riyaziyyatın tədrisi üsulları.*

Daxil oldu: 19.03.2025
Qəbul edildi: 21.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/158-162

**Vüsalə Qarayeva**
Gəncə Dövlət Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0004-2198-5360
karayeva.vusala@bk.ru
**Mətanət Həsənova**
Gəncə Dövlət Universiteti
https://orcid.org/0009-0000-8669-4637
gasanovamatanat43@gmail.com
**Nəzrin Quliyeva**
Gəncə Dövlət Universiteti
https://orcid.org/0009-0006-5496-5205
nezrinn.quliyeva@mail.ru
**Leyla Bağırova**
Gəncə Dövlət Universiteti
https://orcid.org/0009-0000-1778-9026
leyla1991@gmail.com

# Riyaziyyatın tədrisi və modernləşməsi

**Xülasə**

Məqalədə ali təhsil müəssisələrində ümumi həmçinin, tətbiqi riyaziyyatın tədris edilməsində innovasiya və modernləşmə məsələləri araşdırılmışdır. Eyni zamanda, dövlət təhsil standartlarına müvafiq şəkildə tədris proqramlarının hazırlanma metodikası da təqdim olunmuşdur. Pedaqoji fəaliyyət daim dəyişikliklərə və inkişaflara bağlıdır, bu əlaqə isə müəllim və tələbənin qarşılıqlı əməkdaşlığı ilə yaranır. Təlim və tərbiyəni həmçinin, təhsilin effektivliyinin yüksək səviyyədə təmin olunmasında kollektiv və onu idarə edən məsul şəxslərin birlikdə fəaliyyəti mühüm əhəmiyyət daşıyır.

Ali təhsil, təhsil sisteminin əsas mərhələlərindən biridir. Ali təhsil ali məktəblərdə peşə-ixtisas proqramları əsasında təşkil olunur və icra edilir. Daim aktual qalan problemlərdən biri isə orta həmçinin, orta ixtisas məktəblərini bitirənlərin daha yüksək ixtisasa malik mütəxəssis kimi özlərini göstərməsində çətinliklər yaşamasıdır.

***Açar sözlər:*** *təhsil, riyaziyyat, innovasiya, İKT, təlim, texnologiya*

**Vusala Garayeva**
Ganja State University
PhD in Pedagogy
https://orcid.org/0009-0004-2198-5360
karayeva.vusala@bk.ru
**Matanat Hasanova**
Ganja State University
https://orcid.org/0009-0000-8669-4637
gasanovamatanat43@gmail.com
**Nazrin Guliyeva**
Ganja State University
https://orcid.org/0009-0006-5496-5205
nezrinn.guliyeva@mail.ru
**Leyla Baghirova**
Ganja State University
https://orcid.org/0009-0000-1778-9026
leyla1991@gmail.com

 Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

# Teaching and Modernizing Mathematics

## Abstract

The article examines the issues of innovation and modernization in the teaching of general and applied mathematics in higher education institutions. At the same time, the methodology for developing curricula in accordance with state educational standards is also presented. Pedagogical activity is constantly connected with changes and developments and this relationship is created through mutual cooperation between the teacher and the student. The joint activity of the collective and the responsible persons managing it is of great importance in ensuring a high level of training and education, as well as the effectiveness of education.

Higher education is one of the main stages of the education system. Higher education is organized and implemented in higher education institutions on the basis of vocational programs. One of the constantly relevant problems is the difficulty of graduates of secondary and secondary specialized schools in presenting themselves as specialists with higher qualifications.

***Keywords:*** *education, mathematics, innovation, ICT, training, technology*

## Giriş

Ölkəmiz müstəqilliyini əldə etməsindən sonra hər bir sahədə olduğu kimi təhsil sahəsində də vacib tapşırıqlar müəyyən olunmuş və tədrisin yenidən təşkili zəruri sayılmışdır. Əsas məsələlərdən biri məhz təlim-tərbiyənin müasir standartlara müvafiq qurulmasıdır. Pedaqoji fəaliyyət daim dəyişikliklərə və inkişaflara bağlıdır, bu əlaqə isə müəllim və tələbənin qarşılıqlı əməkdaşlığı ilə yaranır. Təlim və tərbiyəni həmçinin, təhsilin effektivliyinin yüksək səviyyədə təmin olunmasında kollektiv və onu idarə edən məsul şəxslərin birlikdə fəaliyyəti mühüm əhəmiyyət daşıyır.

Ali təhsil, təhsil sisteminin əsas mərhələlərindən biridir. Ali təhsil ali məktəblərdə peşə-ixtisas proqramları əsasında təşkil olunur və icra edilir. Daim aktual qalan problemlərdən biri isə orta həmçinin, orta ixtisas məktəblərini bitirənlərin daha yüksək ixtisasa malik mütəxəssis kimi özlərini göstərməsində çətinliklər yaşamasıdır.

Ali təhsil səviyyələrində ixtisaslar üzrə kadr hazırlığı böyük əhəmiyyət daşıyır. Bakalavr təhsil mərhələsində tədris prosesi əvvəlcə dar ixtisaslaşma əsasında planlaşdırılırdı və icra edilirdi. Lakin dar ixtisaslı mütəxəssislərin hazırlanmasının yetərsizliyi aşkar edildikdən sonra, daha geniş profilə malik mütəxəssislərin yetişdirilməsi ehtiyacı ortaya çıxdı. Bu ehtiyac nəticəsində bakalavr və magistratura pillələri tətbiq olunmağa başladı. Ali-peşə ixtisası təhsilinin məhz dövlət standartlarına uyğun şəkildə bütün ixtisas istiqamətləri üçün tədris planlarının və proqramlarının hazırlanması mühüm məsələlərdən biri kimi həllini tapdı (Ağayev, 2006).

**Tədqiqat**

Ali təhsil müəssisələrində tədris edilən fənlər arasında ümumi, həmçinin, tətbiqi riyaziyyat kursu xüsusi rola malikdir. Müasir dövrdə elm və texnologiyada riyazi metodların tətbiqi, modelləşdirilməsi və layihələndirilməsi ən vacib məsələlərdən hesab edilir ki, bu da hesablama texnologiyalarının sürətli inkişafı ilə bağlıdır. Bu səbəbdən də konkret problemlərin həllində riyaziyyatın tətbiq dairəsi əhəmiyyətli şəkildə genişlənməkdədir. Məqsəd, hazırkı tələbələrin gələcəkdə sənaye həmçinin, kənd təsərrüfatı, səhiyyə o cümlədən başqa önəmli sahələrin tələblərinə uyğun hazır olmalarını təmin etməkdir.

Ümumi riyaziyyat kursu fundamental fənn kimi tələbələrə öyrədilərkən, onun tədris materiallarının təqdimat üsulları riyaziyyat tədrisinin metodikası vasitəsilə tədqiq edilir. Bu metodikanın öyrənilməsi, ümumi riyaziyyat dərslərinin keyfiyyətinin artırılmasına və tədrisin hərtərəfli həmçinin yüksək səviyyədə nəticələnməsinə kömək edir. Bundan əlavə, riyaziyyatın müxtəlif sahələrdə geniş tətbiqi və bir çox elmin təməlini təşkil etməsi səbəbindən tələbələrin bu fənni möhkəm mənimsəməsi olduqca vacibdir.

Riyaziyyatın tədris metodikasını mənimsəməklə müəllim yalnız öz pedaqoji fəaliyyətinin ümumi prinsiplərinə yiyələnir. Professor-müəllimlərin pedaqogika o cümlədən psixologiya

sahələrində bilik sahibi olmaları isə fənnin tədrisində ən vacib tələblərdən biridir. Riyaziyyat dərslərində əsas məsələlərdən biri məhz didaktikaya düzgün yanaşmanın tətbiqidir. Müasir dövrdə ali məktəblərdə riyaziyyatın tədris metodikasının müxtəlif aspektlərinin işıqlandırılmasına ciddi ehtiyac var. Bu ehtiyacın qarşılanmasında əsas problemlərdən biri məhz konsepsiyanın seçilməsi həmçinin, tədris proqramına uyğun hazırlanmış materialların effektiv tətbiqidir. Riyaziyyatın dərindən mənimsənilməsində mühüm rol oynayan amillərdən biri də indiki vaxtda pedaqogika elminin müəyyən etdiyi yeni təlim texnologiyaları, kurikulum, elektron resurslar və informasiya-kommunikasiya texnologiyalarına (İKT) əsaslanmaqdır (Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası, 2013).

Fənnin öyrədilməsi prosesində təlimin metodoloji əsaslarının müəyyənləşdirilməsində vacib amillərdən biri məhz elmi tədqiqatın uyğun müşahidə həmçinin, eksperimentlə əlaqələndirilməsidir. Təlimin bəzi qanunları var ki, onları sadəcə müşahidə və təcrübələrlə tam müəyyən etmək mümkün olmur. Riyaziyyat dərslərinin tədrisində yalnız mühazirə həmçinin, məşğələlərin gündəlik izlənməsi kifayət etməz müəllimlərin dərsi necə keçməsinə, tələbələrin öyrənmə qabiliyyətlərinə, yaradıcılıq səviyyələrinə və müstəqil işləmə bacarıqlarına da diqqət ayrılmalıdır. Empirik tədqiqatın mühüm üsullarından sayılan müşahidə tələbələrin əldə etdiyi məlumatları məqsədli, planlı və sistemli formada qavrama prosesidir. Digər yandan, müşahidənin keyfiyyəti tələbələrin bilik səviyyəsi, təcrübəsi, elmi marağı və münasibəti ilə birbaşa əlaqəlidir. Müşahidə düzgün aparılmalı və müşahidəçi olan müəllim diqqətini yalnız elmi mövzuya yönəltməlidir. Riyaziyyat dərslərinin tədris edilməsində müşahidə dedikdə, kursda yer alan müxtəlif nəzəriyyələrin planlı həmçinin, məqsədli şəkildə başa düşülməsi nəzərdə tutulur. Müşahidə prosesinə düşüncə və qavrama fəaliyyəti də daxil olur ki, bu da əldə edilən biliklərin daha dərindən anlaşılmasına səbəb olur. Tədris prosesində müşahidə tələbələrin intellektual, emosional və idraki xüsusiyyətləri ilə sıx bağlıdır. Müşahidə riyaziyyat kursundakı bütün nəzəriyyələrdə elmi tədqiqat metodu olaraq istifadə edilir. Bu metod təlim prosesində obyektiv həqiqətin tələbələr tərəfindən birbaşa qavranmasını təmin etməyə yönəlib. Tələbələr tərəfindən yaxşı anlaşılmayan, lakin əhəmiyyətli sahələrin daha dəqiq və tam müəyyənləşdirilməsi müşahidə qabiliyyəti ilə aydınlaşır. Müşahidəçilik, tələbələrin qavradığı elmi biliklərin dərindən təhlil edilməsində ortaya çıxır. Bu bacarıq tələbələrin qavrayışının davamlı inkişafı ilə formalaşır və onların şəxsiyyət kimi yetişməsi və hərtərəfli inkişafı üçün vacib amil kimi önə çıxır. Əgər müşahidənin məqsədi müəyyən mövzuya dair müəllimin əldə etmiş olduğu nəticələri araşdırmaq və təhlil etməkdirsə, bu halda həmin mövzu bütün müəllimlərin tədris fəaliyyətində müşahidə edilməlidir. Toplanan faktlar müəllimin tədris yanaşmaları barədə faydalı və praktik nəticələr çıxarmağa imkan yaradır. Bu faktların analiz edilməsi və ümumiləşdirilməsi nəticəsində əldə olunan biliklər isə tədris prosesində tətbiq olunaraq səmərəliliyi artırır (Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu, 2009).

Son illərdə beynəlxalq təcrübələrə əsasən, tələbələri çoxlu isbatlarla yormaq yaxud onları ruhdan salmaq olmaz, çünki bu, fənnə qarşı marağın itirilməsinə səbəb ola bilər. Qeyd edilməlidir ki, bakalavr, magistr səviyyəsində keçirilən mühazirələr riyaziyyat ixtisası üzrə deyil, əsasən, qeyri-riyaziyyat sahələrindən olan, mühəndislik və texniki istiqamətlərdə təhsil alan tələbələr üçün təşkil olunur.

XXI əsr təhsilinin əsas xüsusiyyətlərindən danışan zaman, daha çox intellektual bacarıqlara və həyati kompetensiyalara malik, işgüzar və rəqabətə davamlı fərdin formalaşdırılması önəmli sayılır Poka eshche ne slishkom pozdno, 2000).

Ali təhsilin keyfiyyətinin yüksəlməsində əsas rol məhz professor-müəllim heyətinin professional hazırlanmasıdır ki, bu da onların tədris etdikləri fənlərin nəzəri həmçinin praktik problemlərini dərindən mənimsəməsi və bu bilikləri tələbələrə effektiv şəkildə ötürmə bacarıqları ilə bağlıdır. Bu kontekstdə ali məktəb müəllimlərinin elmi-pedaqoji fəaliyyətlərinə təsir edən amillərdən biri kimi tədqiqat işlərinə cəlb olunması xüsusi önəm daşıyır. Müəllimlərin apardığı tədqiqatlar çox vaxt tələblərə cavab vermir həmçinin aktual mövzuları əhatələmir. Bu səbəbdən də elmi işlərin mövzusu diqqətlə və ciddi formada ilkin müzakirədən keçməlidir. Ümumiyyətlə, elmi

tədqiqatların aktual problemlərə yönəlməsi müəllimin alim kimi bilinməsinə, aid olduğu kollektiv, tələbələr və cəmiyyət arasında yüksək nüfuz əldə etməsinə imkan verir (Həmidov, 1996).

Təkmilləşdirilən islahatların əsas hədəflərindən biri yüksək səviyyəli müəllim peşəsinin inkişaf etdirilməsi istiqamətində fəaliyyət göstərməkdir. Müəllimlərin hazırlanması proqramında yenilik və dəyişikliklər edilmədən aparılan islahatlarda istənilən uğura nail olmaq çətin olur, bu səbəbdən də ölkəmizdə müəllimlərin hazırlığı yüksək standartlara uyğun şəkildə həyata keçirilir. Təhsil sahəsində davam edən islahatlar inkişafını sürdürür və tədris prosesinin əsas fiquru olan müəllim öz əhəmiyyətini qoruyur, müəllimin rolu artır və peşəkarlıq səviyyəsinə dair tələblər yüksəlir. Müasir tələblərə cavab verən yeni təlim metodları, kurikulumlar və davamlı olaraq elektron resursların tətbiqi ilə müəllim hazırlığı və peşənin inkişafı Azərbaycan Respublikasının Təhsil Nazirliyinin diqqət mərkəzində olan prioritet məsələlərdəndir.

Azərbaycanın ali təhsil müəssisələrində gələcək mühəndis kadrlarının müasir standartlara uyğun hazırlanması üçün Dövlət Təhsil Standartlarının tələbləri əsasında genişmiqyaslı islahatlar həyata keçirilir. Bu prosesdə əsas məsələlərdən biri ali təhsil müəssisələrinə elm və texnologiyanın ən son yeniliklərinin gətirilməsidir. XXI əsr, “Təhsil əsri” yaxud “Kompüter əsri” adlandırılsa da, ölkəmizin ali təhsil müəssisələrində informasiya sahəsində hazırlanan mühəndis kadrların üzləşdiyi problemlər aradan qaldırılır. Hazırda ali təhsil müəssisələrində riyaziyyatın həm nəzəri, həm də praktik tərəflərinin tədrisində informasiya-kommunikasiya texnologiyalarının (İKT) tətbiqi mütləqdir (Hacıyev, 2017).

Bütün aparıcı ölkələrdə qloballaşmanın təsiri ilə insanın indiki və gələcək həyatında təhsil və İKT mühüm rol oynayır. Ali təhsil müəssisələrində riyaziyyat fənninin tədrisinin modernləşdirilməsi isə qarşıda duran əsas çətinliklərdəndir. Gələcək mühəndis kadrların yüksək səviyyədə biliklər, bacarıq və vərdişlər əldə etməsində İKT-nin istifadəsi həm məzmunu, həm də təlim prosesinin xarakterini dəyişdirir. Bu dəyişiklik nəticəsində yeni informasiyalar həmçinin təlim üsulları ənənəvi, passiv metodları əvəz edir. Bu səbəbdən də riyaziyyatın həm nəzəri, həm də praktik tədrisində İKT-nin tətbiq metodikasına xüsusi diqqət yetirilməlidir (Quliyev, 2009).

İKT-nin tətbiq edilməsi sayəsində riyaziyyatın həm nəzəri, həm də praktiki sahələrdə yeniləşdirilməsi prosesində irsilik və fənnlərarası əlaqələrin təmin edilməsi, eləcə də yazılı imtahanlarda yeni növ tapşırıqların müxtəlif formalarda hazırlanması tələbələrin bilik səviyyəsinin qiymətləndirilməsində əhəmiyyətli yer tutur. Bundan başqa, bu sahədə təsir göstərən faktorların biri də elektron mənbələrdən istifadənin genişlənməsidir, lakin bu sistem hələ də müasir proqramlaşdırma dilləri vasitəsilə tam həllini tapmamışdır.

Riyaziyyat dərsinin nəzəri və praktik sahələrdə tədrisində təlim nəticələrinin yaxşılaşdırılmasında qarşıya çıxan problemlər və ziddiyyətlər xüsusilə müəllimlərin ənənəvi üsullardan imtina etməməsi, qiymətləndirmə texnologiyalarından faydalanmaması, müasir standartlara cavab verən maddi-texniki imkanların yetərsizliyi, peşəkar kadrların hazırlanmasının zəifliyi və digər amillərlə bağlıdır (Hacıyev, 2017).

## Nəticə

Azərbaycanın təhsil sisteminin inkişaf etmiş ölkələrin təhsil modellərinə inteqrasiyası, riyaziyyatın tədrisi metodikasının elmi əsaslarla yenilənməsini və müasir tələblərə uyğun şəkildə modernləşdirilməsini zəruri edir. Ali təhsil müəssisələrində tələbəyönümlü və inkişafı təşviq edən pedaqoji texnologiyaların tətbiqinə ciddi ehtiyac duyulur. Müasir informasiya və pedaqoji texnologiyalardan riyaziyyatın tədrisində məqsədyönlü və sistemli istifadə, təhsilin çağdaş prinsiplərinin gerçəkləşdirilməsinə zəmin yaradır. Məsələn, müəyyən inteqralın hesablanması yaxud Furye sıralarına dair məsələlərin həlli çox zaman mürəkkəb və çoxsaylı əməliyyatlar tələb edir, həmin hallarda kompüter proqramlarının imkanlarından yararlanmaq məqsədəuyğundur. Belə texnologiyaların tətbiqi, gələcək mühəndis kadrların nəzəri biliklərini praktik vərdişlərlə möhkəmləndirməyə, hesablama bacarıqlarının avtomatlaşdırılmasına və riyazi düşüncə tərzinin inkişafına əhəmiyyətli dərəcədə töhfə verir.

## Ədəbiyyat

1. *Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası*. (2013).
2. Ağayev, Ə. (2006). *Təlim prosesi: Ənənəvi və müasirlik*.
3. *Azərbaycan Respublikasının Təhsil haqqında Qanunu*. (2009).
4. Adıgözəlov, A.S. (2018). *Məktəbdə riyaziyyat təliminin nəzəri əsasları.*
5. Adıgözəlov, A.S. (2009). *Orta məktəb riyaziyyatın tədrisi metodikası*.
6. Həmidov, S.S. (1990). *Pedaqoji fakültədə riyaziyyatın tədrisi metodikası*.
7. Həmidov, S.S. (1996). *Pedaqoji fakültədə həndəsənin tədrisinə dair*.
8. Hacıyev, Ş. (2017). *Riyaziyyatın tədrisi metodikası*.
9. Quliyev, Ə.A. (2009). *Riyaziyyatın tədrisində ümumiləşdirmə*. Elm.
10. Məmmədova, S. K.( 2017). *Riyaziyyatın ibtidai kursu tədrisinin ümumi metodikası üzrə dərs vəsaiti*.
11. Nəzərov, A. (2012). *Müasir təlim texnologiyaları*.
12. *Poka eshche ne slishkom pozdno*. (2000). Doklad Natsional'nyi Komitsii. Soedinènnykh Shtatov Ameriki po prepodavaniyu matematiki i estestvennykh nauk.

Daxil oldu: 12.03.2025
Qəbul edildi: 22.06.2025

## TEXNİKA ELMLƏRİ
## TECHNICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2789-6919/46/163-166

**Нурлан Эйвазов**
Азербайджанский Технический Университет
магисрант
https://orcid.org/0009-0002-2532-2789
nurlan.elvazov@gmail.com
**Микаил Гусейнзаде**
Азербайджанский Технический Университет
магистрант
https://orcid.org/0009-0006-7637-3892
huzeynzade.mikail2807@gmail.com

# Агротехническая эффективность систем орошения, управляемых искусственным интеллектом

## Резюме

Эффективное и экономичное управление системами орошения в сельском хозяйстве считается одним из главных приоритетов глобальной продовольственной безопасности и устойчивого производства в современную эпоху. Традиционные системы орошения, часто основанные на фиксированных графиках, не учитывают потребности почвы и растений в режиме реального времени, что приводит к расточительству воды и снижению производительности. Применение технологий искусственного интеллекта (ИИ) играет важную роль в преодолении этих проблем. Системы орошения, управляемые искусственным интеллектом, автоматически принимают решения по орошению в режиме реального времени на основе уровня влажности почвы, прогнозов погоды, солнечной радиации, стадии развития растений и других агротехнических показателей. Эти технологии собирают, анализируют данные и применяют оптимальные стратегии орошения с помощью машинного обучения и сенсорных сетей. В результате потребление воды может быть сокращено на 30–50%, а производительность может увеличиться на 20–40%. Кроме того, эти системы способствуют своевременному и правильному выполнению агротехнических мероприятий, предотвращают засоление почв и создают условия для рационального использования водных ресурсов.

***Ключевые слова:*** *агротехнический, датчик, орошение, сельское хозяйство, цифровое*

**Nurlan Eyvazov**
Azərbaycan Dövlət Texniki Universiteti
magistrant
https://orcid.org/0009-0002-2532-2789
nurlan.elvazov@gmail.com
**Mikayıl Hüseynzadə**
Azərbaycan Dövlət Texniki Universiteti
magistrant
https://orcid.org/0009-0006-7637-3892
huzeynzade.mikail2807@gmail.com

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0)

# Süni intellektlə idarə olunan suvarma sistemlərinin aqrotexniki effektivliyi

## Xülasə

Kənd təsərrüfatında suvarma sistemlərinin səmərəli və qənaətli idarə olunması müasir dövrdə qlobal ərzaq təhlükəsizliyinin və dayanıqlı istehsalın əsas prioritetlərindən biri hesab olunur. Ənənəvi suvarma sistemləri, çox vaxt sabit qrafiklərə əsaslandığı üçün torpaq və bitki ehtiyaclarını real vaxtda nəzərə almır, bu isə su israfına və məhsuldarlığın azalmasına səbəb olur. Süni intellekt (Sİ) texnologiyalarının tətbiqi bu problemlərin aradan qaldırılmasında mühüm rol oynayır. Süni intellektlə idarə olunan suvarma sistemləri torpağın rütubət səviyyəsi, hava proqnozları, günəş şüalanması, bitkinin inkişaf mərhələsi və digər aqrotexniki göstəricilər əsasında real vaxt rejimində suvarma qərarlarını avtomatik şəkildə verir. Bu texnologiyalar maşın öyrənməsi və sensor şəbəkələri vasitəsilə məlumatları toplayır, analiz edir və optimal suvarma strategiyalarını tətbiq edir. Nəticədə, su sərfiyyatı 30–50%-dək azala, məhsuldarlıq isə 20–40% arta bilər. Bundan əlavə, bu sistemlər aqrotexniki tədbirlərin vaxtında və düzgün icrasını asanlaşdırır, torpağın şoranlaşmasının qarşısını alır və su resurslarının dayanıqlı istifadəsinə şərait yaradır.

***Açar sözlər:*** *aqrotexniki, sensor, suvarma, aqrar, rəqəmsal*

**Nurlan Eyvazov**
Azerbaijan State Technical University
Master student
https://orcid.org/0009-0002-2532-2789
nurlan.elvazov@gmail.com
**Mikayil Huseynzadeh**
Azerbaijan State Technical University
Master student
https://orcid.org/0009-0006-7637-3892
huzeynzade.mikail2807@gmail.com

# Agrotechnical Efficiency of Irrigation Systems Controlled by Artificial Intelligence

## Abstract

Efficient and economical management of irrigation systems in agriculture is considered one of the main priorities of global food security and sustainable production in the modern era. Traditional irrigation systems, often based on fixed schedules, do not take into account soil and plant needs in real time, which leads to water waste and reduced productivity. The application of artificial intelligence (AI) technologies plays an important role in overcoming these problems. Artificial intelligence-controlled irrigation systems automatically make irrigation decisions in real time based on soil moisture levels, weather forecasts, solar radiation, plant development stage and other agrotechnical indicators. These technologies collect, analyze data and apply optimal irrigation strategies through machine learning and sensor networks. As a result, water consumption can be reduced by 30–50%, and productivity can increase by 20–40%. In addition, these systems facilitate the timely and correct implementation of agrotechnical measures, prevent soil salinization and create conditions for sustainable use of water resources. The application of artificial intelligence also contributes to reducing operating costs for farmers, improving agro-ecological conditions and increasing the technological level of agricultural production in general.

***Keywords****: agrotechnical, sensor, irrigation, agrarian, digital*

## Введение

В современном мире применение новых технологий в сельском хозяйстве имеет особое значение для достижения высокой урожайности и рационального использования водных

ресурсов. Изменение климата, расширение посевных площадей и ограниченность водных ресурсов требуют совершенствования методов орошения в аграрной сфере. С этой точки зрения системы орошения, основанные на технологиях искусственного интеллекта, представляют собой революционное новшество в обеспечении сельского хозяйства водными ресурсами (Балаев, Ибрагимов, 2022).

**Исследование**

Эффективная организация процессов орошения в сельском хозяйстве играет важную роль в повышении урожайности (Li, Ma, Zhang, 2020, с.891). Традиционные системы орошения зачастую реализуются неточно, нерационально расходуя ресурсы и негативно влияя на плодородие почвы. За последние годы применение технологий искусственного интеллекта (ИИ) вызвало революционные изменения в данной области. Системы орошения, управляемые ИИ, автоматически принимают решения, анализируя состояние почвы и погодные условия в режиме реального времени, тем самым обеспечивая максимально эффективное использование водных ресурсов (Балаев, Ибрагимов, 2022, с.63).

Эти системы обладают рядом агротехнических преимуществ. Прежде всего, с помощью сенсоров, постоянно отслеживающих уровень влажности почвы, и алгоритмов, прогнозирующих погодные условия, определяется реальная потребность растения в воде. Это позволяет как экономить воду, так и обеспечивать оптимальное развитие растений. Например, алгоритмы Искусственных Нейронных Сетей (ИНС) и Машинного Обучения (МО) позволяют реализовывать зональную стратегию орошения, определяя потребность в воде в разных зонах поля. Это предотвращает эрозию почвы и потери поверхностной воды (Исмаилов, 2025).

В системах, управляемых ИИ, эффективность использования воды значительно выше, так как решения принимаются на основе реальных данных о влажности почвы и погодных условиях. В традиционных методах решения основаны на опыте и визуальных наблюдениях, что увеличивает риск перерасхода ресурсов (Ahilan, Ramesh, Gopakumar, 2021, с.13). С точки зрения сохранения водного баланса и урожайности растений, системы ИИ значительно превосходят традиционные. Кроме того, такие технологии сохраняют структуру почвенных микроорганизмов и стабильность питательных веществ. В традиционных системах несогласованное орошение может нарушить структуру почвы (Ровшан, 26 мая 2025). Системы на базе ИИ снижают потребность в рабочей силе, так как процессы орошения автоматизированы и осуществляются дистанционно с помощью сенсоров (Elhoseny, Ramírez-González, 2019, с.238). Это также исключает влияние человеческого фактора (Boursianis, Papadopoulou, Papageorgiou, 2022, с. 198). Такие системы более устойчивы к изменениям климата, так как способны принимать адаптивные решения на основе прогнозных моделей. Анализируя представленные данные, можно сделать вывод, что внедрение технологий ИИ не только повышает эффективность орошения, но и ускоряет технологическую трансформацию сельского хозяйства, обеспечивая стратегическое преимущество (Бассин, Эпуле, Кешшур, Шеббуни, 2023). Системы ИИ регулируют не только факт орошения, но и его время, объем и интенсивность. Благодаря этому питательные вещества не вымываются, не нарушается pH-баланс, а микробиологическая жизнь почвы сохраняется. Это формирует более здоровую и плодородную структуру почвы (Gebbers, Adamchuk, 2010, с.828). Кроме того, такие технологии, основываясь на анализе почвенных профилей, обеспечивают распределение воды, оптимально соответствующее корневой системе растений, тем самым повышая как качество, так и количество урожая (Айдын, Кандемир, Кирач, Далкылыч, 2021).

## Заключение

Применение технологий искусственного интеллекта в сельском хозяйстве, особенно в управлении системами орошения, создало значительные агротехнические преимущества. Системы орошения, основанные на ИИ, принимают решения в режиме реального времени, учитывая погодные условия, уровень влажности почвы и вид растений, обеспечивая эффективное использование водных ресурсов. Полученные результаты показывают, что внедрение этих систем позволяет сократить расход воды на 30-50%, минимизировать стресс растений и повысить урожайность на 20-40%. Одновременно системы ИИ автоматизируют

управление, снижают потребность в рабочей силе, положительно влияют на структуру почвы и экологическое равновесие, предотвращают вымывание минеральных веществ и сохраняют плодородие почвы. В результате можно заключить, что системы орошения на базе ИИ демонстрируют высокую эффективность и имеют стратегическое значение для устойчивого развития сельского хозяйства в условиях изменения климата.

## Литература

1. Балаев, Р.А., Ибрагимов, Ф.М. (2022). Концептуальные вопросы расширения применения искусственного интеллекта в агропромышленных секторах. *Журнал Аграрной Экономики и Инноваций*, 3(41), 59–68. https://agroeconomics.az/pdf/articles/jurnal-n3-2022-59-89686.pdf
2. Министерство сельского хозяйства Азербайджанской Республики. (2025, 17 апреля). В БГУ проведён воркшоп по проекту «Применение искусственного интеллекта в точном сельском хозяйстве». Агентство по Кредитованию и Развитию Сельского Хозяйства. https://akia.gov.az/az/opennews/328.html
3. Исмаилов, З. (2025, 14 мая). В Азербайджане два агрегата на основе искусственного интеллекта применяются в сельском хозяйстве. AZƏRTAC. https://azertag.az/xeber/3556507
4. Ровшан, Ж. (2025, 26 мая). Преимущества и риски применения искусственного интеллекта в сельском хозяйстве Азербайджана — мнение эксперта. Yurd Media. https://yurd.media/kend-teserrufati/azerbaycanda-kend-teserrufatinda-suni-intellektin-tetbiqinin-faydalari-ve-riskleri-ekspert-aciqladi
5. Bassine, F.Z., Epule, T.E., Kechchour, A., Chehbouni, A. (2023). Последние приложения машинного обучения, дистанционного зондирования и IoT в прогнозировании урожайности: критический обзор. *arXiv preprint* arXiv:2306.04566. https://arxiv.org/abs/2306.04566
6. Aydin, Ö., Kandemir, C.A., Kiraç, U., Dalkiliç, F. (2021). Автоматизированная система орошения на основе искусственного интеллекта и Интернета вещей. *arXiv preprint* arXiv:2104.04076. https://arxiv.org/abs/2104.04076
7. Chen, M., Sun, Y., Cai, X., Liu, B., & Ren, T. (2020). Проектирование и реализация новой системы точного орошения с использованием интеллектуального алгоритма планирования маршрута. *arXiv preprint*arXiv:2003.00676. https://arxiv.org/abs/2003.00676
8. Ahilan, S., Ramesh, M.V., Gopakumar, R. (2021). Умная система орошения с применением ИИ: обзор. *Environmental Monitoring and Assessment*, 193(8), 1–13. https://doi.org/10.1007/s10661-021-09296-4
9. Boursianis, A.D., Papadopoulou, M.S., Papageorgiou, A. (2022). Применения Интернета вещей (IoT) и искусственного интеллекта (ИИ) в умном орошении: всесторонний обзор. *Computers and Electronics in Agriculture*, 198, 107003. https://doi.org/10.1016/j.compag.2022.107003
10. Elhoseny, M., Ramírez-González, G. (2019). Умная система орошения с использованием беспроводной сенсорной сети и нечеткой логики. *Computers and Electrical Engineering*, 70, 238–247. https://doi.org/10.1016/j.compeleceng.2018.12.019
11. Gebbers, R., Adamchuk, V.I. (2010). Точное сельское хозяйство и продовольственная безопасность с применением искусственного интеллекта. *Science*, 327(5967), 828–831. https://doi.org/10.1126/science.1183899
12. Li, Y., Ma, Y., Zhang, X. (2020). Система управления орошением на основе искусственного интеллекта в тепличном сельском хозяйстве. *Sensors*, 20(3), 691. https://doi.org/10.3390/s20030691

Поступило: 11.03.2025
Принято: 14.06.2025

DOI: https://doi.org/10.36719/2789-6919/46/167-171

**Nihat Ləzimov**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
https://orcid.org/0009-0000-2504-063X
nihatlezimov1996@mail.ru

# Geosiyasi amillərin dəniz neft-qaz tikinti texnologiyalarının inkişafına təsiri

## Xülasə

Geosiyasi amillər dəniz neft-qaz qurğularının tikintisi texnologiyalarının inkişafında mühüm rol oynayır. Ərazi mübahisələri və siyasi münaqişələrin olduğu zonalarda layihələr daha çox mobillikliyə, tez quraşdırmaya və təhlükəsizliyə yönəlir. Bu cür yanaşma platformaları sürətlə başqa zonaya köçürülmə və hər hansı siyasi və ya hərbi gərginlik zamanı risklərin azaldılması məqsədilə tətbiq olunur. Məsələn, Cənub Çin dənizində Çin və digər region ölkələri arasındakı mübahisələr nəticəsində modulyar, sürətlə yığıla bilən və hərəkət edilə bilən platformalar inkişaf etdirilir. Belə texnoloji həllər həm iqtisadi, həm də siyasi məqsədlərə xidmət edir. Sanksiyalar isə bir çox ölkələri, xüsusilə, İranda olduğu kimi xarici avadanlığa və proqram təminatına çıxışın məhdudlaşdırılması səbəbindən daxili texnoloji potensialı inkişaf etdirməyə sövq edir. Bu öz növbəsində yeni mühəndislik məktəblərinin və milli standartların yaranmasına gətirib çıxarır. Rusiyada da 2014-cü ildən sonra analoji tendensiyalar müşahidə olunur.

Digər tərəfdən, siyasi sabitliyin və regional əməkdaşlığın yüksək olduğu yerlərdə məsələn, Şimal dənizində Norveç, Böyük Britaniya və Niderland arasında, texnologiyaların inteqrasiyası və standartlaşdırılması nəticəsində tikinti prosesləri daha təhlükəsiz və effektiv olur. Bu nümunələr göstərir ki, geosiyasi mühit texnoloji inkişafı həm məhdudlaşdırır, həm də təşviq edir. Gələcəkdə isə qlobal qeyri-sabitlik şəraitində dəniz neft-qaz tikintisi sahəsində robotlaşdırılmış, pilotsuz və enerji cəhətdən müstəqil qurğuların tətbiqi genişlənəcək. Bu, insan faktorunu minimuma endirəcək və obyektlərin dayanıqlığını artıracaq. Belə texnologiyalar həmçinin, sürətli reaksiya və çevik adaptasiyanı təmin edir, bu da müasir geosiyasi çağırışlara cavabdır.

***Açar sözlər:*** *geosiyasət, dəniz neft-qaz tikintisi, mobil platformalar, sanksiyalar, autonom texnologiyalar*

**Nihat Lazimov**
Azerbaijan State Oil and Industry University
https://orcid.org/0009-0000-2504-063X
Nihatlezimov1996@mail.ru

# The Impact of Geopolitical Factors on the Development of Offshore Oil and Gas Construction Technologies

## Abstract

Geopolitical factors play a significant role in the development of construction technologies for offshore oil and gas facilities. In areas with territorial disputes and political conflicts, projects focus more on mobility, rapid assembly, and enhanced safety. This approach enables platforms to be quickly relocated to other zones, reducing risks during any political or military tensions. For example, in the South China Sea, modular, quickly assembled, and movable platforms have been developed as a result of disputes between China and other regional countries. Such technological solutions serve both economic and political purposes. Sanctions push many countries, especially Iran, to develop domestic technological capabilities due to limited access to foreign equipment and software. This, in turn, leads to the emergence of new engineering schools and national standards. Similar trends have been observed in Russia since 2014On the other hand, in regions with political

Creative Commons Attribution-NonCommercial 4.0 International License (CC BY-NC 4.0) 

stability and high regional cooperation, such as the North Sea involving Norway, the United Kingdom, and the Netherlands, the integration and standardization of technologies result in safer and more efficient construction processes. These examples show that the geopolitical environment both limits and promotes technological development. In the future, under conditions of global instability, the use of robotic, unmanned, and energy self-sufficient installations in offshore oil and gas construction will expand. This will minimize human factors and increase the resilience of facilities. Such technologies also ensure rapid response and flexible adaptation, addressing modern geopolitical challenges.

***Keywords:*** *geopolitics, offshore oil and gas construction, mobile platforms, sanctions, autonomous technologies*

## Giriş

Müasir dövrdə dəniz neft-qaz tikintisi sahəsində texnologiyaların inkişafı xarici siyasi vəziyyətin nəzərə alınmadan təsəvvür edilə bilməz. Geosiyasət təkcə beynəlxalq rəqabət amili deyil, həm də yeni mühəndislik həllərinin tətbiqi üçün güclü stimullaşdırıcı və ya əksinə, maneə yaradan amildir. Bu, xüsusilə dənizdə karbohidrogenlərin hasilatı sahəsində daha aydın şəkildə özünü göstərir. Çünki burada dövlətlərin, transmilli korporasiyaların, beynəlxalq alyansların və ekoloji təşkilatların maraqları kəsişir.

Dəniz neft-qaz platformalarının yerləşdirilməsi çox vaxt mübahisəli ərazilərdə və ya siyasi baxımdan qeyri-sabit bölgələrdə həyata keçirilir. Belə şəraitdə obyektlərin layihələndirilməsi, tikintisi və istismarı üzrə texnologiyalar xarici amillərin təzyiqi altında dəyişikliklərə məruz qalır. Sanksiyalar, məhdudiyyətlər, siyasi rejimlərin dəyişməsi və logistik marşrutların transformasiyası fonunda dövlətlər və şirkətlər uyğunlaşmalı, öz həll yollarını inkişaf etdirməli və yeni bazarlarla texnologiyalara yönəlməlidirlər.

Bu məqalə geosiyasi proseslərin dəniz neft-qaz tikintisinin texnoloji inkişafına təsirini nəzəri baxımdan təhlil etməyə yönəlib. Biz əsas nümunələri nəzərdən keçirəcək, xarici siyasətin daxili mühəndis qərarlarına necə təsir etdiyini göstərəcək və bu sahədə geosiyasi gərginliyin elmi-texniki tərəqqiyə mümkün nəticələrini müzakirə edəcəyik.

**Tədqiqat**

1. *Texnoloji transformasiya amili kimi geosiyasət.* Dəniz neft-qaz sənayesi ölkələrin enerji təhlükəsizliyi maraqlarını əhatə edən strateji əhəmiyyətli sahədir. Dövlətlərarası münasibətlər gərginləşdikdə, texnologiyalar siyasi alətə çevrilir. Belə şəraitdə ölkələr ya öz texnoloji həllərini inkişaf etdirməyə, ya da yeni tərəfdaşlar axtarmağa məcbur qalırlar. 2014-cü ildə Krım və Donbasda baş verən hadisələrə görə Rusiyaya qarşı sanksiyalar tətbiq edildikdən sonra, qərb şirkətləri Shell, ExxonMobil, Total Arktika şelfində aparılan kəşfiyyat və hasilat layihələrində iştiraklarını dayandırdılar. Bu hal, xarici qazma texnologiyalarından və proqram təminatından geniş şəkildə istifadə edən Rusiya neft-qaz sənayesi üçün ciddi çağırış oldu (Əliyev, 2019). Nəticə etibarilə, yerli alternativlərin milli platformaların və naviqasiya sistemlərinin hazırlanmasına başlanıldı ki, bu da öz növbəsində yeni mühəndislik məktəblərinin və elmi istiqamətlərin formalaşmasına təkan verdi.

2. *Territorial mübahisələr və siyasi qeyri-sabitlik şəraitində texnologiyaların uyğunlaşdırılması.* Territorial mübahisələr və siyasi qeyri-sabitlik şəraitində dəniz neft-qaz qurğularının tikintisi üzrə texnologiyalar xüsusi tələblərə uyğunlaşdırılır. Belə zonalarda platformaların mobilliyi, tez yerləşdirilməsi və mühafizəsi aktual olur. Dəniz sərhədləri ilə bağlı münaqişələr stasionar platformaların yerləşdirilməsini riskli edir, buna görə də layihəçilər vəziyyətin qəfil pisləşməsi halında mümkün itkiləri minimuma endirməyə çalışırlar (Əliyev, 2018). Qurğular modullu olur ki, onları operativ şəkildə söküb başqa yerə köçürmək mümkün olsun. Diqqət yalnız hava şəraitinə davamlılığa deyil, həm də dövlətlərdən və qeyri-dövlət aktorlarından gələn mümkün hücumlara qarşı dayanıqlığa yönəlir.

Bu cür uyğunlaşdırmanın ən bariz nümunəsi – Çin, Vyetnam, Filippin və Malayziyanın eyni dəniz sahələrinə iddia etdiyi Cənubi Çin dənizindəki vəziyyətdir. Siyasi gərginliyə cavab olaraq Çin

"Haiyang Shiyou 981" kimi üzən qazma qurğularını inkişaf etdirir ki, bu da yerləşmə yerini tez dəyişmək qabiliyyətinə malikdir (Rzayev, 2017). Bu qurğular yalnız kommersiya funksiyasını deyil, həm də siyasi təzyiq vasitəsi kimi "bayraq göstərmə" funksiyasını yerinə yetirir (Əliyeva 2018). Bundan əlavə, Çin mühəndis və hərbi obyektləri yerləşdirdiyi süni adalar tikir. Bu nümunələr göstərir ki, geosiyasi vəziyyət texniki tələbləri hələ layihə mərhələsində müəyyənləşdirir.

Oxşar vəziyyət Şərqi Aralıq dənizində də müşahidə olunur. Burada Türkiyə, Kipr, İsrail və Yunanıstanın maraqları toqquşur. Bu bölgədə stasionar təməl tələb etməyən qazma gəmiləri və mobil qurğular ön plana çıxır. Onlar tezliklə istismara verilə və eyni sürətlə münaqişə zonasından çıxarıla bilər. Hər iki halda aydın olur ki, geosiyasi qeyri-sabitlik şəraitində texnoloji həllərin çevikliyi prioritetə çevrilir.

3. *Sanksiyaların avtonom texnologiyaların inkişafında rolu*. Beynəlxalq sanksiyalar siyasəti yüksək texnologiyalı və kapital tutumlu sahələrdə, o cümlədən dəniz neft-qaz sənayesində ölkələrin texnoloji inkişafına ciddi təsir göstərir. Avadanlıqların, proqram təminatının və ixtisaslaşmış xidmətlərin tədarükünə qoyulan məhdudiyyətlər qabaqcıl Qərb texnologiyalarına çıxışı bloklayır (Cəfərov, 2020). Buna cavab olaraq dövlətlər texnoloji suverenlik strategiyasını inkişaf etdirir, yerli istehsala və idxalı əvəzləyən həllərə üstünlük verirlər. Bu proses yeni elmi məktəblərin, mühəndis yanaşmalarının və milli standartların formalaşmasına gətirib çıxarır.

Belə transformasiyanın parlaq nümunəsi İrandır. Uzunmüddətli beynəlxalq sanksiyalarla üzləşmiş bu ölkə sualtı neft və qaz hasilatı sahəsində öz texnologiyalarını yaratmağa məcbur oldu. Bir neçə il ərzində İran nasos avadanlıqları, platforma konstruksiyaları və fars körfəzində sualtı boru kəmərlərinin çəkilməsi texnologiyaları sahəsində səriştələr formalaşdırdı (Hüseynli, 2021). Məhdud resurslara və qlobal bazarlara çıxışın olmamasına baxmayaraq, İran neft-qaz sektoru əhəmiyyətli uğurlar əldə etdi və sübut etdi ki, sanksiyalar gözlənilənlərin əksinə, daxili inkişaf üçün stimula çevrilə bilər.

Bənzər proses Rusiyada da müşahidə olunur. 2014-cü ildən sonra ABŞ və Aİ tərəfindən tətbiq olunan sanksiyalar Arktika şelfinin işlənməsi də daxil olmaqla, əsas dəniz layihələrinə təsir göstərdi. Bu, yerli şirkətləri öz idarəetmə sistemlərini inkişaf etdirməyə, qazma avadanlıqlarının istehsalını lokallaşdırmağa və Asiya tərəfdaşlarına yönəlməyə məcbur etdi (Rzayev, 2017). Beləliklə, sanksiyalar təkcə xarici resurslara çıxışı məhdudlaşdırmır, həm də müstəqillik və uyğunlaşma əsaslı yeni texnoloji trayektoriyalar formalaşdırır.

4. *Siyasi inteqrasiya və transmilli əməkdaşlıq*. Münaqişə zonalarından fərqli olaraq, yüksək beynəlxalq əməkdaşlıq səviyyəsi göstərən siyasi baxımdan sabit regionlar birgə texnoloji tərəqqi üçün əlverişli mühit yaradır. Geosiyasi inteqrasiya ölkələrə resursları, standartları və texnologiyaları birləşdirməyə imkan verir, xərcləri azaldır və iri infrastruktur layihələrinin icrasını səmərəli edir. Belə əməkdaşlıq vahid texniki və ekoloji normalar yaradır, logistikanı sadələşdirir və elmi-texniki mübadiləni sürətləndirir (Hüseynov 2020).

Bu əməkdaşlığın ən uğurlu nümunələrindən biri — Norveç, Böyük Britaniya və Niderlandın Şimal dənizində resursları birgə işlədiyi "North Sea Oil and Gas" layihəsidir. Vahid normativ bazanın yaradılması, DNV GL və ISO standartlarının tanınması və qazma əməliyyatlarının birgə planlaşdırılması texniki həllərin standartlaşdırılmasına və platformaların istismarı zamanı təhlükəsizliyin ciddi şəkildə artırılmasına səbəb oldu (İsmayılova, 2023). "Ekofisk" layihəsi göstərdi ki, müttəfiq münasibətlər innovasiyaların daha tez və effektiv tətbiqinə şərait yaradır.

Oxşar model Avstraliya ilə Yaponiya arasında enerji əməkdaşlığında da müşahidə olunur. Burada maye təbii qazın mayeləşdirilməsi və daşınması texnologiyaları tam hüquqi və texniki uyğunluq şəraitində hazırlanır və tətbiq olunur (Məmmədov, 2019). Siyasi inteqrasiya sayəsində tərəfdaşlar yeni bazarlara çıxış əldə edir, riskləri paylaşır və təcrid və ya sanksiya təzyiqləri şəraitində mümkün olmayan həlləri həyata keçirirlər. Bu isə onu göstərir ki, müsbət xarici siyasi mühit texnoloji sürətlənməyə və daha təhlükəsiz və effektiv dəniz infrastrukturlarının yaradılmasına şərait yaradır.

5. *Qlobal qeyri-sabitlik şəraitində texnologiyaların gələcəyi*. Artan qlobal qeyri-sabitlik hərbi münaqişələr, enerji böhranları və iqlim təhdidləri fonunda gələcəyin dəniz tikinti texnologiyalarına əsas tələblər avtonomluq, çeviklik və davamlılıq olur (Məmmədov, 2019). Ənənəvi platforma tikinti üsulları uzunmüddətli heyət iştirakı və xarici enerji mənbələrindən asılılıq getdikcə intellektual və azsaylı sistemlərə yol verir. Bu dəyişikliklər yalnız mühəndis məntiqi ilə deyil, həm də insan faktoru və geosiyasi risklərin azaldılması məqsədi ilə diktə olunur.

Əsas şirkətlər artıq insan iştirakı olmadan qaynaq və diaqnostika işlərini yerinə yetirə bilən robotlaşdırılmış montaj sistemləri hazırlayırlar. Bu, Arktika və ya münaqişə zonaları kimi təhlükəli və baha başa gələn yerlərdə aktualdır (Qasımova, 2022). Distant idarə olunan pilotsuz qazma qurğuları təhlükəsizlik və səmərəlilik üzrə yeni standartlara çevrilir. Onlar xərcləri azaltmağa, fövqəladə hallarda heyətin təxliyəsi risklərini aradan qaldırmağa və əməliyyatların dəqiqliyini artırmağa imkan verir.

Bundan əlavə, çətin keçilən ərazilərdə minimal logistika ilə tez qurulan "gizli yerləşdirmə" texnologiyalarının inkişafı diqqət çəkir. Belə qurğular konteyner formasında daşınır, yerində yığılır və müvəqqəti baza kimi istifadə olunur. Paralel olaraq, enerji cəhətdən müstəqil platformaların yaradılması üzrə işlər aparılır günəş, külək və ya hidrogen enerjisindən istifadə etməklə, xarici yanacaq mənbələrindən asılılığı aradan qaldırmaq üçün. Bu, xüsusilə, sanksiyalar və ya hərbi fəaliyyətlər səbəbindən yanacaq tədarükünün dayandırılması riski olduqda aktualdır.

Norveçin "Ocean Infinity" layihəsi sahənin gələcəyini nümayiş etdirir: sualtı robotlar, avtonom modullar, daimi heyətdən imtina, rəqəmsal əkizlər və süni intellektin geniş tətbiqi. Beləliklə, geosiyasi qeyri-sabitlik innovasiyalara tələbatı formalaşdırır və dəniz neft-qaz tikintisinin fəlsəfəsini dəyişir.

## Nəticə

Geosiyasi amillər dəniz neft-qaz tikintisi texnologiyalarının inkişafına dərin və çoxsəviyyəli təsir göstərir. Xarici siyasət kontekstindən asılı olaraq texnoloji həllər ya məhdudlaşdırılır, ya sürətlənir, ya da uyğunlaşdırılır və ya modifikasiya olunur. Sanksiyalar, münaqişələr, ərazi mübahisələri, alyanslar və ticarət sazişləri bunların hamısı müasir şelf tikintisinin texnoloji xəritəsini formalaşdırır.

Analiz göstərir ki, texnoloji müstəqillik və çeviklik gələcək platformalarda əsas tələblərə çevrilir. Geosiyasət təkcə siyasi ssenariləri müəyyən etmir, həm də mühəndis düşüncəsinin hərəkətverici qüvvəsinə çevrilir. Uzunmüddətli perspektivdə sahənin davamlı inkişafı ölkələrin və şirkətlərin davamlı dəyişən şərtlərə uyğunlaşmaq və öz rəqabətqabiliyyətli texnoloji həllərini yaratmaq qabiliyyətindən asılı olacaq.

## Ədəbiyyat

1. Əliyev, R.M. (2019). Dəniz neft-qaz tikintisi sahəsində yeni texnologiyaların tətbiqi. *Azərbaycan Neft və Qaz Jurnalı*, *12*(3), s. 45-53.
2. Əliyev, Z.N. (2018). Dəniz neft-qaz qurğularında enerji effektivliyi və səmərəlilik texnologiyaları. *Enerji və İnnovasiya Jurnalı*, *5*(2), s. 39-47.
3. Əliyeva, F.R. (2018). Dəniz neft-qaz sahələrində modul texnologiyaların rolu. *Neft və Enerji, 7*(3), s. 29-37.
4. Cəfərov, M.K. (2020). Dəniz neft-qaz tikintisində robotlaşdırılmış sistemlərin tətbiqi. *Texnologiya və İnnovasiya*, *6*(2), s. 41-50.
5. Hüseynli, V.T. (2021). Regional əməkdaşlığın neft-qaz sektorunda texnoloji inkişafda rolu. *Beynəlxalq Energetika Araşdırmaları*, *9*(3), s.76-84.
6. Hüseynov, T.A. (2020). Azərbaycan neft-qaz sektorunda texnoloji yeniliklərin geosiyasi aspektləri. *Bakı Texnologiya Jurnalı*, *5*(2), s. 67-75.
7. İsmayılova, L.F. (2023). Dənizdə platformaların təhlükəsizliyinin artırılması üçün innovativ metodlar. *Azərbaycan Mühəndislik Jurnalı*, *14*(1), s. 55-63.

8. Məmmədova, S.Q. (2021). Geosiyasi risklərin dəniz neft-qaz layihələrinə təsiri. *Energetika və Resurslar*, *8*(1), s.112-120.
9. Məmmədov, S.R. (2019). Dəniz neft-qaz sahəsində enerji müstəqilliyi və ekoloji texnologiyalar. *Ekologiya və Texnologiya*, *11*(4), s. 88-96.
10. Qasımova, R.S. (2022). Geosiyasi amillərin neft-qaz sənayesində texnoloji transformasiyaya təsiri. *Azərbaycan Texnologiya Elmləri Jurnalı, 15*(3), s. 120-128.
11. Quliyev, N. İ. (2022). Sanksiyaların dəniz neft-qaz sahəsində texnoloji inkişafına təsiri. *Azərbaycan Beynəlxalq İqtisadiyyat Jurnalı*, *10*(4), s. 98-106.
12. Rzayev, E. V. (2017). Geosiyasi sabitliyin enerji sektoruna təsiri və perspektivləri. *Strateji Tədqiqatlar Jurnalı*, *3*(1), s.15-23.

Daxil oldu: 09.03.2025
Qəbul edildi: 17.06.2025

## İÇİNDƏKİLƏR
## CONTENTS

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
## HUMANITIES AND SOCIAL SCIENCES


**Ogtay Jalilbayly, Gulchohra Aliyeva**
Enhancing EFL Vocabulary Acquisition Through CALL Tools: a ComparativeStudy of Digital and Traditional Instruction ........ 8
**Elizə İsmayılova**
Probasiya xidməti əhalinin sosial rifahının yaxşılaşdırılmasında sosial xidmət nümunəsi kimi ........ 14
**Cavadxan Qasımov, Əşrəf Ələkbərov**
Naxçıvan Muxtar Respublikasında azad iqtisadi zonalar: yeni iqtisadi sıçrayışın başlanğıcı ........ 21
**Камаля Софиева**
О мусульманской общине Сингапура ........ 26
**Bulqeyis Novruzova**
Azərbaycanda yaşıl iqtisadiyyata keçidin inkişaf xüsusiyyətləri ........ 32
**Вюсаля Газиева**
Психологические аспекты творчества М.Ю.Лермонтова ........ 39
**İradə Bağırova**
Kadr potensialı iqtisadi inkişafın əsasıdır ........ 45
**Жахонгир Нематов**
Современные исследования Мухаммад Джазари ........ 51
**Nigar Bababəyli**
Naxçıvan Muxtar Respublikasında balneoloji əhəmiyyətli suların səciyyəsi ........ 56
**Kəmalə Ağayeva**
Diqqət əskikliyi və hiperaktivlik pozuntusu olan uşaqlarda diqqətin tənziminin pozulması ........ 62
**Mehman Şabanov**
Ermənilərin Azərbaycana qarşı ərazi iddiaları və Heydər Əliyevin Azərbaycanın ərazi bütövlüyünün qorunması istiqamətində fəaliyyəti ........ 67
**Sədaqət Əhmədova , Məhsəti Əsgərova**
Gənclik və iqtisadiyyat: yeni nəsil sahibkarlarının rolu ........ 71
**Бекжон Курбонов**
Деятельность Управления мусульман Узбекистана: исторические этапы развития подготовки кадров в религиозной сфере ........ 77
**Zahid Qənbərov**
Naxçıvanın investisiya iqlimi: regional inkişafda yeni çağırışlar ........ 82
**Искандар Самадов**
Ликвидация Хивинского ханства и образование Хорезмской Народной Советской Республики (ХНСР): анализ политико-правовых процессов ........ 88
**Vüsal Hüseynov**
Elmi araşdırma məqalələrində riayət olunmalı əsas prinsiplər ........ 95
**Закия Гусейнова**
Право на свободу: конституционные и правовые аспекты ……..………………………………103
**Инджи Раджабалиева**
Проблемная ситуация и образовательная проблема: методы и условия их реализации ....... 109
**Elvin Masizade**
Ertelenmiş verginin tanımı, yaratdığı sorunlar, onun çözümleri ve sağladığı imkanlar ........ 114

**Orkhan Balakishiyev**
Application of Digital Technologies in Azerbaijani Business .................... 118
**Fidan Bağırova**
Ukrayna-Rusiya münaqişəsi kontekstində ABŞ-ın təsiri: geosiyasi strategiyalar və ətraf mühitə təsirlər .................... 122
**Namiq Vəlixanov**
Turizm sektorunda İR idarə edilməsi strategiyasının yeni şəraitə uyğunlaşması .................... 128

## TƏBİƏT ELMLƏRİ
## NATURAL SCIENCES

**Bəsti Cəfərova**
Məişət və istehsal sularının keyfiyyətini analiz etmək üçün istifadə olunan proqramların müqayisəli analizi .................... 131
**Rəsmiyyə Kərimova, Nərminə İsayeva**
Gülxətmi bitkisinin bioloji xüsusiyyəti və dərman əhəmiyyəti .................... 136
**Konul Mammadova**
The Role of Agroforestry in Enhancing Climate Resilience of Rural Landscapes in Azerbaijan .................... 142
**Cavad Əliyev**
Neft-mədən avadanlıqlarında AQPÇ-nin qarşısının alınmasında kimyəvi üsulların tətbiqi və onların effektivliyinin qiymətləndirilməsi .................... 146

## RİYAZİYYAT VƏ MEXANİKA
## MATHEMATICS AND MECHANICAL SCIENCE

**Lalə Qocayeva**
Müasir təlim texnologiyalarının riyaziyyat dərslərində tətbiqi .................... 153
**Vüsalə Qarayeva, Mətanət Həsənova, Nəzrin Quliyeva, Leyla Bağırova**
Riyaziyyatın tədrisi və modernləşməsi .................... 158

## TEXNİKA ELMLƏRİ
## TECHNICAL SCIENCES

**Нурлан Эйвазов , Микаил Гусейнзаде**
Агротехническая эффективность систем орошения, управляемых искусственным интеллектом .................... 163
**Nihat Ləzimov**
Geosiyasi amillərin dəniz neft-qaz tikinti texnologiyalarının inkişafına təsiri .................... 167

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti, 529,
"Azərbaycan" Nəşriyyatı, 6-cı mərtəbə
Tel.: +994 99 807 67 68
+994 99 808 67 68
e-mail: tedqiqat.1707@aem.az

**Editorial address**
AZ1073, Baku,
Matbuat Avenue, 529,
"Azerbaijan" Publishing House, 6th floor
Phone: +994 99 807 67 68
+994 99 808 67 68
e-mail: tedqiqat.1707@aem.az

İmzalandı: 26.06.2025
Onlayn çap: 30.06.2025
Kağız çapı: 10.06.2025
Kağız formatı: 60x84, 1/8
H/n həcmi: 21,8 ç.v.
Sifariş: 64

**"ZƏNGƏZURDA"**
Çap Evində çap olunub.
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529,
"Azərbaycan" nəşriyyatı, 6-cı mərtəbə
Tel.: +994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru

Signed: 26.06.2025
Online publication: 30.06.2025
Paper printing: 10.06.2025
Format: 60/84, 1/8
Stock issuance: 21,8 p.s.
Order: 64

It has been published in the printing house
**"ZANGAZURDA"**
Address: Baku city, Matbuat Avenue, 529,
"Azerbaijan" Publishing House, 6th floor
Phone: +994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru